**AZƏRBAYCAN MİLLİ ELMLƏR AKADEMİYASI**
**MƏHƏMMƏD FÜZULİ adına ƏLYAZMALAR İNSTİTUTU**

**VÜSALƏ MUSALI**

# AZƏRBAYCAN TƏZKİRƏÇİLİK TARİXİ

**"Elm vəTəhsil"**
**BAKI – 2012**

Azərbaycan Milli Elmlər Akademiyası Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutu elmi şurasının 23-24 noyabr 2011-ci il 10 saylı iclasının qərarı ilə nəşr edilir.

Elmi redaktor: **Azadə MUSAYEVA**
filologiya elmləri doktoru, professor

Rəyçi: **Nəsib GÖYÜŞOV**
filologiya elmləri doktoru

Korrektor: **Nübar ŞÜKÜROVA**

**Musalı (Səmədova) Vüsalə Azər qızı. Azərbaycan təzkirəçilik tarixi. – Bakı, “Elm və təhsil”, 2012, ___ s.**

Monoqrafiyada Azərbaycan ədəbiyyatının ilkin və əvəzsiz qaynaqlarından hesab olunan təzkirələr tədqiqat obyektinə çevrilmişdir. Burada Azərbaycan təzkirələrinin təsnifatı aparılmış, təzkirələrin dili, strukturu, əhatə etdiyi coğrafiya və zaman, tarixi əsərlərin təzkirə hissəsi, təzkirə xarakterli əsərlər, Azərbaycan təzkirələrinin nəşri vəziyyəti və tədqiq tarixi öyrənilmişdir.

Kitabda ilk dəfə olaraq Azərbaycan təzkirəçiliyinin XVI-XXI əsrlər mərhələsi araşdırılmış və azərbaycanlı təzkirəçilərin qırxa yaxın əsəri müəyyən olunaraq təhlil edilmişdir.

# MÜNDƏRİCAT

*Elmi araşdırmalarımın hər bir mərhələsində mənəvi dəstəyini hiss etdiyim, dürüstlüyü, ləyaqəti və şəxsiyyətinə qibtə etdiyim, çox dəyərli qayınanam*
***Sevil Mirbədəl qızı Musayevaya***
*sonsuz sevgi və minnətdarlıqla...*

# ÖN SÖZ

Şair təzkirələri ədəbiyyat tarixinin çox dəyərli və əvəzsiz qaynaqlarındandır. Akademik B.Nəbiyev uzaq keçmişimizə dair poetik irsin toplanıb tədqiq edilməsində, ədəbi fakt və hadisələrin tarixlərinin dürüstləşdirilməsində, filoloji tədqiqatların aparılmasında, nəhayət, ədəbiyyat tarixlərinin və ayrı-ayrı poetik simalara həsr olunmuş monoqrafiyaların yazılmasında ilk məxəz kimi təzkirələrin çox böyük əhəmiyyəti olduğunu önəmlə vurğulayır[1].

Sözün həqiqi mənasında, əgər təzkirələr qələmə alınmasaydı, bu gün bir çox şairin adı ədəbiyyat tarixindən silinəcəkdi. Məsələn, Sam mirzənin "Töhfeyi-Sami" və Sadiq bəy Əfşarın "Məcməül-xəvas" təzkirələri Səfəvi dövrü Azərbaycan ədəbiyyatı tarixinin önəmli mənbələrindəndir. Əhdi Bağdadinin "Gülşəni-şüəra"sı isə Bağdadda yaşayıb-yaratmış azərbaycanlıların, eləcə də Osmanlı ölkəsinə mühacirət etmiş şairlərimizin həyat və yaradıcılığını öyrənmək baxımından böyük əhəmiyyət kəsb edir. Yalnız azərbaycanlı təzkirəçilərin deyil, həm də Orta Asiya və Osmanlı müəlliflərinin qələmə aldığı təzkirələr Azərbaycan ədəbiyyatı tarixinin mühüm mənbələrindən hesab oluna bilər. Osmanlı təzkirələri üzərində apardığımız araşdırmalar bunu bir daha təsdiq edir. Belə ki, tədqiqatlar nəticəsində məlum olmuşdur ki, XVI-XX əsrlərdə qələmə alınmış Osmanlı təzkirələrində təxminən 60 nəfərə yaxın Azərbay-

[1] Nəbiyev B. Şahinin qanadları: ("Təzkireyi-Şahin" haqqında rəy) / «Elm» qəzeti. - 2002. - 19 oktyabr.

can şairinin həyatı, yaradıcılığı və əsərlərindən nümunələr öz əksini tapmışdır. Bu şairlərin yarıya qədəri məhz Osmanlı təzkirələrində xatırlanmış, fəqət Azərbaycanda tədqiq olunmamışdır[2].

Azərbaycan təzkirələri dedikdə, müəlliflərin milli mənsubiyyətini əsas götürürük. Belə ki, yazıldığı dildən və məkandan asılı olmayaraq, azərbaycanlı müəlliflərin qələmə aldıqları təzkirələri ***Azərbaycan təzkirələri*** hesab edirik. Məsələyə orta əsrlər dövrünün prizmasından yanaşdıqda, burada "Azərbaycan təzkirələri" və "azərbaycanlı təzkirəçilər" ifadələri də müəyyən qədər şərti xarakter daşıyır. Çünki həmin dövrə nəzər saldıqda, coğrafi vəziyyət baxımından Rum və Orta Asiya, dil xüsusiyyətləri baxımından Osmanlı və Cığatay ədəbiyyatları arasında qalmış böyük bir türk-oğuz topluluğunun olduğunu görürük. Bu topluluq Qaraqoyunlu, Ağqoyunlu, Səfəvi, Əfşar və Qacar səltənətlərini qurmuş və idarə etmiş, Azərbaycan türkcəsində danışmış türk soylu ellərin məcmusundan ibarətdir. Əsas etibarilə Azərbaycanda yaşamalarına rəğmən, dövrün hərbi-siyasi prosesləri fonunda ölkəmizin tarixi-coğrafi hüdudlarını aşaraq, Şərqi Anadoluya, İraqa, İrana yayılan bu topluluq vahid bir etnosu (ulusu) təşkil etmiş, özlərini Osmanlı və Orta Asiya türklərindən fərqləndirmişlər[3]. Bu ulus vahid siyasi quruluşa, mədəniyyətə, ədəbiyyata malik olmuşdur. Bu gün biz onların yaratdıqları tarixi, mədəniyyəti və ədəbiyyatı "Azərbaycan tarixi", "Azərbaycan mədəniyyəti" və "Azərbaycan ədəbiyyatı" adı altında ümumiləşdiririk. Gerçəklikdə isə bu məfhumların Azərbaycan coğrafiyasının çox-çox ötəsinə varan anlayışlar olduqlarını görürük. İzzəddin Həsənoğlu Xorasanda, Qazı Bürhanəddin Orta Anadoluda, Məhəmməd Füzuli İraqda yaşayıb-yaratmalarından asılı olmayaraq, onların Azərbaycan ədəbiyyatı nümayəndələri olduqları şübhə doğurmur. Çünki burada Azərbaycan məfhumu coğ-

---

[2] Bax: Musalı V. Osmanlı təzkirələrində Azərbaycan şairləri. Bakı, Nurlan, 2009, 368 s.

[3] Bax: Буниятов З.М., Эфендиев О.А. От редакторов // Фазлуллах ибн Рузбихан Хунджи. Тарих-и алам-ара-йи Амини. Баку, 1987, с.5; Kərimov P.Ə. XVII əsr anadilli Azərbaycan lirikası. Bakı, 2011, s.22-23.

rafi deyil, etno-mədəni bir mühiti ifadə etməkdədir. Məhz bu səbəbdəndir ki, bu geniş coğrafiyanın harasında yaşayıb-yaratmalarından asılı olmayaraq, özləri və ya əcdadları Azərbaycanın müxtəlif şəhər və bölgələrində doğulmuş, bu şəhər və bölgələrin adlarını özlərinə nisbə seçmiş müəlliflərlə yanaşı, Azərbaycan xalqının tarixində və etnogenezində fəal iştirak etmiş şamlu, qacar kimi türk-oğuz boylarının nümayəndələri də "azərbaycanlı təzkirəçilər" sırasına daxil edilmişlər.

Azərbaycanlı təzkirəçilər tərəfindən qırxdan artıq təzkirənin qələmə alınmasına baxmayaraq, bunların çox az qismi tədqiqata cəlb olunmuş və nəşr edilmişdir. İndiyə kimi bəzi Azərbaycan təzkirələri – Sadiq bəy Əfşarın "Məcməül-xəvas"ı, Marağalı Məhəmmədhəsən xan Etimadüssəltənənin "Xeyrati-hesan", Seyid Əzim Şirvaninin "Təzkirə"si, Məhəmməd ağa Müctəhidzadənin "Riyazül-aşiqin"i, Məhəmmədəli Tərbiyətin "Danişməndani-Azərbaycan"ı, Mir Möhsün Nəvvabın "Təzkireyi-Nəvvab"ı, Şahin Fazilin "Təzkireyi-Şahin"i respublikamızda işıq üzü görmüşdür.

Bu qeyd olunanlardan əlavə, AMEA Əlyazmalar İnstitutunun əməkdaşları tərəfindən Sam mirzənin "Töhfeyi-Sami"si, Əziz Dövlətabadinin "Süxənvərani-Azərbaycan"ı və Qulam Məmmədlinin "Təzkirə"si nəşrə hazırlanmaqdadır. Əhdi Bağdadinin "Gülşəni-şüəra"sının Sankt-Peterburq nüsxəsi Ədəbiyyat İnstitutunun əməkdaşı V.Feyzullayeva tərəfindən nəşrə hazırlanmış, ancaq çap olunmamışdır.

Azərbaycan təzkirəşünaslığının qarşısında mühüm məsələlər durmaqdadır və bir çox təzkirələr öz tədqiqatçılarını gözləməkdədir. Belə ki, Azərbaycan təzkirəçilik tarixi sistemli şəkildə öyrənilməli, Azərbaycan təzkirələri nəzəri baxımdan tədqiqata cəlb olunmalı, XVI əsrdən XXI əsrə qədər qələmə alınmış Azərbaycan təzkirələri Azərbaycan dilinə tərcümə və ya transfoneliterasiya olunduqdan sonra təzkirələr dövrün ədəbi fonunda təhlil edilməli, təzkirələr əsasında ədəbi tənqidin, şairlərarası münasibətin, tərcümə sənətinin, Azərbaycan ədiblərinin digər xalqların nümayəndələri ilə ədəbi və mədəni əlaqələrinin tarixi öyrənilməlidir. Təzkirələrin

tədqiqata cəlb olunması ilə klassik Azərbaycan ədəbiyyatını zənginləşdirmək və adları sadəcə təzkirələrdə xatırlanmış şairləri üzə çıxarmaq mümkündür.

Məhz bu səbəbdən monoqrafiyada XVI-XX əsrlər Azərbaycan təzkirəçiliyini araşdırmaq üçün qarşıya aşağıdakı vəzifələr qoyulmuşdur:

- Azərbaycan təzkirələrinin nəşri vəziyyəti və tədqiq tarixini araşdırmaq;
- Azərbaycan təzkirələrinin təsnifatını aparmaq;
- Təzkirələrin dil-üslub xüsusiyyətlərini təhlil etmək;
- Təzkirələrin strukturunu müəyyənləşdirmək;
- Azərbaycan təzkirələrinin əhatə etdiyi coğrafiya və dövrü öyrənmək;
- Təzkirələrin yazıldığı zaman və məkanı aydınlaşdırmaq;
- Azərbaycan müəlliflərinin qələmə aldığı tarixi əsərlərin təzkirə hissəsini tədqiqata cəlb etmək;
- XX əsrdə çap olunmuş təzkirə xarakterli əsərlərə nəzər salmaq;
- Azərbaycan təzkirələrinin özünəməxsus cəhətlərini üzə çıxarmaq və Osmanlı təzkirələrindən fərqli xüsusiyyətlərini araşdırmaq;
- XVI-XXI əsr Azərbaycan təzkirəçilərinin həyat və yaradıcılığını nəzərdən keçirmək, təzkirələrin strukturunu, əsas cəhətlərini, özəlliklərini şərh etmək, əlyazma nüsxələri haqqında məlumat vermək.

Azərbaycanlı müəlliflər tərəfindən şairlərdən bəhs etməyən və başqa mövzuları əhatə edən təzkirələr də qələmə alınmışdır[4]. Bu əsərlər şair təzkirələri olmadığı üçün tədqiqat obyektimizdən kənarda qalmışdır.

---

[4] Xacə Nəsrəddin Tusi. Təzkirə ("Ağazü əncam", "Məbdə və məad" – "Başlanğıc və son"). Bakı: 2002, 70 s.; Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi). Bakı: 2006, 932 s.; Şah Təhmasibin təzkirəsi. Bakı: 1996, 128 s.; Hacı Şıxəli Feyzullazadə. Təzkirətül-övliya. Bakı, 1917, 78 s.

Monoqrafiyada Azərbaycan təzkirəçiləri haqqında məlumat verərkən xronoloji prinsipi əsas götürmüşük. Hər bir təzkirəçidən bəhs olunarkən onun həyatı və yaradıcılığı haqqında qısa məlumat verilmiş, əsas diqqət isə təzkirəsinə yönəldilmişdir.

Apardığımız tədqiqatlar nəticəsində məlum olmuşdur ki, azərbaycanlı təzkirəçilər bu janrda 46 əsər qələmə almışlar. XVI əsrdə dörd, XVII əsrdə iki, XVIII əsrdə beş, XIX əsrdə iyirmi iki, XX əsrdə on iki, XXI əsrdə bir təzkirə yazılmışdır.

Azərbaycan təzkirəçiliyinin tədqiq tarixinə nəzər salsaq görəcəyik ki, Azərbaycan təzkirəçilik tarixi kompleks şəkildə araşdırılmamışdır. Belə ki, bəzi təzkirələr tədqiqatçıların diqqət mərkəzində olmuşdur. Ayrı-ayrı monoqrafiya, dissertasiya və məqalələrdə tədqiqat obyektimiz olan mövzunun müəyyən problemlərinə toxunulmuşdur. Monoqrafiyada K.Talıbzadə, S.Rüstəmov, N.Qarayev, Q.Kəndli, Ə.Xələfov, A.Muayeva, M.Muradova, M.Məmmədova, T.Həsənzadə, M.İsen, F.Kılıç, Ö.Bayram, S.Solmaz, K.Məmmədova, A.Topalova, J.Şükürova və başqa alimlərin Azərbaycan təzkirəçiliyi ilə bağlı tədqiqatları, fikirləri, mülahizələri nəzərə alınmışdır.

Azərbaycan təzkirələri üzərində araşdırmalarımıza 2001-ci ildən başlamışıq. On bir il ərzində türk təzkirələri üzərində sistemli tədqiqatlar aparmağa, Azərbaycan və Osmanlı təzkirəçiliyinin araşdırılmamış səhifələrini tədqiq etməyə səy göstərmişik. Hələ 2004-cü ildə "XX əsr Azərbaycan təzkirəçiliyi" adlı magistr dissertasiyası, 2006-cı ildə isə "XV-XVII əsrlər türk təzkirələrinin strukturu və spesifikası" mövzusunda namizədlik dissertasiyası tərəfimizdən müdafiə olunmuşdur. Bunlardan əlavə, "XV-XVII əsrlər türk təzkirəçiliyi" və "Osmanlı təzkirələrində Azərbaycan şairləri" adlı monoqrafiyalarımız işıq üzü görmüşdür. "Türk təzkirəçiliyi: biblioqrafiya" adlı kitabımızda isə Azərbaycan, Osmanlı və Orta Asiya şair təzkirələrinin müxtəlif kitabxanalarda saxlanılan əlyazma nüsxələrinin elmi-paleoqrafik xüsusiyyətləri verilmiş, təzkirələrə həsr olunmuş kitab, məqalə və dissertasiyaların biblioqrafik təsviri yer almışdır.

Təzkirələrə dair tədqiqatlarımız qırxdan artıq məqalədə öz əksini tapmış, eləcə də Azərbaycanda və xaricdə təşkil olunmuş 19 beynəlxalq elmi konfransda təzkirələrin öyrənilməsinə həsr olunmuş məruzələrimiz dinlənilmişdir.

Təzkirələr üzərində işə başladığımız zaman ilk öncə təzkirələrin biblioqrafiyası hazırlanmış, bundan sonra Azərbaycan təzkirələrinin dünyanın müxtəlif əlyazma xəzinələrinə səpələnmiş əlyazmaları, təzkirələrin elmi-tənqidi mətnlərinin nəşri, çap olunmuş məqalələr, monoqrafiyalar, müdafiə olunmuş dissertasiyalar və s. dəqiqləşdirilmiş və nəzərdən keçirilmişdir.

Bu kitab hazırlanarkən tərəfimizdən mövcud Şərq əlyazma kataloqları bir-bir nəzərdən keçirilmiş, azərbaycanlı müəlliflərin həyatı, yaradıcılığı və təzkirələri haqqında məlumat toplanılmışdır. Azərbaycanlı müəlliflərin təzkirələrinin böyük bir qismi əldə edilmişdir. Bundan əlavə, Türkiyə və İranın müxtəlif kitabxanalarında da araşdırmalar aparılmışdır. Nəticədə, adı Azərbaycan oxucusuna tanış olmayan neçə-neçə təzkirəyə dair məlumatları əsərə daxil etmişik.

Son olaraq, məni təzkirələr üzərində araşdırmalara yönləndirən, istiqamət verən elmi rəhbərim prof. Azadə Musayevaya dərin minnətdarlığımı bildirirəm. Dəyərli məsləhətlərinə görə f.e.d. Nəsib Göyüşova xüsusi təşəkkürümü çatdırıram.

Mövzuya dair ədəbiyyatın əldə edilməsində göstərdikləri köməyə görə Prof. Dr. Filiz Kılıça, Hacı Mustafa Əliyevə, Dos. Nailə Süleymanovaya, Jalə Şükürovaya, Yrd. Doç.Dr. Ömər və Pərvanə Bayrama, Prof. Dr. Namiq Açıqgözə, Doç. Dr. Süleyman Solmaza, Yrd. Doç.Dr. Tuba Işınsu Durmuşa, Doç. Dr. Gencay Zavotçuya, Doç. Dr. Aysun Eydurana sonsuz minnətdarlığımı ifadə edirəm.

Monoqrafiyanın korrektə olunmasına əmək sərf etmiş BDU-nun Nəşriyyat işi və redaktəetmə ixtisasının III kurs tələbələrinə və xüsusilə Nübar Şükürovaya təşəkkürümü bildirirəm.

Mənəvi dəstəyinə görə çox dəyərli ailəmə təşəkkürlərimi çatdırıram.

Təzkirələrə həsr olunmuş çoxsaylı araşdırmaların müəllifi olan müəllimim dos. Əşrəf Xələfovu və Əlyazmalar İnstitutunun mərhum direktoru f.e.d. Məmməd Adilovun hörmətlə yad edir və onlara Allahdan rəhmət diləyirəm.

Onu da qeyd edək ki, Azərbaycan təzkirəçilik tarixinin sistemli şəkildə araşdırılması tərəfimizdən həyata keçirilən ilk təşəbbüsdür. Bu cəhəti diqqətə alsaq, burada gözdən qaçan məqamların olması mümkündür. Mütəxəssislərin bu amili nəzərə almalarını xahiş edir və söyləyəcəkləri irad və təkliflərə görə onlara əvvəlcədən minnətdarlığımızı bildiririk. Kitabın ədəbiyyatşünaslığımıza və təzkirəşünaslığımıza faydalı olması ümidi və arzusu ilə…

**Vüsalə Musalı**
filologiya üzrə fəlsəfə doktoru, dosent
www.tezkire.info
tezkireshinas@gmail.com

# I FƏSİL

## AZƏRBAYCAN TƏZKİRƏLƏRİNİN NƏŞRİ VƏZİYYƏTİ VƏ TƏDQİQ TARİXİ

1.1.Təzkirələrin nəşri vəziyyəti və problemləri

1.2.Təzkirələrin tədqiq tarixi

## 1.1. TƏZKİRƏLƏRİN NƏŞRİ VƏZİYYƏTİ VƏ PROBLEMLƏRİ

Azərbaycan təzkirəşünaslığını nəzərdən keçirdikcə məlum olur ki, bu sahədəki tədqiqatlar üç istiqamətdə aparılmışdır:

1. Ayrı-ayrı təzkirələrin tərcüməsi, transfoneliterasiyası və elmi-tənqidi mətnlərinin tərtibi;
2. Təzkirələrə dair tədqiqatlar və dissertasiyaların yazılması;
3. Təzkirələrin nəzəri baxımdan tədqiqi, sistemləşdirilməsi, biblioqrafiyasının hazırlanması.

Burada Azərbaycan təzkirəçiliyinin tədqiq tarixini təqdim edərkən xronoloji prinsipi əsas götürməyi və hər bir təzkirəyə dair aparılmış tədqiqatları sistemli şəkildə verməyi məqsədəuyğun hesab edirik.

Çox təəssüf ki, təzkirəşünaslarımız azərbaycanlı təzkirəçilər sırasında indiyə kimi təxminən iyirmi müəllifin adını xatırlamışlar. Bu təzkirələri aşağıdakı şəkildə sıralamaq mümkündür: XVI əsr müəllifləri Sam mirzənin "Töhfeyi-Sami", Əhdi Bağdadinin "Gülşəni-şüəra", İbrahim mirzənin "Fərhəngi-İbrahim", XVII əsr təzkirəçilərindən Sadiq bəy Əfşarın "Məcməül-xəvas", XVIII əsr təzkirəçilərindən Əliqulu xan Valehin "Riyazüş-şüəra", Lütfəli bəy Azərin "Atəşkədə", XIX əsr müəlliflərindən Bəhmən mirzənin "Təzkireyi-Məhəmmədşahi", Məhəmmədhəsən xan Etimadüssəltənənin "Xeyrati-hesan", Seyid Əzim Şirvaninin "Təzkirə", Ziyainin "Təzkireyi-Ziyai", Mir Möhsün Nəvvabın "Təzkireyi-Nəvvab", XX əsr təzkirəçilərindən Məhəmməd ağa Müctəhidzadənin "Riyazül-aşiqin", Həsənəli xan Qaradağinin "Təzkireyi-Qaradaği", İbrahim Tahir Musayevin "Riyazül-arifin", Məhəmmədəli Tərbiyətin "Danişməndani-Azərbaycan", Qulam Məmmədlinin "Təzkirə", Əziz Dövlətabadinin "Süxənvərani-Azərbaycan", Əli Nəzminin "Devist süxənvər", Məhəmməd Deyhimin "Təzkireyi-şüərayi-Azərbaycan" təzkirələri.

Ancaq Azərbaycan təzkirəçiliyini araşdırdıqda bu nümunələrin sayının 46 olduğu üzə çıxmışdır. Azərbaycan təzkirəçiliyinin bu və ya digər dövrü araşdırılarkən xatırlanmayan Azərbaycan təzkirəçiləri və əsərləri bunlardır: Tövfi Təbrizi "Təzkireyi-Tövfi" (XVI əsr), Nazim Təbrizi "Nəzmi-güzidə" (XVII əsr), İshaq bəy Üzri "Təzkireyi-İshaq" (XVIII əsr), Əbu Talib xan Təbrizi "Xülasətül-əfkar" (XVIII əsr), Sultan Məhəmməd mirzə Bahadır xan Səfəvi "Töhfətüş-şüəra" (XVIII əsr), Əbdürrəzzaq bəy Dünbüli "Təcrübətül-əhrar və təsliyyətül-əbrar", "Hədayiqül-üdəba", "Nigaristani-Dara" (XIX əsr), Məhəmməd Fazil xan Gorusi Ravi "Əncüməni-xaqan" (XIX əsr), Məhəmməd Saleh Şamlu "Məhəküş-şüəra" (XIX əsr), Hülaku mirzə Qacar "Xərabat" (XIX əsr), Xudaverdi xan Qacar "Təzkireyi-mədayih-i Elxaniyyə" (XIX əsr), Məhəmməd Bağır xan Qacar "Fələkül-Mərrix" (XIX əsr), Heydərqulu mirzə Qacar "Təzkireyi-Xavər" (XIX əsr), Məhəmmədqulu Mirzə Qacar "Təzkireyi-Xosrovi" (XIX əsr), Seyfüddövlə Sultan Məhəmməd Tağı "Bəzmi-xaqan" (XIX əsr), Məhəmməd Kazım Əsrar Əlişah Təbrizi "Behcətüş-şüəra" (XIX əsr), Əli Rza mirzə Qacar "Büstanül-xaqaniyyə" (XIX əsr), Əbülqasım Möhtəşəm Şirvani "Əxtəri-taban" (XIX əsr), Şəmsəddin xan Həqqi Təbrizi "Əncümənül-üdəba" (XX əsr), Seyid Əbdülhəmid Xalxali "Təzkireyi-şüərayi-müasiri-İran" (XX əsr), Yəhya Şeyda "Ədəbiyyat ocağı" (XX əsr).

Bizə məlum olan ilk Azərbaycan təzkirəsi XVI əsrdə Səfəvi şahzadəsi ***Sam mirzə*** tərəfindən fars dilində qələmə alınmış ***"Töhfeyi-Sami"***dir. Bu təzkirəni ilk dəfə Hindistandakı Pətənə Universitetinin professoru ***Mövləvi İqbal Hüseyn*** çap etdirmişdir. O, təzkirənin V fəslini Pətənə Universiteti kitabxanasındakı dörd əlyazma əsasında 1934-cü ildə nəşr etdirmişdir. Daha sonra İran alimi ***Vəhid Dəstgərdi*** əsəri Ağayi-Nəcmabadi kitabxanasındakı nüsxə əsasında nəşrə hazırlamış və bu əsər h.1314/1936-cı ildə Tehranda "Ərməğan" jurnalına əlavə kimi tam şəkildə çap olunmuşdur.

H. 1345/1969-cu ildə isə ***Rüknəddin Fərrux Hümayun*** beş nüsxə (Astani-Qüdsi-Rizəvi, Baetin şəxsi kitabxanasındakı əlyaz-

ma, Məhəmməd Müin kitabxanası, Pətənə Universiteti kitabxanası, Ağayi-Nəcmabadi kitabxanası) əsasında “Töhfeyi-Sami”nin elmi-tənqidi mətnini hazırlamışdır. Təzkirənin bu nəşri bəzi tədqiqatçıların tənqid obyektinə çevrilmişdir. Məsələn, Prof. Dr. A.Karaismailoğlu yazır: “...altıncı bölüm için yararlanılan yazma nüshaların azlığı ve eksik oluşları kanaatimizce çoğunluğu Türkçe beyitlerde olmak üzere geriye bir çok problem bırakmıştır. Bu bölümün hazırlanmasında Mevlevi İkbalın beşinci bölüm için kullandığı yazmaların dikkate alınmadığı anlaşılmaktadır”[5]. Sam mirzədən və təzkirəsindən bəhs edən digər bir müəllif G.S.Alışık sözügedən elmi-tənqidi mətnin türkcə olan hissələrində yanlışlıqların olduğunu xüsusi qeyd edir[6].

Onu da qeyd edək ki, XV əsrin ikinci yarısı və XVI əsrin birinci yarısında yaşayan 714 şair haqqında məlumat verən təzkirə hələ də Azərbaycan dilinə tərcümə olunmamışdır.

Azərbaycan türkcəsində qələmə alınmış ilk təzkirə hesab olunan Əhdi Bağdadinin “Gülşəni-şüəra”sı AMEA Ədəbiyyat İnstitutunun əməkdaşı f.ü.f.d. ***Vəcihə Feyzullayeva*** tərəfindən Sankt-Peterburqdakı Əlyazmalar İnstitutunda saxlanılan nüsxə əsasında nəşrə hazırlanmışdır. Ancaq təzkirə hələ də işıq üzü görməmişdir.

Türk ədəbiyyatı üçün qiymətli mənbə olan “Gülşəni-şüəra” təzkirəsinin 17 nüsxə əsasında elmi-tənqidi mətni Pamukkale Universitetinin əməkdaşı ***Süleyman Solmaz*** tərəfindən hazırlanmış və 2005-ci ildə Atatürk Kültür Mərkəzi Başkanlığı tərəfindən çap olunmuşdur[7].

Araşdırma ön söz, giriş və üç bölümdən ibarətdir. Giriş iki paraqrafa ayrılmışdır. Birinci paraqrafda Əhdinin həyatı haqqında

---

[5] Karaismailoğlu A. Türk edebiyatının kaynaklarından Tuhfei-Sami // Klasik dönem türk şiiri incelemeleri. Ankara: 2001, s. 149.

[6] Alışık G.S. Sam Mirza. Diyanet Vakfi İslam Ansiklopedisi. XXXIX c., İstanbul, 2010, s. 61.

[7] Ahdi ve Gülşen-i şuarası (İnceleme-metin) / Haz.: Süleyman Solmaz. Ankara: 2005.

ilkin mənbələr əsasında geniş məlumat verilir. İkinci paraqrafda təzkirəçinin ədəbi şəxsiyyəti və şairliyinə diqqət yetirilmişdir.

Kitabın I fəsli üç paraqrafdan ibarətdir. Birinci paraqrafda Əhdiyə qədərki türk təzkirəçilik ənənəsinə nəzər salınmış, Əlişir Nəvai, Səhi bəy, Lətifi təzkirələri haqqında məlumat verilmişdir. İkinci paraqraf "Gülşəni-şüəra"da dil və üslub" adlanır. S.Solmaz əsərin müqəddimə və xatiməsinin çətin bir dillə qələmə alındığını yazır. Təzkirənin ilk üç bölməsində də sultan, şahzadə, bəylərbəyi, dəftərdar şairlərdən bəhs olunarkən ərəb-fars ibarələri ilə dolu ağır bir dildən istifadə olunmuşdur. Dördüncü bölmənin dili isə sadədir. Üçüncü paraqraf "Gülşəni-şüəra"nın qaynaqları" adlanır. Burada tədqiqatçı təzkirənin qaynaqlarını təhlil edir. S.Solmaz "Gülşəni-şüəra"nın qaynaqlarını üç qismə ayırmışdır. Kitabın II fəslində təzkirənin əlyazma nüsxələri haqqında məlumat verilmiş və elmi-paleoqrafik təsviri yer almışdır. S.Solmaz təzkirənin Türkiyədə və xaricdə iyirmi nüsxəsinin olduğunu qeyd edir: "Eser yüzyıllara mukavemet etmiş, bilinen yirmi nüshası ile aranılan bir eser olma özelliği göstermektedir"[8]. Tədqiqatçı elmi-tənqidi mətni hazırlayan zaman bunlardan yalnız Rusiya, İngiltərə və Misir nüsxələrini əldə edə bilmədiyini xüsusi vurğulayır.

Kitabın üçüncü fəslində təzkirənin elmi tənqidi mətni yer almışdır. Elmi-tənqidi mətn Fateh Milli Kitabxanası, Əli Əmiri 774 şifrəli əlyazması əsasında hazırlanmışdır. Yardımçı nüsxə kimi İstanbul Universiteti TY. 2604 şifrəli əlyazmadan istifadə olunmuşdur. S.Solmazın uzun illər üzərində çalışaraq ortaya qoyduğu "Gülşəni-şüəra"nın elmi-tənqidi mətni ədəbiyyatşünaslarımız üçün dəyərli töhfədir.

XVII əsr məşhur Azərbaycan xəttatı, rəssam, şair və təzkirə müəllifi ***Sadiq bəy Sadiqinin*** cığatay türkcəsində qələmə aldığı ***"Məcməül-xəvas"*** təzkirəsini İran alimi ***Əbdürrəsul Xəyyampur*** h.ş.1327/1948-ci ildə Təbrizdə nəşr etdirmişdir. Tərtibçi müqəddimədə Sadiqinin həyatı, ədəbi fəaliyyətinə dair fikirlərini vermiş, elmi-tənqidi mətnin hazırlanması prinsiplərindən bəhs etmişdir. Bu

[8] Yenə orada, s. 70.

elmi-təndiqi mətn İstanbul Universiteti 4085 şifrəli əlyazma əsasında hazırlanmış, Nurosmaniyə kitabxanalarındakı 3720 şifrəli nüsxə əsas mətnlə müqayisə olunmuşdur. Xəyyampur kitabda əvvəlcə türkcə hər hansı şair haqda olan hissəni, daha sonra həmin sətirlərin farsca tərcüməsini vermişdir. Beləliklə də, Sadiqinin təzkirəsinə daxil olan 333 şairin tərcümeyi-halları həm türkcə verilmiş, həm də fars dilinə tərcümə olunmuşdur. İlk dəfə Sadiqi təzkirəsinin elmi-tənqidi mətni haqqında türk alimi ***İbrahim Kutluk*** bir məqalə dərc etdirmişdir[9]. Məqaləni nəzərdən keçirdikdə məlum olur ki, İ.Kutlukun "Məcməül-xəvas" təzkirəsi haqqındakı fikirləri arasında ziddiyyətlər vardır. Belə ki, məqalə müəllifi əvvəlcə bu təzkirəni türk mədəniyyət tarixi üçün əhəmiyyətli bir nümunə hesab edir və əsərin farscaya tərcümə edilməsini bəyəndiyini qeyd edir[10]. Daha sonra Kutluk Sadiqi təzkirəsini ciddi tənqid edərək yazır: «"Məcməül-xəvas" bir tərcümeyi-hal məcmuəsindən ziyadə antologiyadır. Verdiyi bioqrafik məlumatların heç bir əhəmiyyəti yoxdur. İçindəki şairlərin nə vaxt yaşayıb-vəfat etdiyi verilməmişdir… Şairlər baxımından əhəmiyyətli olmaqdan ziyadə, cığatay dili baxımından əhəmiyyətlidir"[11].

Prof. ***Əhməd Atəş*** də 1953-cü ildə "Oriens" jurnalının üçüncü cildində təzkirənin elmi-tənqidi mətninin müsbət və mənfi cəhətlərini əks etdirən tənqidi rəy yazmışdır. Xəyyampur Ə.Atəşin qeyd etdiyi çatışmazlıqlar və nöqsanlara cavab olaraq bir məqalə nəşr etdirmişdir[12]. Bundan sonra "Tarix" jurnalında Ə.Atəşin başqa bir məqaləsi dərc olunmuşdur[13].

F.ü.f.d. ***Məntiqə Muradova*** uzun müddət ərzində Sadiq bəy Əfşarın Təbriz külliyyatı (3616) daxilindəki "Məcməül-xəvas"

---

[9] Kutluk İ. Sadıki-i Kitabdar. Macma-al-havas // Türk Dili ve Edebiyatı Dergisi, 1949, № 3-4, s.577-580.
[10] yenə orada, s. 579.
[11] yenə orada, s. 580.
[12] Nəşriyeyi-daneşkədeyi-ədəbiyyati-Təbriz, sal-i 6, s.117-128
[13] Ateş A. Mecma al-Havas / İstanbul edebiyat fakültesi Tarih dergisi, 1953, s.183-187.

nüsxəsini Azərbaycan dilinə çevirərək nəşrə hazırlamışdır. Təəssüf ki, bu tərcümə işıq üzü görməmişdir.

"Məcməül-xəvas"ın Təbriz külliyyatındakı nüsxəsi f.ü.f.d. Ə.Bağırov tərəfindən qısa ön sözlə 2008-ci ildə nəşr olunmuşdur. Tərcümə zamanı təzkirənin Təbriz Dövlət Kitabxanasında mühafizə olunan ***"Külliyyat"***a daxil olan nüsxəsi əsas götürülmüş, h.1327-ci il Ə.R.Xəyyampur nəşri ilə müqayisə olunmuşdur. Tərcümə zamanı sadəcə şair bioqrafiyaları Azərbaycan dilinə tərcümə olunmuş, farsca nümunələr isə Azərbaycan dilinə çevrilməmişdir[14].

***Əliqulu xan Valehin*** qələmə aldığı "Riyazüş-şüəra" Möhsün Naci Nəsrabadi tərəfindən tədqiqata cəlb olunmuş və 2005-ci ildə 5 cilddə (3315 səhifə) Tehranda işıq üzü görmüşdür.

XVIII əsr Azərbaycan təzkirəçisi ***Lütfəli bəy Azərin*** "Atəşkədə"sinin nəşri məsələlərindən f.ü.f.d. M.Məmmədova geniş bəhs etmiş, bu nəşrlərin mənfi və müsbət tərəfləri haqqında məlumat vermişdir. Belə ki, "Atəşkədə" ilk dəfə h. 1249/1833-cü ildə Kəlküttədə nəşr olunmuşdur. Daha sonra əsər 1844-cu ildə ***Dorn*** tərəfindən çap edilmişdir.

Təzkirə h.1277/1860 və h.1299/1881-ci illərdə Hindistanda daşbasması üsulu ilə nəşr olunmuşdur. M.Məmmədova təzkirənin Bombey nəşrlərinin dəqiq işləndiyini və əhəmiyyətli olduğunu vurğulayır. Lakin buna baxmayaraq, tədqiqatçı əldən-ələ keçən, müxtəlif şəxslər tərəfindən işlənib üzü köçürülən "Atəşkədə" əlyazmalarının və çap nüsxələrinin hamısında çoxlu təhriflərə yol verildiyini yazır[15].

Təzkirənin bir nüsxəsinin (h.1247-ci ildə Əli Şeydayi Tusərqaninin köçürdüyü əlyazma) faksimile mətni ön söz və şərhlərlə Seyid Cəfər Şəhidi tərəfindən h. 1337/1958-ci ildə nəşr olunmuşdur. Təzkirənin bu nəşrində şəxs və coğrafi adlar göstəricisi də yer almışdır.

---

[14] Sadiq bəy Sadiqi. Məcməül-xəvas. Bakı, 2008, 411 s.

[15] Məmmədova M. Lütfəli bəy Azər və Azərbaycan ədəbiyyatı. Bakı, 2001, s. 125-126.

"Atəşkədə"nin elmi-tənqidi mətni 1956-1962-ci illərdə İranda işıq üzü görmüşdür. Elmi-tənqidi mətn ***Həsən Sadat Nasiri*** tərəfindən hazırlanmışdır. Həsən Sadat təzkirəni üç cilddə çap etdirmişdir. Hər cildin əvvəlində İran ədəbiyyatşünaslarının kitaba yazdıqları müqəddimə və rəylərdə Azərin alimlik mövqeyi müəyyənləşdirilir. Həsən Sadat təzkirədə olan şeirləri şairlərin divanlarının mətni ilə müqayisə etmiş və "Atəşkədə" ilə "Divan"lar arasındakı fərqləri səhifə altında göstərmişdir.

Elmi-tənqidi mətnin birinci cildi "Atəşkədə"nin birinci məcmərəsinin şahlar və şahzadələr olan hissəsini əhatə edir və 1956-cı ildə Tehranda çap olunmuşdur. İkinci cild 1957-ci ildə işıq üzü görmüşdür və burada Xorasan, Kirman, Astrabad, Cürcan, Mazandaran və Gilanın 152 nəfər şairi daxildir. Təzkirənin üçüncü cildi 1962-ci ildə çap olunmuşdur. Bu cilddə 206 nəfər İraqi-əcəm şairlərindən bəhs olunur.

M.Məmmədova axırıncı "məcmərə"nin – Lütfəli bəy Azərin dövrü, müasirləri və öz yaradıcılığını əhatə edən hissənin elmi-tənqidi mətninin hazırlanmadığını xüsusi vuğulayır[16].

"Atəşkədə"nin hökmdarlar, şahzadələr və əmirlərdən bəhs edən "şölə" hissəsi isə hələ 1841-ci ildə N.Bland tərəfindən Londonda çap olunmuşdur[17].

Bəzi müəlliflər[18] "Atəşkədə"nin türkcəyə tərcümə olunaraq h.1259/1843-cü ildə nəşr edildiyini yazırlar. Lakin T.Yazıcı onların bu fikri ilə razılaşmır. Adı çəkilən tədqiqatçı həmin tarixin Dövlətşah Səmərqəndinin təzkirəsinin Fəhmi Əfəndi tərəfindən "Səfinətüş-şüəra" adı ilə çap olunan tərcüməsinə aid olduğunu bildirir[19].

---

[16] Yenə orada, s. 129.

[17] Bland N. Account of the Atesh Kedah, a Bibliographical work of the Persian Poets, by Haji Lutf Ali Beg, of Ispahan // Journal of the Royal Asiatic Society, VII. - London: Royal Asiatic Society, 1843, 345 - 392 pp.

[18] Bax: Storey Ch. Persian literature. A bio-bibliographikal survey. Vol 1. London, 1927, p. 871; Kramers J.H. Lutf ali Beg. Eİ, v. 5, p. 834.

[19] Yazıcı T. Ateşkede. DVİA. IV c., İstanbul, 1991, s. 59.

Əbdürrəzzaq bəy Dünbilinin "Nigaristani-Dara"sı Əbdürrəsul Xəyyampur tərəfindən h.ş.1342/1963-cü ildə Təbrizdə, "Təcrübətül-əhrar və təsliyətül əbrar" adlı təzkirəsi h.ş.1349/1971-ci ildə Həsən Qazı Təbatəbai tərəfindən Təbrizdə çap olunmuşdur.

Məhəmməd Fazil xan Gorusinin "Əncüməni-xaqan"ı h.ş.1376/1997-98-ci ildə Tofiq Sübhan tərəfindən Tehranda nəşr edilmişdir.

XIX əsrdə yaşayıb-yaratmış türk ədibi Məhəmməd Zehni əfəndinin "***Məşairün-nisa"*** adlı əsərini Marağalı Məhəmmədhəsən xan Etimadüssəltənə ***"Xeyrati-hesan"*** adı altında sadəcə tərcümə etməmiş, buraya azərbaycanlı şairələr haqqında məlumat əlavə edərək 1886-1888-ci ildə üç cilddə farsca nəşr etdirmişdir. T.ü.f.d. ***Tahirə Həsənzadə*** "Xeyrati-hesan" əsərindəki 159 azərbaycanlı-türk qadını haqqında məlumatı fars dilindən Azərbaycan dilinə tərcümə etmişdir[20].

XIX əsrin görkəmli Azərbaycan şairi və təzkirəçisi ***Seyid Əzim Şirvani***nin əsərlərini üç cilddə 1967-1974-cü illərdə ***Süleyman Rüstəmov*** nəşr etdirmişdir. S.Rüstəmovun hazırladığı bu nəşr əvvəlkilərdən əsaslı surətdə fərqlənirdi. Tədqiqatçı şairin irsini diqqət və səylə toplamış, onları elmi prinsiplər üzrə tərtib etmişdir. Seyid Əzim Şirvaninin təzkirəsi bu əsərlərin üçüncü cildində geniş şərhlərlə 1974-cü ildə çap olunmuşdur[21]. Ş.Salmanov Seyiz Əzim təzkirəsinin nəşrindən bəhs edərkən yazır: "Seyid Əzim Şirvani təzkirəsinin elmi-tənqidi mətnini hazırlamaq çətin və mürəkkəb bir tədqiqat işidir. Bir çox şeirlərin məlum məxəzlərdəki mətni ilə buradakını müqayisə edib, fərqləri üzə çıxarmaq, mətni dəqiqləşdirmək, təzkirədə yol verilmiş bəzi təhrifləri düzəltmək, ayrı-ayrı şeirlərin kimə aid olduğunu təyin etmək və s. bu səpkidən olan çə-

---

[20] Marağalı Məhəmmədhəsən xan Etimadüssəltənə. Xeyrati-hesan (Gözəllər sərvəti) / Tərcümə edən: T.Həsənzadə. Bakı, 2003, 103 s.

[21] Seyid Əzim Şirvani. Əsərləri. III cild. Bakı. Elm, 1974, 499 s.

tinliklərin öhdəsindən gəlmək lazım idi. Mətnşünas bu işin öhdəsindən layiqincə gələ bilmişdir”[22].

Türkiyəli tədqiqatçı, Nevşehir Universitetinin müəllimi ***Ömər Bayramın*** “Azərbaycan sahəsi təzkirələri və Seyid Əzim Şirvaninin təzkirəsi” mövzusunda dissertasiyasında da Azərbaycan təzkirəçiliyinin mərhələləri müəyyən qədər tədqiqata cəlb olunmuşdur[23]. Tədqiqat işində Seyid Əzim Şirvaninin həyatı, yaradıcılığı dəyərləndirilmiş, əsas diqqət təzkirəsinə yönəldilmişdir. Müəllif təzkirənin yazılı və şifahi qaynaqlarından bəhs etmiş, əsərin dil və üslubu üzərində dayanmış, digər təzkirələrdən fərqini göstərməyə çalışmışdır. Daha sonra Şirvani təzkirəsində şair və əsərlə bağlı təzkirəçinin dəyərləndirmələri ciddi şəkildə araşdırılmışdır. Etiraf etmək lazımdır ki, Azərbaycan təzkirələrinin, demək olar ki, heç biri bu qədər əhatəli və ciddi şəkildə tədqiqata cəlb olunmamışdır.

Ö. Bayram ***Seyid Əzim Şirvani*** təzkirəsinin mətnini müqayisəli şəkildə nəşrə hazırlamışdır. Bu zaman təzkirənin AMEA Əlyazmalar İnstitutunda mühafizə olunan yeganə nüsxəsi əsas götürülmüş və 1974-cü il nəşri ilə müqayisə olunmuşdur. Təzkirə Türkiyə Cümhuriyyəti Kültür və Turizim Bakanlığının e-kitab layihəsi çərçivəsində hazırlanmışdır[24].

Şərqşünas ailm f.ü.f.d. ***Nəsrəddin Qarayevin*** təzkirələr üzərində apardığı araşdırmalar və nəşrə hazırladığı ***“Təzkireyi-Nəvvab”*** da bu baxımdan diqqətəlayiqdir. Belə ki, N.Qarayev Nəvvab təzkirəsini Azərbaycan dilinə ***tərcümə edərək*** tam şəkildə çapa hazırlamışdır. Mərhum alimin nəşrə hazırladığı bu irihəcmli təzkirənin mətni AMEA ***Əlyazmalar İnstitutunun elmi arxivində*** mühafizə olunmaqdadır[*]. Əsər ***1980-ci*** ildə tamamlanaraq elmi arxivə

---

[22] Salmanov Ş. Rüstəmov Süleyman // Azərbaycan mətnşünaslığı məsələləri, Bakı, 1979, s. 184-187.

[23] Bayram Ö. Azerbaycan sahası tezkireleri ve Seyid Azim Şirvaninin tezkiresi. – Doktora Tezi. Gazi Üniversitesi, Ankara, 2005.

[24] Seyyid Azim Şirvânî - Tezkîretü’ş-Şu’arâ / haz.: Ö.Bayram. T.C. Kültür ve Turizm Bakanlığı Yay. (e-kitap), Ankara.

[*] AMEA Əlyazmalar İnstitutu elmi arxiv. **Nəsrəddin Qarayevin arxivi**. Təzkirənin N.Qarayevin öz xətti ilə olan əlyazması **175** və **176** şifrələri altında iki

təhvil verilmişdir. Kitabın redaktoru iranşünas alim f.ü.f.d. ***Məmmədağa Sultanovdur***. Təzkirə çapa hazırlandıqdan sonra f.ü.f.d. ***Şaməddin Xəlilov*** tərəfindən də təkrar gözdən keçirilmiş və bəzi düzəlişlər edilmişdir. Ancaq bu abidənin nəşrini görmək N.Qarayevə nəsib olmamışdır. Ömür vəfa etmədiyindən əsər uzun illər alimin Əlyazmalar İnstitutundakı elmi arxivində qalmışdır. Nəhayət, "Təzkireyi-Nəvvab" ***1998-ci ildə***[25] Azərbaycan nəşriyyatında işıq üzü görmüşdür. Təzkirənin N.Qarayev tərəfindən hazırlanmış (1980) nüsxəsi ilə 1998-ci il nəşri tərəfimizdən tam şəkildə müqayisə olunmuş və maraqlı faktlar aşkarlanmışdır. Xoşbəxtlikdən, onun çapa hazırladığı əsərin həm əlyazması, həm də makinə çapı arxivdə saxlanılır.

Təəssüf ki, uzun illər bu əsəri nəşrə hazırlayan mərhum N.Qarayevin adı ***mütərcim*** kimi deyil, sadəcə türkcə mətnləri transfoneliterasiya edən şəxs kimi qeyd edilmişdir. Bundan əlavə, kitabın ön sözündə oxuyuruq: *"Əsərin türkcə mətnlər[**] olan hissələrini mərhum tədqiqatçımız Nəsrəddin Qarayev çevirib qurtarmaq üzrə idi. Ancaq bu əsərin yubiley nəşrini planlaşdıranlar unutmuşlar ki, Nəvvab XIX əsr ikidilli ədib-alimlər sırasında gedir... təzkirənin bütün nəsr hissəsi, şeirlərin böyük bir qismi fars dilində idi"*[26]. Təzkirənin 1998-ci il nəşrini çapa hazırlayan və ön sözün müəllifi faktiki olaraq N.Qarayev nüsxəsini ***əsas*** götürsə də, mərhum alimin yalnız təzkirənin kiçik bir hissəsini əhatə edən

---

qovluqda saxlanılır. Eyni əlyazmanın makina çapı isə (1058 səhifə həcmində) 4 qovluqda 152, 153, 154, 155 şifrələri ilə mühafizə olunmaqdadır. Qovluqların hər birinin üzərində yazılmışdır:

"Nəvvab Mir Möhsün Ağamirzadeyi-Qarabaği. Təzkireyi-Nəvvab". **Tərcümə edəni: N.S.Qarayev.** Redaktoru: M.Sultanov. Bakı: 1980.

[25] Bu kitabın titul vərəqində əsərin 1998-ci ildə çap olunduğu yazılmışdır. Ancaq titul vərəqinin arxasında yer alan məlumatda 1995-ci il qeyd olunmuşdur. Yəqin ki, bu, texniki qüsurdur - V.M.

[**] Təzkirənin yalnız türkcə hissələrinin çevrilməsi məsələsi absurddur. Çünki əsərdəki bəzi şeirlər türkcədir və N.Qarayevin bu hissələri transfoneliterasiya etməkdə məqdəsi nə idi? – V.M.

[26] Mir Möhsün Nəvvab. Təzkireyi-Nəvvab. – Bakı: 1995, s. 3.

türkcə mətnləri çevirdiyini dönə-dönə qeyd edir. Halbuki təzkirənin tərcüməsi bütünlüklə (yəni həm fars, həm də türkcə olan hissələr – V.M.) on səkkiz il öncə (1980) N.Qarayev tərəfindən tamamlanmış, tanınmış iranşünas alim M.Sultanov tərəfindən ciddi redaktə olunaraq nəşrə hazır şəkildə elmi arxivə təhvil verilmişdir.

Hal-hazırda elmi yazılarda və akademik nəşrlərdə beynəlxalq standartlar və etik normalar mövcuddur və bu məsələ təkcə Avropada deyil, İran və Türkiyə kimi Şərq ölkələrində də ciddi nəzarətdə saxlanılır. Bununla bağlı, elmdə plagiatlığın və başqa neqativ halların qarşısını almaq üçün normativlər mövcuddur. Müəllif təkcə başqa kitab və qaynaqlardan götürdüyü fakt və mülahizələrə deyil, hətta öz əsərlərinə də istinad etməlidir[27]. Fakt budur ki, Nəvvab təzkirəsi və onu nəşrə hazırlayan mərhum N. Qarayev haqsızlığa uğramışdır.

Bizim burada təzkirənin N.Qarayev tərəfindən çapa hazırlanmış nüsxəsi haqqında geniş məlumat verməyimizin məqsədi "Təzkireyi-Nəvvab" kimi irihəcmli əsər üzərində işləyərək onu tam şəkildə çapa hazırlayan mərhum tədqiqatçının xidmətini uzun illərdən sonra obyektiv şəkildə qiymətləndirmək, bu barədə elmi ictimaiyyəti bilgiləndirmək və Nəsrəddin Qarayevin adını Azərbaycan təzkirəşünaslıq tarixinə daxil etməkdən ibarətdir.

***Məhəmməd ağa Müctəhidzadənin "Riyazül-aşiqin"*** təzkirəsi hələ müəllifin sağlığında, ***1910-cu*** ildə İstanbulda çap olunmuşdur[28]. ***Sədi Çögənli*** və ***Rəcəb Toparlı*** isə təzkirənin 1910-cu il nəşrini, ön söz əlavə olunmaqla 1992-ci ildə Ərzurumda çap etdir-

---

[27] Bax: Gökyay O.Ş. Destursuz bağa girenler. İstanbul, Kabalcı yayınevi, 2007, 357 s.; Demirel İ.H., Erol B., Saraç C. Akademik yazım ihlalleri. Ankara: TÜBİTAK, 2011, 132 s.

[28] Karabağlı Müctehid-zade Mehmed Aka. Tezkiretü'ş-şuara Riyazül-aşıkin. – Dersaadet: Karabet Matbaası, 1328.

mişlər[29]. Təzkirə transliterasiya olunaraq, 1995-ci ildə Bakıda çap edilmişdir[30].

Həsənəli xan Qaradağinin təzkirəsi zamanımıza gəlib çatmamışdır. Təzkirəçinin həyat və yaradıcılığı f.ü.f.d. Nəsrəddin Qarayev, dos. Vüqar Qaradağlı və dos. Raqub Kərimov tərəfindən tədqiq olunmuşdur[31].

Böyük Azərbaycan alimi və ədibi ***Məhəmmədəli Tərbiyətin*** fars dilində qələmə aldığı ***"Danişməndani-Azərbaycan"*** adlı təzkirəsi 1314/1935-ci ildə Tehranda çap olunmuşdur. Təzkirə ***İsmayıl Şəms*** və ***Qafar Kəndli*** tərəfindən Azərbaycan dilinə tərcümə olunaraq, geniş ön sözlə 1987-ci ildə nəşr edilmişdir[32]. Kitabın sonunda "Azərbaycanda çıxmış qəzetlər" haqqında məlumat da yer almışdır.

Bu böyük həcmli təzkirənin 1987-ci il nəşri fars dilini bilməyən mütəxəssislərin tənqid obyektinə çevrilmişdir. Tərcümənin yalnız qüsurlu tərəflərini diqqətə çatdırmaq istəyən tədqiqatçılar əsərin önəmini vurğulamaqdan çəkinmişlər. Məsələn A.Topalova tərcümədə bir sıra qüsurların olduğunu yazır və bunun əsərin mənbəşünaslıq baxımından dəyərini xeyli aşağı saldığını xüsusi qeyd edir. Daha sonra çox kəskin şəkildə yazır: *"Kitabdakı farsca şeir nümunələrini şairlik haqqında heç bir təsəvvürü olmayan və Azərbaycan ədəbi dilini yaxşı bilməyən İsmayıl Şəmsin "poetik" tərcü-*

---

29 Karabağlı Müctehid-zade Mehmed Aka. Tezkiretü'ş-şuara Riyazü'l-aşıkin / Ön söz. M. Sadi Çöğenli ve R.Toparlı. Erzurum, 1992.

30 Müctəhidzadə Məhəmmədağa. Riyazül-aşiqin / Çapa haz. f.e.n. Ə.Bağırov. - Bakı: Azərbaycan, 1995. - 248 s.

31 Qarayev N. XIX əsrin ikinci yarısında Azərbaycanın görkəmli maarifpərvər şairlərindən Həsənəli Xan Qaradaği. - Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutu Elmi Arxivi, (əlyazma, kiril əlifbası ilə, maşın çapı). 143 s.; Qaradaği (Xan-Qaradağski) Həsənəli ağa. Fələyin bir belə dövrü olacaqmış...(şeirlər, tərcümələr, tarixi salnamə) / Tərtib ed. R.Kərimov; ön sözün müəl.: V.Qaradağlı. - Bakı: "Azərbaycan Milli Ensiklopediyası" NPB, 2003. - 280 səh., Qaradaği (Xan-Qaradağski), Həsənəli Xan. Əsərləri / Ön söz və tərtib R.Kərimov. Bakı: "Şuşa" nəşriyyatı, 2004. - 168 s.

32 Məhəmmədəli Tərbiyət. Danişməndani-Azərbaycan. Bakı: Azərnəşr, 1987, 464 s.

*mə etməsi isə əsərin ciddiliyinə xeyli xələl gətirmişdir... ən təəccüblüsü isə Söhrab Tahir kimi görkəmli bir şairin bu cür ədəbi xalturalara rəy verməsidir"*[33].

Hər halda, müəyyən qüsurlarına baxmayaraq, təzkirənin Azərbaycan dilinə tərcümə olunmasını Azərbaycan təzkirəşünaslığına bir töhfə hesab etmək lazımdır.

Seyyid Əbdülhəmid Xalxalinin "Təzkireyi-şüərayi-müasiri-İran" adlı iki cildlik əsəri h.ş.1333/1954-1337 / 1958-ci illərdə Tehranda "Təhuri" nəşriyyatda işıq üzü görmüşdür.

Əziz Dövlətabadinin "Süxənvərani-Azərbaycan" adlı təzkirəsi 1377/1998-ci ildə Tehranda iki cilddə nəşr olunmuşdur. Təzkirəçinin digər əsəri ("Qafqazın farsdilli şairləri") 1370/1991-cı ildə Tehranda çap edilmişdir.

Azərbaycanlı təzkirəçi Yəhya Şeydanın "Ədəbiyyat ocağı" adı verdiyi təzkirəsi 1985-2002-ci illərdə üç cilddə Təbrizdə işıq üzü görmüşdür.

Məhəmməd Dəyhimin "Təzkireyi-şüərayi-Azərbaycan" adlı beş cildlik əsəri 1989-1992-ci illərdə Təbrizdə nəşr edilmişdir.

Şahin Fazilin hazırladığı "Təzkireyi-Şahin" 2006-cı ildə Bakıda çap olunmuşdur.

## 1.2. TƏZKİRƏLƏRİN TƏDQİQ TARİXİ

Bizə məlum olan ilk Azərbaycan təzkirəsi ***«Töhfeyi-Sami» Sam mirzə*** tərəfindən fars dilində qələmə alınmışdır. I Şah İsmayılın ikinci oğlu Sam mirzənin həyatı haqqında Səfəvilər dövrünün ayrı-ayrı tarixi mənbələrində əhəmiyyətli, lakin adda-budda, səpələnmiş faktlara, həmçinin müxtəlif təzkirələrdə yığcam və əsasən bir-birini təkrarlayan məlumatlara rast gəlirik. O. Əfəndiyev[34] və

[33] Topalova A. Ədəbiyyat tarixinin öyrənilməsində təzkirələrin rolu və Ağa Məhəmməd Müctəhidzadənin «Riyazül-aşiqin» təzkirəsi. - Bakı: Elm, 2001. s. 43-44.

[34] Эфендиев О. Азербайджанское государство Сефевидов в XVI веке. Баку, 1981, 306 с.

R.Seyvori[35] də Səfəvilər dövlətinə həsr olunmuş kitablarında Sam mirzədən yeri gəldikcə bəhs etmişlər. Filol.e.n. Ə.Rəhimovun tədqiqatları istisna olmaqla müasir tədqiqatlarda Sam mirzənin həyat yolu ötəri işıqlandırılmışdır.

Sam mirzənin təzkirəsinə həsr edilmiş, bizə məlum olan ilk məqaləni 1798-ci ildə fransız tədqiqatçısı ***S. de Sacy*** nəşr etdirmişdir[36]. "İndo-İranika" jurnalında da Sam mirzə təzkirəsinə həsr edilmiş məqalə çap olunmuşdur[37].

***1927***-ci ildə "Həyat məcmuəsi"ndə türk alimi ***Fuad Köprülü*** "Töhfeyi-Sami" haqqında məqalə nəşr etdirmişdir. 1934-cü ildə F.Köprülünün "Sam Mirza Safevi ve eseri" adlı başqa bir məqaləsi də dərc olunmuşdur[38].

"Töhfeyi-Sami" tacik alimi ***A.Səttarovun*** ayrıca tədqiqat obyekti olmuşdur. O, 1972-ci ildə təzkirəni dissertasiya səviyyəsində tədqiqata cəlb etmiş[39] və "Töhfeyi-Sami" və onun xüsusiyyətləri" adlı monoqrafiya nəşr etdirmişdir[40]. A.Səttarov Sam mirzənin təzkirəsinə xüsusi tədqiqat həsr etmişdirsə də təzkirəçinin həyatı haqqında XVIII-XX əsrlər təzkirəçilərinin və kataloq tərtibçilərinin verdikləri informasiyaları sadalamaqdan uzağa gedə bilməmişdir. Tədqiqatçının bu əsərində bir sıra tarixi təhriflərə də rast gəlmək mümkündür[41]. Məsələn, A.Səttarov Sam mirzənin Heratda üsyan

---

[35] Savory R. Iran under the Safavids. Cambridge, 1980, 277 p.

[36] S. de Sacy. Le present sublime on histoire des poetes de Sam mirza // Notices et extraits des manuscrits de la bibliotheque nationale. Tome IV, Paris, 1798, p. 273-308.

[37] Kazi M.İ. Sam Mirza and his "Tuhfa-i Sami" // İndo-İranica / 1. – 1960. - p. 18 – 39.

[38] Köprülü F. Sam Mirza Safevi ve eseri // Azerbaycan Yurt bilgisi, 1934, № 3, s.32-34.

[39] Сатторов А. «Тухфаи-Соми» Соммирзо Сафави как первоисточник для изучения персидского-таджикского литературы XV-первой половины XVI вв., Автореф. диссерт. на соиск. кандид. филол. наук, Душанбе, 1972, 25 с.

[40] Саттаров А. Тухфаи Соми ва хусусиятхои он. Душанбе, 1972, 133 с.

[41] Ə.Rəhimovun Sam mirzənin qətli haqqındakı məqaləsinində də belə bir qeydə rast gəldik: «A.Səttarovun bu əsərində bir sıra tarixi səhvlər vardır. Təssüf ki,

qaldırıb, Qəndəhar üzərinə getdikdən, məğlub olduqdan və Xorasan valiliyindən uzaqlaşdırıldıqdan sonra onun Təhmasib tərəfindən Fars hakimi, daha sonra Azərbaycan hakimi təyin edildiyini yazır. Lakin bu məlumat tamamilə yanlışdır və heç bir fakta əsaslanmır.

Azərbaycan ədəbiyyatşünasları ilkin mənbə kimi "Töhfeyi-Sami"yə müraciət etsələr də, təzkirə bütünlükdə tədqiqata cəlb olunmamışdır. Sam mirzənin həyat yolunun öyrənilməsindən danışarkən mərhum şərqşünas alim, f.ü.f.d. ***Əbülfəz Rəhimovun*** nəşr etdirdiyi iki mənbənin – "Təkmilətül-əxbar"[42], "Şah Təhmasibin təzkirəsi"[43] əsərlərinin və "Sam mirzənin qətli haqqında yeni məlumat"[44] adlı məqalənin böyük əhəmiyyət daşıdığını xüsusi qeyd etməliyik. Alimin "Xülasətüt-təvarix" üzərində apardığı tədqiqatlar Sam mirzənin həbs olunma şəraitini dəqiqləşdirməyə imkan yaradır. Ə.Rəhimov Sam mirzənin ölüm tarixinin Əbdi bəy Şirazi tərəfindən "Təkmilətül-əxbar"ın həm nəsr hissəsində, həm də "maddeyi-tarix"ində h.975-ci (m.1567) il kimi göstərildiyini sübut etmişdir.

***Adnan Karaismailoğlunun*** «"Töhfeyi-Sami" və altıncı fəslinin tərcüməsi» adlı məqaləsində Fərrux Hümayun nəşri əsasında təzkirənin VI fəslindəki 8 şairin tərcümeyi-halı türkcəyə tərcümə olunmuşdur. Məqalənin adından da məlum olduğu kimi, tədqiqatçı burada təzkirənin VI fəslinin tərcüməsini verməli idi. Burada isə ancaq Ə.Nəvai, Əhməd Süheyli, Məhəmməd Saleh, Mir Ahi,

---

vaxtilə bu haqda yazdığımız rəyi çap etdirə bilməmişik». Rəy çap olunmadığı üçün Ə.Rəhimovun hansı səhvləri nəzərdə tutduğunu deyə bilmirik.

[42] Xacə Zeynalabidin Əli Əbdi bəy Şirazi. Təkmilətül- əxbar (Səfəvi dövrü Şah İsmayıl və Şah Təhmasib dövrləri tarixi). Bakı, 1996, 200 s.

[43] Şah Təhmasibin təzkirəsi / Çapa haz. Ə.Rəcəbov. Bakı, 1996, 128 s.

[44] Rəhimov Ə. Sam Mirzənin qətli haqqında yeni məlumat // AEA Xəbərləri. Ədəbiyyat, dil və incəsənət seriyası, 1990, № 4, s. 94-101.

Hüseyn Cəlayir, Cədidi, Həbibi Bərgüşadi, Susəni haqqında məlumat verilmişdir və məqalənin adı məzmununu tam əhatə etmir[45].

***G.S.Alışık*** Diyanət Vəqfi İslam Ensiklopediyasında Sam mirzənin həyatı və təzkirəsi haqqında məlumat verir. Müəllif yanlış olaraq Sam mirzəni iranlı kimi təqdim edir[46]. Ümumiyyətlə, qeyd olunan ensiklopediyada bir sıra azərbaycanlı şairlər iranlı və ya dağıstanlı kimi qələmə verilmişlər (məsələn, Şirvanizadə Mehmed Rüşdi Paşa, şirvanlı Fateh Əfəndi, Nigari və s.).

2008-ci ildə İran alimi P.Həbibabadi "Töhfeyi-Sami təzkirəsinə dair araşdırma" adlı monoqrafiya nəşr etdirmişdir[47].

Onu da qeyd edək ki, XV əsrin ikinci yarısı və XVI əsrin birinci yarısında yaşayan 714 şair haqqında məlumat verən təzkirə hələ də Azərbaycan dilinə tərcümə olunmamışdır.

Azərbaycan türkcəsində qələmə alınmış ilk təzkirə hesab olunan ***Əhdinin "Gülşəni-şüəra"sı*** müxtəlif tədqiqatçıların araşdırma obyekti olmuşdur.

***Stüart Robinson*** "İran və İslam" məcmuəsində Əhdi Bağdadi təzkirəsi haqqında məqalə dərc etdirmişdir[48]. Prof. ***Azadə Musayeva*** isə Bağdadda yaranan Azərbaycan ədəbiyyatını araşdırarkən "Gülşəni-şüəra"ya müraciət etmiş və Bağdad ədəbi mühitinin yetişdirdiyi azərbaycanlılar haqqında məlumatı məhz bu mənbəyə istinadən vermişdir[49]. ***C.Musayevin*** "Maarifçi" qəzetində Əhdi təz-

---

[45] Karaismailoğlu A. Türk edebiyyatı kaynaklarından «Tuhfe-i Sami» ve altıncı bölümünün tercümesi // Türk Dünyası Araştırmaları, 1988 Aralık, № 57, s.178-186.

[46] Alışık G.S. Sam Mirza. Diyanet Vakfi İslam Ansiklopedisi. XXXIX c., İstanbul, 2010, s. 61.

[47] Həbibabadi P. Təəmmüli dər təzkireyi-"Töhfeyi-Sami". Tehran, 2005.

[48] Robinson J. S. Ahdi and His Biographies of Poets // Iran and Islam, Edinburgh, 1971.

[49] Musabəyli A. Ruhi Bağdadi: mühiti, həyatı, poetikası və Divanı (əlyazma qaynaqları əsasında). Bakı, 2005, 952 s.; Musayeva A. Əlyazma kitabı və XV-XVI əsrlər Azərbaycan ədəbiyyatı: problemlər, araşdırmalar. Bakı, 2002, 340 s.

kirəsindən bəhs edən "İraqda yaranmış Azərbaycan təzkirəsinin əlyazması" adlı məqaləsi dərc olunmuşdur[50].

F.ü.f.d. ***Vəcihə Feyzullayevanın*** da Əhdi Bağdadinin şeir yaradıcılığı və təzkirəsindən bəhs edən məqalələri dərc edilmişdir[51].

Təzkirə Türkiyə ədəbiyyatşünaslarının da tədqiqat obyekti olmuşdur. Prof. ***Hasibe Mazıoğlu*** Ankara Universiteti Dil, Tarix və Coğrafiya fakültəsi İsmayıl Saib Səncər əlyazmaları arasında mühafizə olunan bir əlyazmada Əhdinin 33 qəzəlinin olduğunu müəyyənləşdirmiş və "Gülşəni-şüəra"dakı qəzəlləri ilə birlikdə məqalə şəklində çap etdirmişdir[52].

Digər Türkiyəli tədqiqatçı ***Zülfi Gülərin*** Əhdinin H.Mazıoğlu tərəfindən nəşr olunan şeirlərindən başqa, iki qəsidə və bir qəzəli ilə Sadiqi təzkirəsindəki üç farsca beytini əhatə edən məqaləsi vardır. Məqalədə Əhdi Bağdadinin biblioqrafiyası da verilmişdir[53].

***S.C.Robinsonun*** "Əhdi və onun şairlər təzkirəsi" adlı məqaləsi ***T.Bağırzadə*** və ***F.Hüseynov*** tərəfindən ingilis dilindən ruscaya tərcümə edilmişdir. Məqalənin əvvəlindəki qısa tanıtım məqaləsində Əhdi təzkirəsinin dünya kitabxanalarında tədqiqatçı ehtiyacını ödəyəcək sayda əlyazma nüsxələrinin olmasına baxmayaraq, indiyə kimi nə tənqidi mətninin tərtib olunmadığı, nə də çap olunmaması qeyd edilmişdir[54]. Halbuki Əhdi təzkirəsinin elmi-tənqidi mətni 2005-ci ildə S.Solmaz tərəfindən nəşr olunmuşdur.

Bu sətirlərin müəllifi tərəfindən "Gülşəni-şüəra"da İstanbulun ədəbi mühiti və istanbullu şairlərdən bəhs edən məqalə 2009-

---

[50] Musayev C. İraqda yaranmış Azərbaycan təzkirəsinin əlyazması // "Maarifçi", 24 sentyabr 1997.

[51] Feyzullayeva V. Əhdi Bağdadi və onun "Gülşəni-şüəra" təzkirəsi // Ədəbiyyat məcmuəsi, 2000, s.198-205; Feyzullayeva V. Əhdi Bağdadinin şeir yaradıcılığı (şairin nəzirələri) // Filologiya məsələləri, 2003, N 1, s. 14-20.

[52] Mazıoğlu H. Ahdi Bağdadi ve şiirleri // Türk Dili Araştırmaları Yıllığı Belleten, 1978-1979, s. 95-150.

[53] Güler Z. Ahdi ve Gülşen-i şuara bibliografyası ve yayımlanmamış şiirleri // Fırat Üniversitesi Sosyal Bilimler Dergisi, 1994, C. 6, S: 1-2, s. 107-119.

[54] Robinson C.S. Əhdi Bağdadinin "Gülşəni-şüəra" təzkirəsi / Çev.: T.Bağırzadə, F.Hüseynov, "Şərq" tərcümə toplusu, 2006, N3, s. 173.

cu ildə, bu təzkirənin elmi-tənqidi mətni haqqında məqalə isə 2011-ci ildə işıq üzü görmüşdür[55].

***Sadiq bəy Sadiqinin*** cığatay türkcəsində qələmə aldığı "Məcməül-xəvas" təzkirəsi prof. ***Q.Kəndli-Herisçi*** tərəfindən ətraflı şəkildə öyrənilmişdir. "Sadıq bəy Sadiqinin həyat və yaradıcılığı haqqında bəzi qeydlər" başlıqlı iri həcmli məqalədə Sadiqinin əfşar, yoxsa xudabəndəli elinə mənsub olması, təvəllüd və vəfat tarixləri dəqiqləşdirilmişdir. Sadıq bəyin rəssamlıq fəaliyyətindən də bəhs edən Q.Kəndli əsas diqqəti "Məcməül-xəvas" təzkirəsinə yönəltmişdir. Burada təzkirənin strukturundan və Xəyyampur nəşrindən geniş şəkildə söz açılmışdır[56].

F.ü.f.d. ***M.Muradova*** Sadiq bəy Əfşarın həyatı və elmi fəaliyyətini dissertasiya səviyyəsində tədqiqata cəlb etmiş (1977) və uzun illərdən sonra "Sadiq bəy Sadiqinin həyat və yaradıcılığı" adlı monoqrafiyası çap olunmuşdur[57].

Kitabda Sadiqi irsinin tədqiq tarixi, şairin həyatı tədqiq olunmuş, "Məcməül-xəvas" və ***"Qanunüs-süvər"*** adlı əsərləri təhlil edilmiş, Sadiqi lirikasında məhəbbət mövzusu, ictimai motivlər, bədii xüsusiyyətlər araşdırılmışdır. Əsərdə Sadiqinin epik şeiri və nəsrindən danışılarkən ***"Fəthnameyi-Abbas-namdar"*** adlı əsərindən ayrıca bəhs olunmuş, təzkirəçinin nəsihətnamələri, mənzum hekayələri, məktubları və "Risaleyi-həzziyyat"ı tədqiq olunmuşdur.

---

[55] Musalı V. Ahdi Bağdadi tezkiresinde İstanbul ve İstanbullu şairler // I Uluslararası Türk Edebiyatında İstanbul Sempozyumu Bildirileri. (3-5 Nisan 2008, İstanbul). İstanbul, Beşir Kitabevi, 2009, s. 809-822; Musalı V. Əhdi Bağdadinin "Gülşəni-şüəra"sının elmi-tənqidi mətni // Turkish Studies – International Periodical For The Languages, Literature and History of Turkish or Turkic. Volume 6/2, Spring 2011, s. 681-688. http://www.turkishstudies.net/Makaleler/987381722_44Musal%c4%b1%20V%c3%bcsale.pdf.

[56] Kəndli-Herisçi. Sadıq bəy Sadiqinin həyat və yaradıcılığı haqqında bəzi qeydlər // Azərbaycan ədəbiyyatı məsələləri. Bakı, 1964, s. 218-239.

[57] Muradova M. Sadıq bəy Sadiqinin həyat və yaradıcılığı. Bakı, 1999, 139 s.

M.Muradova "Məcməül-xəvas"ı tədqiq edərkən Sadiqi Əfşarın ***"Külliyyat"***ının Təbriz nüsxəsinin fotosurətindən istifadə etmişdir. Kitabda təzkirənin strukturu, yazılma səbəbləri, özünəməxsus cəhətləri araşdırılmışdır. Alim bu monoqrafiyada Azərbaycan elmi ictimaiyyətinə Sadiqi "Külliyyat"ında yer almış Azərbaycan və Osmanlı şairlərindən bəhs edən ***anonim təzkirə*** haqqında məlumat vermişdir. M.Muradova külliyyata daxil olan bu təzkirənin 140-a yaxın türk şairi haqqında bilgi verdiyini, XVI əsr türk ədəbiyyatı və mədəniyyətinin öyrənilməsi üçün əhəmiyyətli olduğunu vurğulamış, ***"türkoloqların bu qiymətli əsərdən istifadə etmədiklərini"*** qeyd etmiş və orada əksini tapmış bəzi şairlərin adlarını sadalamışdır[58].

Prof. ***Nüşabə Araslı*** Sadiqi təzkirəsinə həsr olunmuş məqaləsində təzkirəçinin həyat və yaradıcılığını dəyərləndirmiş, təzkirənin tədqiq tarixinə nəzər salmış və əsərin türk şairlərindən bəhs edən hissəsini təhlil etmişdir[59].

Tacik alimi ***Rəna Kabulova*** da Sadiqi təzkirəsini namizədlik dissertasiyası səviyyəsində tədqiqata cəlb etmişdir[60]. Araşdırmada Nəvai təzkirəsinin "Məcməül-xəvas"a təsiri, oxşar və fərqli cəhətləri təhlil olunmuşdur.

Türk alimi ***Ahmet Kartal*** Sadıq bəyin təzkirəsindəki anadolulu şairlər (Sultan Süleyman, Necati, Baqi, Məhəmməd bəy) haqqında məlumatı əks etdirən məqalə dərc etdirmişdir[61].

***Lütfəli bəy Azərin*** həyatı, bədii yaradıcılığı, təzkirəsi f.ü.f.d. ***Mehri Məmmədova*** tərəfindən tədqiqata cəlb olunmuşdur. Alimin

---

[58] Yenə orada, s.51.

[59] Araslı N. Sadık bey Avşarın Mecmaul-havas tezkiresi orta asırlar Azerbaycan-Türk şairleri hakkında // Klasik Türk Edebiyatında Biyografi. Bildiriler. Ankara: 2010, s. 57-68.

[60] Кабулова Р. Традиции «Маджалис ун–нафаис» Алишера Навои в тюркоязычной литературе (на материале антологии Садикбека Садики «Маджма ул-хавас»), Автореф. диссерт. на соиск. кандидата филол. наук, Ташкент, 1979, 24 с.

[61] Kartal A. Sadıki-i Kitabdarın Mecmaul-Havas isimli tezkiresi ve onda yer alan Anadolulu şairler // Türk Kültürü, 1999 Aralık, № 440, s. 746-754.

"Lütfəli bəy Azər və Azərbaycan ədəbiyyatı" adlı monoqrafiyasında təzkirəçinin şeirləri, onların real həyatla bağlılığı, "Yusif və Züleyxa", "Məsnəviyi-Azər" kimi poemaları öyrənilmişdir.

Kitabda ***"Atəşkədə"***nin yazılma tarixi, əsərin yazılma məqsədi, ədibin özündən öncə yazılmış təzkirələrə münasibəti tədqiq olunmuş və "Atəşkədə"dən sonra yazılmış təzkirələrə təsiri aydınlaşdırılmışdır. Təzkirədə haqqında bilgi verilmiş 842 şairdən neçəsinin azərbaycanlı olduğu müəyyən olunmuş və Azərbaycan şairlərindən bəhs edən hissə tərcümə edilmişdir. Monoqrafiyada Azərin bəzi fikirlərinə tənqidi yanaşılmış, onun bəzi şairlərə yanlış münasibəti, bəzi məlumatların dəqiq və elmi olmaması kimi məsələlərə də işıq salınmış, Lütfəli bəyin əsərlərinin əlyazma və çap nüsxələri haqqında bilgi verilmişdir[62].

XVIII və XIX əsrdə qələmə alınmış bir çox təzkirələr vardır ki, onlar hələ də öz tədqiqatçısını gözləyir. Məsələn, İshaq bəy Üzri, Fazil xan Gorusi, Əbdürrəzzaq Dünbili, Bəhmən mirzə, Hülaku mirzə Qacar, Xudaverdi xan Qacar və başqalarının təzkirələri bu qəbildəndir.

Şərqşünas alim ***N.Qarayevin*** Mirzə İsa Xəyali Ziyainin ***"Təzkireyi-Ziyayi"***yə həsr olunmuş tədqiqatları da maraqlıdır. O, ilk dəfə olaraq Ziyainin həyat və yaradıcılığını əlyazmalar əsasında tədqiqata cəlb etmişdir[63]. Müəllifin digər bir məqaləsində isə "Təzkireyi-Ziyai" və "Təzkireyi-Nəvvab" müqayisə olunmuşdur[64].

F.ü.f.d. ***Aytən Hacıyeva*** Nəvvabın ədəbi-bədii irsini öyrənmişdir. Tədqiqat işində ilk öncə Nəvvab yaradıcılığının araşdırılma tarixi, sənətkarın dövrü və həyatı tədqiqat obyektinə çevrilmiş, daha sonra Nəvvabın ədəbiyyatşünaslıq sahəsindəki fəaliyyəti işıqlandırılmış, Nəvvab yaradıcılığında maarifçilik ideyalarına nəzər

---

[62] Məmmədova M. Lütfəli bəy Azər və Azərbaycan ədəbiyyatı. Bakı, 2001, 139 s.

[63] Qarayev N. XIX əsr Azərbaycan ədəbi məclisləri. Namizədlik dissertasiyası. AMEA, Ədəbiyyat İnstitutu. Bakı: 1971, 301 s. Bax: Qarayev N. XIX əsr Azərbaycan ədəbi məclisləri. Bakı: 2010, s. 87-101.

[64] Qarayev N. "Təzkireyi-Ziyai" və "Təzkireyi-Nəvvab" haqqında bəzi qeydlər // Əlyazmalar xəzinəsində, 1976, s. 78-87.

salınmış və şairin lirikası tədqiq olunmuşdur. "Təzkireyi-Nəvvab"ın Azərbaycan ədəbiyyatşünaslığındakı mövqeyi araşdırılarkən XIX əsrdə qələmə alınmış digər Azərbaycan təzkirələri ilə müqayisələr aparılmışdır[65].

Ömər Bayramın nəşr etdirdiyi bir məqalədə "Təzkireyi-Nəvvab"dakı şair və əsərlə bağlı dəyərləndirmələr dəqiqliklə tədqiq olunmuşdur[66].

***Məhəmməd ağa Müctəhidzadənin*** həyatı, yaradıcılığı və təzkirəsi isə ***Aljira Topalova*** tərəfindən öyrənilmişdir[67]. Kitabda öncə Yaxın Şərqdə və Azərbaycanda təzkirəçilik ənənəsindən bəhs olunmuşdur. Burada daha çox Anadolu sahəsi təzkirələri işıqlandırılmışdır. Azərbaycan təzkirələrindən isə yalnız azərbaycanca yazılmış əsərlər üzərində durulmuşdur.

İkinci fəsildə isə təzkirəçinin həyat yoluna işıq salınmış və ***"Riyazül-aşiqin"*** təzkirəsi təhlil olunmuşdur. Təzkirəni XX əsr Azərbaycan təzkirəçiliyinin uğurlu və qiymətli bir nümunəsi hesab edən tədqiqatçı bu əsərin transkripsiya edilib çap edilməsi zərurətindən bəhs edir. Çox güman ki, tədqiqatçı təzkirənin transliterasiya edilərək 1995-ci ildə nəşr olunduğunu bilməmişdir.

A.Topalova təzkirənin Müctəhidzadənin özü tərəfindən h.1330/1912-ci ildə nəşr olunduğunu qeyd edir. Ancaq təzkirənin h.1328/1910-cu ildə çap edildiyi məlumdur[68]. Onu da qeyd etmək lazımdır ki, A.Topalovanın bu kitabının ciddi redaktəyə ehtiyacı var. Monoqrafiya boyu çoxlu yanlışlara, təhriflərə, tarixi səhvlərə, orfoqrafik xətalara və s. yol verilmişdir. Kitabın normal biblioqrafiyasının olmaması da təəccüb doğurur.

***Məhəmmədəli Tərbiyətin*** "Danişməndani-Azərbaycan" təzkirəsini dissertasiya şəklində tədqiqata cəlb edən f.ü.f.d. ***Könül***

---

[65] Hacıyeva A. Mir Möhsün Nəvvabın ədəbi-bədii irsi. – Bakı: 2004.

[66] Bayram Ö. Nevvab tezkiresinde şair ve eser üzürine değerlendirmeler // Turkish Studies - International Periodical For The Languages, Literature and History of Turkish or Turkic. Volume 7/1 Winter 2012, p.385-404.

[67] Topalova A. Ədəbiyyat tarixinin öyrənilməsində təzkirələrin rolu və Ağa Məhəmməd Müctəhidzadənin "Riyazül-aşiqin" təzkirəsi. – Bakı: Elm, 2001, 97 s.

[68] Bax: Əski çap kitabları kataloqu. I cild. Türkdilli kitablar. Bakı, 2008, s. 235.

***Məmmədova*** ilk fəsildə Azərbaycan təzkirəçilik ənənəsindən bəhs edərək Sam mirzə, Əhdi, Sadiqi, Lütfəli bəy Azər, Bəhmən mirzə, Seyid Əzim Şirvani, Nəvvab və Müctəhidzadənin əsərləri haqqında məlumat vermişdir. Müvafiq fəsil və bölmələrdə isə "Danişməndani-Azərbaycan"ın quruluşu və təsnifatı, təzkirənin Azərbaycan dilinə tərcüməsinin orijinalla müqayisəsi və təzkirədə ədəbiyyat məsələləri kimi problemlər öyrənilmişdir.

Əziz Dövlətabadinin "Süxənvərani-Azərbaycan"ı AMEA Əlyazmalar İnstitutunun əməkdaşı J.Şükürova tərəfindən araşdırılmaqdadır. Tədqiqatçının bu mövzuda bir çox məqaləsi elmi jurnallarda işıq üzü görmüşdür[69].

Əli Nəzminin "Devist süxənvər" təzkirəsi haqqında Azərbaycan ədəbiyyatşünaslığına ilk məlumatı L.Əlizadə təqdim etmişdir[70].

Azərbaycan təzkirələrinin tədqiq tarixinə nəzər saldıqda görürük ki, ilk dəfə Azərbaycan təzkirələrini sistemə salaraq əsrlər üzrə təqdim edən mərhum biblioqraf alim dosent ***Əşrəf Xələfov*** olmuşdur. Onun dərc etdirdiyi dörd silsilə məqalədə Azərbaycan təzkirələrinin hamısı əhatə olunmasa da, ilkin tədqiqat kimi çox dəyərlidir[71].

---

[69] İsmayılova J. Süxənvərani-Azərbaycan əsərində qadın şairələrimiz // "Elm" qəzeti. - 2004. - 18 mart; İsmayılova J. Dövlətabadinin "Süxənvərani-Azərbaycan" təzkirəsində bir xəta haqqında // "Elm" qəzeti. 2005. - 7 noyabr; İsmayılova J. "Süxənvərani-Azərbaycan" təzkirəsinin tərtib prinsipləri // Tədqiqlər 2004, N 4, s. 251-254; Şükürova J. Qafqazda yaşayan farsdilli şairlər // Filologiya məsələləri. 2010, N 11, s. 356-365; Şükürova J. Dövlətabadi və Dihim təzkirələrinin müqayisəli təhlili // Yaxın və orta Şərq: dünəni, bu günü, sabahı. Elmi araşdırmalar elmi-nəzəri məqalələr toplusunun xüsusi buraxılışı, 2011, s. 438-440.

[70] Əlizadə L. Klassik Azərbaycan şairləri yeni təzkirə səhifələrində // Azərbaycan SSR EA, Ədəbiyyat, dil və incəsənət seriyası, 1986, N 3, s. 155-156.

[71] Xələfov Ə. Orta əsrlər Azərbaycan ədəbi biblioqrafiyasına dair // Kitabxanaçılıq və biblioqrafiya. 1997. №1. s. 82-93; Xələfov Ə. XVII-XVIII əsrlərdə Azərbaycan ədəbi biblioqrafik qaynaqları haqqında // Kitabxanaçılıq və biblioqrafiya. 1998. № 1. s. 25-32; Xələfov Ə. XIX əsr Azərbaycan maarifpərvər şair və alimlərinin biblioqrafik fəaliyyəti haqqında // Kitabxanaçılıq və biblioqrafiya,

Bu sətirlərin müəllifi tərəfindən XV-XVII əsrlər türk təzkirələrinin strukturu və spesifik cəhətləri araşdırılmışdır. Burada XVI-XVII əsrlər Azərbaycan təzkirələrinin özünəməxsusluqları, digər təzkirələrdən fərqləri və b. məsələlər tədqiqat obyektinə çevrilmişdir.

***"Türk təzkirəçiliyi: biblioqrafiya"*** adlı kitabımızda da Azərbaycan təzkirəçiliyi haqqında bilgi verilmiş, azərbaycanlı müəlliflərin təzkirələrinin dünyanın müxtəlif əlyazma xəzinələrinə səpələnmiş əlyazma nüsxələrinin elmi-paleoqrafik xüsusiyyətləri, təzkirələrə həsr olunmuş kitab, məqalə və dissertasiyaların biblioqrafik təsviri əhatə edilmişdir.

İran alimi ***Əhməd Gülçin Məani*** "Farsca təzkirələrin tarixi" adlı iki cildlik iri həcmli əsərində farsca yazılmış təzkirələri araşdırmışdır. Kitabda azərbaycanlı müəlliflərin fars dilində qələmə alınmış təzkirələrindən də bəhs edilmişdir. Lakin əsərdə fars dilində qələmə alınmış "Təzkireyi-mədayihi-Elxaniyyə" və "Təzkireyi-Nəvvab" haqqında məlumata rast gəlmirik.

Apardığımız araşdırmaların nəticəsi olaraq deyə bilərik ki, Azərbaycan təzkirəçiliyinin nəzəri baxımdan, eləcə də sistemli şəkildə tədqiqinə ciddi ehtiyac vardır. Belə ki, XVI əsrdən başlayaraq XX əsrə qədər azərbaycanlı müəlliflər tərəfindən 46 təzkirə qələmə alınmışdırsa da, indiyə kimi onlardan sadəcə 6-sı ölkəmizdə Azərbaycan dilində nəşr olunmuşdur. Qeyd olunan bütün Azərbaycan təzkirələrinin tərcüməsi, elmi-tənqidi və ya faksimile mətnlərinin hazırlanması təzkirəşünaslarımız qarşısında duran mühüm vəzifələrdəndir. Bunlardan əlavə, hər bir Azərbaycan təzkirəsinin monoqrafik səviyyədə araşdırılması Azərbaycan ədəbiyyatının müxtəlif mərhələlərini, ümumiyyətlə mədəniyyət tariximizi tədqiq etmək üçün əhəmiyyətlidir.

---

1998, № 2, s. 70-80; Xələfov Ə. XX əsr təzkirəçiləri haqqında // Kitabxanaçılıq və biblioqrfiya. 1999. № 2, s. 106-117; Xələfov Ə. Təzkirəçilərin bugünkü sələfləri // Kitabxanaçılıq və biblioqrafiya. 2000. № 1. s. 92-99.

# II FƏSİL

# AZƏRBAYCAN TƏZKİRƏLƏRİNİN TƏSNİFATI

2.1.Təzkirələrin nəzm və nəsr hissələrinin dili

2.2.Təzkirələrin strukturu

2.3.Təzkirələrin əhatə etdiyi coğrafiya və zaman

2.4.Təzkirələrin yazıldığı zaman və məkan

2.5.Tarixi əsərlərin təzkirə hissəsi

2.6.Təzkirə xarakterli əsərlər

## 2.1. TƏZKİRƏLƏRİN NƏZM VƏ NƏSR HİSSƏLƏRİNİN DİLİ

Azərbaycanlı müəlliflərin təzkirələrini qələmə alındığı dil, struktur, əhatə etdiyi dövr, yazıldığı zaman və coğrafiya üzrə təsnifləndirmək mümkündür.

Azərbaycanlı müəlliflərin tərtib etdikləri təzkirələri nəzm və nəsr hissələrinin dilinə görə aşağıdakı şəkildə qruplaşdırmaq mümkündür:

1. *təhkiyə hissəsi türkcə yazılan və yalnız türkcə şeirlərdən nümunələri əhatə edən təzkirələr*. Bu qrupa Yəhya Şeydanın "Ədəbiyyat ocağı" və Şahin Fazilin "Təzkireyi-Şahin"ini aid etmək olar.
2. *təhkiyə hissəsi türkcə olan, həm türkcə, həm də farsca şeirlərdən örnəklərin verildiyi təzkirələr*. Əhdi Bağdadinin, Sadiq bəy Əfşarın, Seyid Əzim Şirvaninin, Məhəmməd ağa Müctəhidzadənin, Qulam Məmmədlinin təzkirələri bu xarakterdədir.
3. *həm təhkiyə hissəsinin, həm də poeziya nümunələrinin iki dildə (türkcə və farsca) yazıldığı təzkirələr*. Məhəmməd Dəyhimin təzkirəsi bu şəkildə tərtiblənmişdir.
4. *təhkiyə hissəsi fars dilində qələmə alınan, həm fars, həm də türkcə nümunələrin təqdim olunduğu təzkirələr*. Sam mirzə Səfəvinin, Əliqulu xan Valehin, Hülaku mirzə Qacarın, Məhəmməd Həsən xan Etimadüssəltənənin, Məhəmməd Kazım Əsrar Əlişah Təbrizinin, Mir Möhsün Nəvvabın, Ziyainin, Məhəmmədəli Tərbiyətin təzkirələri bu şəkildə tərtiblənmişdir.
5. *həm təhkiyə, həm də şeir nümunələri farsca olan təzkirələr*. Nazim Təbrizi, Bəhmən mirzə, Lütfəli bəy Azər, Məhəmməd Fazil xan Gorusi və başqaları öz əsərlərini bütünlükdə fars dilində qələmə almışlar.

## 2.2. TƏZKİRƏLƏRİN STRUKTURU

Azərbaycan təzkirələrini digər türk xalqlarının təzkirələri ilə müqayisə etdikdə məlum oldu ki, azərbaycanlı müəlliflər Herat təzkirəçilik məktəbini əsas götürsələr də, struktur baxımından daha orijinal, rəngarəng əsərlər ortaya qoymuşlar.

Azərbaycan müəllifləri təzkirələrdə haqlarında məlumat verdikləri şairləri ***təbəqə, əlifba, coğrafi, xronoloji*** prinsiplərə görə təqdim etmişlər. Orijinal tərtib prinsiplərindən istifadə etmiş təzkirəçilərimiz əsərlərində təqdim olunan ədəbi nümunələrin janrlarına görə təzkirələrini qələmə almışlar. Sistemsiz qələmə alınmış təzkirələrimizə də rast gəlmək mümkündür.

Azərbaycan təzkirələrini tərtib prinsiplərinə görə təsnifləşdirərək təqdim edirik.




### *Təbəqə üsulu ilə yazılmış təzkirələr*

Azərbaycan təzkirələrindən bəziləri Herat təzkirələri kimi təbəqə prinsipi əsasında tərtiblənmişdir.

XVI əsr təzkirəçilərindən Sam mirzə Səfəvi təzkirəsi müqəddimə, ***səhifə*** adı verilən yeddi fəsil və xatiməyə ayırmışdır. Əhdi Bağdadi isə Osmanlı təzkirəçilərindən təsirlənərək əsərini müqəddimə, ***üç rövzə*** və bir xatimə şəklində tərtibləmişdir. Təzkirənin tam nüsxəsi isə dörd rövzədir.

XVII əsrdə Saqidinin qələmə aldığı "Məcməül-xəvas" Herat təzkirələri kimi təbəqə prinsipi ilə tərtiblənmişdir, ön söz, səkkiz ***məcmə*** və xatimədən ibarətdir.

XIX əsr Azərbaycan təzkirəçisi Məhəmməd Fazil xan Gorusinin "Əncüməni-xaqan" adlı təzkirəsi bir müqəddimə, ***dörd əncümən*** və bir xatimədən ibarətdir.

I əncümən "Ulu Qacar elinin əsil-nəsəbinin icmalı, fələk kimi iqtidarlı olan hökmdarın vaqiəsinin, onun mübarək cülusunun, məmləkətləri idarə etməsinin zikri və sahibqiranın uğurlu əsərlərindən və seçkin şeirlərindən örnəklər", II əncümən "Şahzadələrin əhvalı, əfkarı və Qacar sülaləsinin böyüklərindən bəzilərinin haqqında", III əncümən "Şahənşahlıq dərgahında şərəf tapanların həsəbi və nəsəbi haqqında", IV əncümən "Əyalət şairləri haqqında"dır.

Bəhmən mirzə təzkirəsini ***üç riştəyə*** ayırmışdır. Əsər təbəqə prinsipi ilə hazırlanmışdır. Birinci riştədə qədim dövr şairlərindən, ikinci riştədə Fətəli şah, şahzadə və adlı-sanlı əmirlərdən, üçüncü riştədə əlifba sırası ilə təzkirəçinin 56 nəfər müasirindən bəhs olunmuşdur.

Əbdürrəzzaq bəy Dünbüli Azərbaycaninin "Nigaristani-Dara"sı ***dörd nigarxanadan*** ibarətdir. I nigarxana zəmanə xaqanı Fətəli şah Qacara, II nigarxana Qacar şahzadələrinə və böyük əmirlərə, III nigarxana şaha və şahzadələrə yaxın olan şairlərə, IV nigarxana isə müxtəlif vilayətlərin şairlərinə həsr olunmuşdur.

Mahmud mirzə Qacar ***qadınlara*** həsr olunmuş ***"Nüqli-məclis"*** təzkirəsinin müəllifidir. Əsərin strukturu aşağıdakı kimidir:

I fəsil - Fətəli şahın şair qızları;

II fəsil - şairlik edən digər saray qadınları;

III fəsil - İranın başqa bölgələrinin şairələri;

IV fəsil - isə keçmiş zaman şairələri.

### *Əlifba prinsipi əsasında tərtiblənmiş təzkirələr*

Bəzi Azərbaycan təzkirəçiləri əsərlərini əlifba prinsipi əsasında tərtibləmişlər. XVIII əsr təzkirəçisi Əliquluxan Valehin "Riyazüş-şüəra"sında 2540 şair haqqında məlumat ***təxəllüslərinə*** görə ***əlifba sırası*** ilə verilmişdir.

Məhəmməd Kazım Əsrar Əlişah Təbrizi "Behcətüş-şüəra" adlı təzkirəsində ***əlifba sırası*** ilə 86 azərbaycanlı şairdən bəhs edir. Nəsri farsca olmasına baxmayaraq, poeziya nümunələrinin çox hissəsi türkcə, yalnız cüzi bir qismi farscadır. Bu da təzkirəni digərlərindən fərqləndirən spesifik cəhətdir.

Əli Rza mirzə Qacarın "Bosatinül-xaqaniyyə" təzkirəsi ***əlifba prinsipi*** əsasında hazırlanmışdır. Beş "bostan"dan ibarət olan təzkirənin hər "bostan"ı əslində müstəqil bir təzkirədir. Hər cildin əvvəlində müqəddimə və məqsədin bəyanı, daha sonra isə şairlərin tərcümeyi-halları, əlifba sırası ilə şairlərin fihristi, axırda isə onların hər birinin şeirlərindən nümunələr təqdim olunmuşdur.

Əbülqasım Möhtəşəm Şirvani "Əxtəri-taban" təzkirəsində əlifba sırası ilə 82 qadın şairə haqqında məlumat verilmişdir.

Məhəmmədəli Tərbiyət də təzkirəsini şair təxəlüslərinin ***əlifba*** ardıcıllığı ilə tərtib etmişdir. Qulam Məmmədli də əlifba prinsipini əsas götürsə də, bəzən bu prinsipə əməl olunmamışdır. Qeyd olunan bu iki əsərə müəllifləri ön söz yazmamışlar.

### *Coğrafi prinsipə görə yazılmış təzkirələr*

Azərbaycan təzkirələrindən bir neçəsi coğrafi prinsip əsasında qələmə alınmışdır.

Lütfəli bəy Azərin təzkirəsinin strukturu mürəkkəbliyi ilə fərqlənir. Azər şairləri mənsub olduqları ***bölgəyə*** və ***şəhərə*** görə sıralayaraq ***iki məcmərə*** ayırmışdır.

Birinci məcmərə özü də üç fəsildən ibarətdir: ***şölə, əxgər və füruğ***. Şölədə İslam dünyasında olan hökmdar, şahzadə, əmir şairlərdən; əxgərdə İran, Turan və Hindistan şairlərindən; füruğda qadın şairlərdən bəhs olunmuşdur.

İkinci məcmərə müəllifin müasiri olan şairlərə həsr olunmuşdur və ***iki pərtövə*** bölünmüşdür.

Seyid Əzim Şirvaninin "Təzkirə"si dibaçə, təvəqqeyi-müəllif, müqəddimə və ***dörd fəsildən*** ibarətdir. Təzkirəçi əsərinin strukturunu belə açıqlayır: "bu məcmuə dörd fəsil üzrə, hər fəsil üç bürc otuz dərəcə üzrə bəyan olunmuşdur".

Fəsli-əvvəl: Şüərayi- Qafqaz bəyanındadır.
Fəsli-dovvom: Şüərayi- Azərbaycan bəyanındadır.
Fəsli-səyyum: Şüərayi- Rum bəyanındadır.
Fəsli-çəharüm: Şüərayi-Türküstan bəyanındadır.

Ziyai təzkirəsini ***iki hissədə*** tərtib etmişdir. Birinci hissə "Atəşkədə" təzkirəsini, ikinci hissə isə şairin müasirlərini əhatə edir.

XX əsr təzkirəçisi Məhəmməd Dəyhimin əsəri coğrafi prinsip əsasında hazırlanmış, hər bir bölgə daxilində öncə vəfat etmiş şairlər, daha sonra həyatda olan şairlər haqqında məlumat əlifba sırasına əsasən düzülmüşdür.

Əziz Dövlətabadinin "Süxənvərani-Azərbaycan"ı da eyni prinsiplə hazırlanmışdır.

## *Xronoloji prinsip əsasında tərtiblənmiş əsərlər*

XVII əsr təzkirəçisi Nazimin Təbrizinin "Nəzmi-güzidə"si iki ***babdan*** ibarətdir. Hər bab iki fəslə ayrılmışdır. Birinci babın ilk fəsli "Qədim və orta dövr fəsahətlilərinin qəzəllərinin müntəxəbatı və onların gözəl mahiyyətə malik əhvalının bir qismi" adlanır. Sözügedən babın ikinci fəsli "Son dövr bəlağətlilərinin qəzəllərinin müntəxəbatı və onların gözəl mahiyyətə malik əhvalının bir qismi" adlanır. İkinci babın birinci fəsli "Qədim və orta dövr fəsahətlilərinin rübailərinin müntəxəbatı və onların gözəl mahiyyətə malik əhvalının bir qismi" məsələsinə həsr edilmişdir. İkinci babın ikinci fəsli isə "Son dövr bəlağətlilərinin rübailərinin müntəxəbatı və on-

ların gözəl mahiyyətə malik əhvalının bir qismi" sərlövhəsi altında təqdim olunmuşdur.

Hülaku Mirzə Qacarın "Xərabat" adlı təzkirəsində də xronoloji prinsip əsas alınmış, xronologiya daxilində də şairlər əlifba ardıcıllığı ilə təqdim olunmuşdur.

XX əsr təzkirəçisi Şəmsəddin xan Həqqi Təbrizinin "Əncümənül-üdəba" adlı əsəri ***3 qismət*** və ***9 cilddən*** ibarətdir. Hər cildin əvvəlində ərəb əlifbası sırası ilə şairlərin siyahısı verilmiş, daha sonra onların tərcümeyi-halları, axırda isə şeirlərindən nümunələr əksini tapmışdır. Bu təzkirə xronoloji prinsip əsasında qurulmuş, xronologiya daxilində isə əlifba ardıcıllığı əsas götürülmüşdür.

Mir Möhsün Nəvvab əsərinin ön sözündə təzkirənin tərtib prinsipi haqqında yazır: "...təzkirəni üç hissəyə bölürəm. Birinci hissə həyatda olmayan şairlərin əhvalı və şeirləri. İkinci hissə həyatda olan şairlərin əhval və şeirləri. Üçüncü hissə kitabın xatiməsi, məzhəkəli şeir parçaları, satiralar və s. əvvəlki hissədə adı getməyən şairlər və Qafqaz şəhərlərinin şairləri"[72].

XX əsr təzkirəçisi Məhəmməd ağa Müctəhidzadə əsərinin strukturu haqqında ön sözdə bilgi verir: "...Qarabağın şüəralarının əhvalına filhəzə Riyazül-aşiqinə mövsum və iki rövzəyə bir bağçaya məqsum olundu". Daha sonra hər bir rövzədə hansı şairlərdən bəhs edəcəyini qeyd edir: "Əvvəlinci rövzədə bəyan olunur mütəqəddiminin keyfiyyati-halatı və müntəxəbati-əbyatı. Və ikinci rövzədə zikr edilir mütəəxxerin və müasirinin əhval və ətvarı və müntəxəbati-əşarı.Və bağçada fəqət dərc olunur müəllifin əhvalı və natayici-xəyalı"[73]. Lakin onun bu yaradıcılıq planı yarımçıq qalmış, əsərin yalnız birinci rövzəsi işıq üzü görmüşdür.

### *Ədəbi nümunələrin janrına görə tərtib olunmuş təzkirələr*

Lütfəli bəyin qardaşı olan İshaq bəy Üzri Bəydilinin antologiya xarakteri daşıyan (?-h.1185/1771) "Təzkireyi-İshaq"ı ***dörd fə-***

---

[72] Mir Möhsün Nəvvab. Təzkireyi-Nəvvab. Bakı: 1995, s. 10.
[73] Müctəhidzadə Məhəmmədağa. Riyazül-aşiqin. Bakı: Azərbaycan, 1995, s. 8.

***sildən*** ibarət olub, ədəbi nümunələrin janrına görə tərtiblənmişdir. Təzkirənin I fəsili qəsidələri, II fəsil qitələri, III fəsil qəzəlləri, IV fəsil isə rübailəri əhatə edir.

Heydərqulu mirzənin "Təzkireyi-Xavər" əsəri təzkirə adını daşısa da, əslində köhnə və yeni şairlərin şeirlərindən ibarət müntəxəbatıdır. Üç ***"bəxş"***dən ibarət olan bu əsərin I hissəsində qəsidələr, II hissəsində qəzəllər, III hissəsində rübailər təqdim olunmuşdur. Buradakı şeirlər qafiyə və rədifə görə əlifba ardıcıllığı ilə sıralanmışlar.

### *Sistemsiz tərtib olunmuş təzkirələr*

Xudaverdi ibn Məhəmməd İbrahim xan Qacarın "Təzkireyi-mədayihi-Elxaniyyə" adlı təzkirəsi Qacarlar dövrünün ortalarında yaşayıb-yaratmış 37 şairin qısa şərhi-hallarını, əsərlərindən və şeirlərindən nümunələri əhatə edir. Əsərdə müxtəlif şairlərin təzkirəçinin oğlu olan və Kamal təxəllüsü ilə şeirlər yazan Allahqulu mirzə Elxaninin mədhində dedikləri şeirləri toplanmışdır.

## 2.3. TƏZKİRƏLƏRİN ƏHATƏ ETDİYİ COĞRAFİYA VƏ ZAMAN

Azərbaycan təzkirələrini əhatə etdiyi coğrafiyaya görə üç hissəyə ayırmaq mümkündür:

- ümumşərq
- ümumazərbaycan
- məhəlli

### *Ümumşərq coğrafiyasının şairlərini əhatə edən təzkirələr*

Bəzi Azərbaycan təzkirəçiləri ümumşərq coğrafiyasında yaşayıb-yaratmış şairləri əsərlərinə daxil etmişlər. Məsələn, Sam mirzə təzkirəsi XV əsrin ikinci yarısı və XVI əsrin birinci yarısında

yaşayan 713 nəfər ***Azərbaycan, Osmanlı, İran, Orta Asiya*** şairləri haqqında məlumatı əhatə edir.

Əhdi Bağdadi öz əsərində XVI əsrin 381 nəfər ***Osmanlı*** və ***Azərbaycan*** şairi haqqında məlumat vermişdir.

Sadiqi "Məcməül-xəvas" təzkirəsində XVI əsrdə və XVII əsrin başlanğıcında yaşayıb-yaratmış ***fars*** və ***türk*** əsilli şairlərdən bəhs etmişdir.

Nazim Təbrizi təzkirəsində (1036/1626) qədim və orta dövr Şərq şairlərindən və öz müasirlərindən bəhs etmişdir.

Valeh Dağıstani Yaxın və Orta Şərqin bir çox tanınmış şairlərini əsərinə daxil etmişdir.

Lütfəli bəyin "Atəşkədə" təzkirəsi ***İran, Orta Asiya, Azərbaycan*** və ***Hindistanda*** yaşayan 842 şair haqqında məlumatı əhatə edir.

Əbülqasım Möhtəşəm Şirvani "Əxtəri-taban" təzkirəsində XIX əsr ***Şərq ölkələrinin*** şairələrindən bəhs olunmuşdur.

Şəmsəddin xan Həqqi Təbrizi "Əncümənül-üdəba"sında farsdilli poeziyanın başlanğıcından öz dövrünə qədər farsca yazıb-yaratmış şairdən bəhs etmişdir.

Məhəmməd Fazil xan Gorusi "Əncüməni-xaqan" adlı təzkirəsini h. 1234/1818-19-cu ildə fars dilində qələmə almışdır. Əsərdə müəllifin öz ***müasirlərindən*** bəhs olunmuşdur.

Bəhmən mirzənin "Təzkireyi-Məhəmmədşahi" adlı əsərinin birinci fəslində ***XVIII əsrin sonlarına*** qədər yaşamış şairlər haqqında məlumat  verilmişdir. İkinci və üçüncü fəsillərdə təzkirəçinin ***müasirləri*** xatırlanmışdır.

Seyid Əzim Şirvani əsərində XII əsrdən XX əsrin əvvəllərinə qədər yaşayıb-yaratmış Azərbaycan Qafqaz, İran, Türküstan və Rum şairləri haqqında məlumat vermişdir.

"Təzkireyi-mədayihi-Elxaniyyə" Qacarlar dövrünün ortalarında yaşayıb-yaratmış 37 şair haqqında məlumatı əhatə etməkdədir.

Məhəmmədqulu Mirzə Qacarın ”Təzkireyi-Xosrovi” adlı təzkirəsində həm ***qədim***, həm də ***yeni dövr***ün şairləri haqqında məlumat öz əksini tapmışdır.

Ziyai təzkirəsinin birinci hissəsində “Atəşkədə”dəki məlumatlar qısaldılmış şəkildə təqdim olunmuş, ikinci hissədə isə ***XX əsrin ilk yarı***sına qədər Ərdəbil, Təbriz şairlərindən bəhs olunmuşdur.

### *Ümumazərbaycan təzkirələri*

Məhəmmədəli Tərbiyət təzkirəsində ***qədim zamanlardan XX əsrin əvvəlləri***nə qədərki zaman dilimində yaşamış azərbaycanlılar haqqında bilgi verilmişdir.

Qulam Məmmədli və Məhəmməd Dəyhim də təzkirələrində həm Cənubi Azərbaycan, həm də Şimali Azərbaycan şairləri haqqında məlumat vermişlər.

### *Məhəlli təzkirələr*

Bəzi Azərbaycan təzkirəçilərinin əsərləri məhəlli xarakter daşımışdır. Məsələn, Mir Möhsün Nəvvab və Məhəmməd ağa Müctəhidzadə təzkirələrində XIX əsr Qarabağ şairlərini xatırlamışlar.

Əziz Dövlətabadinin “Süxənvərani-Azərbaycan”ını da məhəlli təzkirə hesab etmək olar. Təzkirə bütövlükdə Cənubi Azərbaycan şairlərindən bəhs edir. Təzkirənin I cildi Ərdəbil, Arazbaran, Urmiya, Ərvənəq, Ənzab və Təbrizdən olan şairlər haqqında məlumatı əhatə etməkdədir. II cilddə isə Xalxal, Xoy, Sərab, Səlmas, Maku, Mərənd, Məhabad, Miyanə və Gərmrud şairlərinin haqqında məlumat verilmişdir.

### *Zümrə və ailə təzkirələri*

Azərbaycan təzkirələrindən ikisi sultan və şah ailələrinin mənsubu olan şairlərə həsr edilmişdir və digər təzkirələrdən əhatə

etdiyi şairlərin bir nəslin və ya zümrənin nümayəndələrini əhatə etmələrinə görə fərqlənirlər.

Belə ki, Seyfüddövlə Sultan Məhəmməd Tağının "Bəzmi-xaqan" ("Təzkirətüs-səlatin") adlı təzkirəsi bir ***bəzm*** və beş ***əncümən***dən ibrətdir.

I əncüməndə ilk olaraq Səfəvi nəslinin mənsublarından bəhs olunmuşdur. Daha sonra müxtəlif Gilan, Cığatay, Hind, Özbək, Osmanlı, Xarəzm, Səlcuq, Mazandaran və s. hökmdar şairlərindən bəhs edilmişdir.

II əncümən "Əsrin padşahının (Fətəli şahın – V.M.) şeirlərinin zikri və onun halının və ləyaqətlərinin şərhindən bir müxtəsər" sərlövhəsi ilə başlamaqdadır.

III əncümən "Şahzadələrin şeirləri və həyatları haqqında"dır. Burada Qacarlar xanədanından olan 23 şahzadə şairdən bəhs olunur.

Mahmud mirzə Qacarın "Gülşəni-Mahmud"u ailə təzkirəsi olduğuna görə fərqlənir. Təzkirədə öncə Xaqan təxəllüslü Fətəli şah, onun qızları və oğulları, daha sonra Fətəli xanın qardaşı Hüseynqulu xanın övladları haqqında məlumat verilmişdir.

Azərbaycan təzkirələrini bəhs etdikləri zamana görə iki qismə ayırmaq olar:

1. zaman məhdudiyyəti qoyulmayan təzkirələr;
2. müəyyən zaman dilimini əhatə edən təzkirələr.

### • *Zaman məhdudiyyəti qoyulmayan təzkirələr*

Nazim Təbrizi təzkirəsində qədim və orta əsrlərdə yazıb yaratmış Şərq şairlərindən və müasirlərindən, Əliqulu xan Valeh "Riyazüş-şüəra"sında 2540 qədim, orta əsr və müəllifin müasirləri olan şairlərdən bəhs etmişlər. Lütfəli bəy Azər də "Atəşkədə"də zaman həddi qoymamışdır. Seyfüddövlə Sultan Məhəmməd Tağı "Təzkirətüs-səlatin"ində zaman məhdudiyyəti qoyulmamışdır. Heydərqulu mirzə Qacarın "Təzkireyi-Xavər"i qədim və yeni şairlərin şeirlərindən ibarət müntəxəbatdır.

Seyid Əzim Şirvani "Təzkirə"sində daxil etdiyi şairləri seçərkən zaman məhdudiyyəti qoymamışdır.

İki hissədən ibarət olan "Təzkireyi-Ziyai"nin birinci hissəsində "Atəşkədə"də bəhs olunan şairlər, ikinci hissəsində isə müəllifin müasirləri haqqında məlumat verilir və böyük bir zaman dilimini əhatə edir.

Şəmsəddin xan Həqqi Təbrizinin ***"Əncümənül-üdəba"sı*** farsdilli poeziyanın başlanğıcından müəllifin zamanına kimi yaşayıb-yaratmış şairləri əhatə etməkdədir.

Bəhmən mirzənin "Təzkireyi-Məhəmmədşahi"sinin birinci fəslində h. XIII əsrə qədər yaşayıb yaratmış şairlər haqqında bio-biblioqrafik məlumat verilmişdir. Digər iki fəsildə isə təzkirəçinin müasiri olan şahzadə və şairlər xatırlanmış və əsərlərindən örnəklər yer almışdır.

M.Tərbiyətin "Danişməndani-Azərbaycan" təzkirəsində qədim zamanlardan başlayaraq XX əsrin əvvəllərinə qədər yaşayıb yaratmış şairlərdən bəhs olunur.

- ***Müəyyən zaman dilimini əhatə edən təzkirələr***

"Töhfeyi-Sami" XV əsrin birinci yarısı - XVI əsrin birinci yarısında yetişmiş Azərbaycan və digər Şərq xalqlarının nümayəndələri haqqında məlumatı və əsərlərindən örnəkləri əhatə edir.

Əhdi Bağdadi təzkirəsi XV-XVI əsr Azərbaycan və Osmanlı şairlərini əhatə etməkdədir.

"Məcməül-xəvas" XVI əsr-XVII əsrin əvvəllərində yaşayıb-yaratmış fars və türk əsilli şairlərdən bəhs edir.

Fazil xan Gorusi "Əncüməni-xaqan" adlı təzkirəsində (1818-19) öz müasirlərindən bəhs etmişdir.

Əbdürrəzzaq bəy Dünbüli Azərbaycaninin (h. 1241) "Nigaristani-Dara" adlı təzkirəsi müəllifin müasiri olmuş şairlərdən bəhs edir.

“Təzkireyi-mədayihi-Elxaniyyə” Qacarlar dövrünün ortalarında yaşayıb-yaratmış 37 şairin qısa şərhi-hallarını, əsərlərindən və şeirlərindən nümunələri əhatə edir.

Məhəmməd Saleh Şamlu “Məhəküş-şüəra” adlı əsərini öz müasiri olan istedadlı şairlərin həyat və yaradıcılıqlarının səbatsız zəmanənin keşməkeşi içində itib-batmaması və unudulmaması üçün bu təzkirəni tərtib etmişdir.

Mahmud mirzə Qacar 1820-ci ildə Qacarlar xanədanının şairlərinə həsr edilmiş “Gülşəni-Mahmud” adlı ailə təzkirəsini qələmə almışdır. “Bəyanül-Mahmud” adlı digər bir təzkirəsində isə müasiri olan şairlər haqqında məlumat vermişdir.

Seyyid Əbdülhəmid Xalxalinin 1954-1958-ci illərdə nəşr etdirdiyi iki cildlik “Təzkireyi-şüərayi-müasiri-İran” adlı əsərini adından da məlum olduğu kimi təzkirəçinin müasiri olan şairləri əhatə etməkdədir.

Şahin Fazilin təzkirəsi isə XIX əsrin 80-cı illərindən XXI əsrin əvvəllərinə kimi olan zaman dilimini əhatə edir və “Məcməüş-şüəra” ədəbi məclisinin şairlərinə həsr olunmuşdur.

## 2.4. TƏZKİRƏLƏRİN YAZILDIĞI ZAMAN VƏ MƏKAN

Hər bir təzkirədən geniş şəkildə ayrıca bəhs edəcəyimiz üçün Azərbaycan təzkirələrinin yazıldığı tarix və məkan haqqında məlumatın cədvəl vasitəsilə daha əyani şəkildə çatdırılacağı qənaətindəyik.

Təzkirələri nəzərdən keçirdikdə məlum olur ki, təzkirəçilər əsərləri üçün materialları uzun illər ərzində toplayırdılar. Təzkirələrin tamamlanma tarixi əsərin yazılma tarixi kimi qeyd olunur. Bəzi təzkirəçilər isə əsərlərini nə zaman yazmağa başladıqlarını və hansı tarixdə bitirdiklərini də qeyd edirdilər.

Azərbaycanlı müəlliflər XVI əsrdən etibarən təzkirə qələmə almağa başlamışlar. XVI əsrdə Sam mirzə, Əhdi Bağdadi, İbrahim mirzə və Tövfi Təbrizi təzkirə tərtibləmişdir. Sam mirzə “Töhfeyi-

Sami" adlı əsərini h.957/1550-968/1561-ci illərdə Ərdəbildə yazmışdır. Əhdi Bağdadi isə əsərini h.971-1563-cü ildə Kütahyada qələmə almışdır. Bağdada qayıdan müəllif burada əsərinə bir rövzə də əlavə etmişdir. Bu əsrdə təzkirə tərtibləmiş İbrahim mirzə və Tövfi Təbrizi haqqında mənbələrdə məlumat yer alsa da, təzkirələri dövrümüzə gəlib çatmamışdır.

XVII əsrdə azərbaycanlı müəlliflər Sadiq bəy Sadiqi və Nazim Təbrizi tərəfindən iki təzkirə tərtiblənmişdir.

Nazim Təbrizi 1626-cı ildə yazdığı təzkirəsi ilə XVII əsr Azərbaycan təzkirəçiliyini zənginləşdirmiş, Sadiq bəy Əfşardan sonra dəyərli bir əsər ortaya qoymuşdur. Təzkirə İsfahanda yazılmağa başlanmış və Məkkədə tamamlanmışdır. Təzkirə tərtib prinsipi, strukturu və təqdim olunan nümunələrin yalnız qəzəl və rübailəri əhatə etməsi baxımından orijinaldır.

XVIII əsrdə isə Azərbaycan təzkirəçiləri bu janrda beş əsər qələmə almışlar. İlk olaraq h.1160/1747-ci ildə Əliqulu xan Valeh Hindistanda təzkirəsini tamamlamışdır. Lütfəli bəy Azər isə təzkirəsini h.1174/1761-1193/1779-ci illər arasında İsfahanda yazmışdır. İshaq bəy Üzrinin antologiya xarakterli təzkirəsinin nə tərtiblənmə tarixi, nə də yazılma yeri məlum deyil. XVIII əsrin digər iki təzkirəçisi Sultan Məhəmməd xan Səfəvi əsərini h. 1211-1216-cı illər arasında, Əbu Talib xan Təbrizi isə h.1206-ci ildə qələmə almışdır.

XIX əsri Azərbaycan təzkirəçiliyinin çiçəklənmə dövrü hesab etmək olar. Belə ki, XIX əsrdə təzkirəçilərimiz 22 təzkirə tərtibləmişlər. H.1228/1813-cü ildə Əbdürrəzzaq bəy Dünbüli Azərbaycani "Təcrübətül-əhrar və təsliyyətül əbrar" adlı əsərini, h.1230/1814-cü ildə "Hədayiqül-üdəba" adlı əsərini, h. 1241/1825-ci ildə isə "Nigaristani-Dara" adlı təzkirəsini Təbrizdə qələmə almışdır. Məhəmməd Fazil xan Gorusinin "Əncüməni-xaqan"ı h.1234/1818-ci ildə Tehranda yazılmışdır. Mahmud mirzə Qacarın "Gülşəni-Mahmud" adlı təzkirəsi h.1236/1820-21-ci ildə, "Bəyanül-Mahmud"u h. 1240/1824-1825-ci ildə, "Nüqli-məclis"i isə h.1241/1825-ci ildə tərtiblənmişdir. Bəhmən mirzənin "Təzkireyi-

Məhəmmədşahi” adlı əsəri h.1247/1831-ci ildə Ərdəbildə, Məhəmməd Saleh Şamlunun “Məhəküş-şüəra”sı h.1252/1836-37-ci ildə Heydərabadda yazılmışdır. Bu qeyd olunanlardan əlavə XIX əsrdə Hülaku mirzə Qacar “Xərabat” (h.1255/1839), Xudaverdi xan Qacar “Təzkireyi-mədayih-i elxaniyyə” (h.1256/1840-41), Məhəmməd Bağır xan Qacar “Fələkül-Mərrix” (h.XIII əsrin I yarısı), Heydərqulu mirzə “Təzkireyi-Xavər”, Seyfüddövlə Sultan Məhəmməd Tağı “Bəzmi-xaqan” (h. 1245/1829), Məhəmməd Kazım Əsrar Əlişah Təbrizi “Behcətüş-şüəra” (h.1294/1877), Əli Rza mirzə Qacar “Büstanül-xaqaniyyə”, Əbülqasım Möhtəşəm Şirvani “Əxtəri-taban” (h.1298/1880-81) adlı təzkirələrini yazmışlar. Seyid Əzim Şirvani “Təzkirə”sini 1875-1883-cü illər arasında Şamaxıda, Ziyai “Təzkireyi-Ziyai”sini XIX əsrin ikinci yarısında Lənkəranda və Mir Möhsün Nəvvab “Təzkireyi-Nəvvab”ını 1891-ci ildə Şuşada qələmə almışlar.

XX əsrdə yazılmış Azərbaycan təzkirələrinin sayı ondur. Məhəmməd ağa Müctəhidzadə “Riyazül-aşiqin” adlı təzkirəsini Qarabağda yazmış və 1910-cu ildə İstanbulda çap etdirmişdir. İbrahim Tahir Musayev 1918-ci ildə Rzaqulu xan Hidayətin “Məcməül-füsəha” adlı təzkirəsini ixtisarla fars dilindən türkcəyə tərcümə etmişdir. Şəmsəddin xan Həqqi Təbrizi “Əncümənül-üdəba”sını 1928-ci ildə Təbrizdə tərtibləmişdir. Məhəmmədəli Tərbiyətin “Danişməndani-Azərbaycan”ı 1935-ci ildə Təbrizdə işıq üzü görmüşdür. Həsənəli xan Qaradağinin “Təzkireyi-Qaradaği” adlı əsəri də XX əsrin əvvəllərində Qarabağda yazılmışdır. Qulam Məmmədlinin tərtib etdiyi iri həcmli “Təzkirə” 1954-cü ildə Bakıda tamamlanmışdır. Azərbaycan müəllifi Seyid Əbdülhəmid Xalxalinin “Təzkireyi-şüərayi-müasiri-İran” sərlövhəli təzkirəsi 1954-cü ildə iki clddə Tehranda çap olunmuşdur. Əziz Dövlətabadinin “Süxənvərani-Azərbaycan”ı 1998-cı ildə, “Sərayendeqani-şeri-parsi dər Qafqaz” adlı təzkirəsi isə 1991-ci ildə Təbrizdə nəşr edilmişdir. Məhəmməd Dəyhimin “Təzkireyi-şüərayi-Azərbaycan” adlı əsəri beş cilddə 1989-1992-ci illərdə Təbrizdə işıq üzü görmüşdür.

XXI əsrdə isə bu janrda yeganə nümunəni Şahin Fazil yaratmışdır və əsər 2006-cı ildə Bakıda çap olunmuşdur.

Beləliklə, apardığımız araşdırmalar nəticəsində 41 Azərbaycan təzkirəçisinin XVI əsrdən XXI əsrə kimi 46 təzkirə tərtiblədiyi məlum olmuşdur. Təbii ki, bu, son rəqəm deyil. Gələcək tədqiqatlar zamanı bu sayda dəyişiklik də ola bilər, tərəfimizdən əldə olunmayan əsərlər üzə çıxarıla bilər.

| **N** | **təzkirəçi** | **təzkirəsi** | **yazılma tarixi** | **tərtib üsulu və ya strukturu** |
|---|---|---|---|---|
| | | **XVI əsr** | | |
| 1 | Sam mirzə | Töhfeyi-Sami | h.957/1550-968/1561 | 7 fəsil |
| 2 | Əhdi Bağdadi | Gülşəni-şüəra | h.971/1563-64-1001/1592 | 4 rövzə |
| 3 | İbrahim mirzə | Fərhəngi-İbrahim | XVI əsr | ? |
| 4 | Tövfi Təbrizi | Təzkireyi-Tövfi | XVI əsr | ? |
| | | **XVII əsr** | | |
| 5 | Sadiq bəy Əfşar | Məcməül-xəvas | h.1016/1607-1608 | 8 məcmə |
| 6 | Nazim Təbrizi | Nəzmi-güzidə | h.1027/1617-1036/1626 | 2 bab |
| | | **XVIII əsr** | | |
| 7 | Əliqulu xan Valeh | Riyazüş-şüəra | h.1160/1747 | əlifba |
| 8 | Lütfəli bəy Azər | Atəşkədə | h.1174-1193/1761-1779 | 2 məcmərə |
| 9 | İshaq bəy Üzri | Təzkireyi-İshaq | XVIII əsrin II yarısı | 4 fəsil |
| 10 | Əbu Talib xan Təbrizi | Xülasətül-əfkar | h.1206/1791 | ? |
| 11 | Sultan Məhəmməd mirzə Bahadır xan Səfəvi | Töhfətüş-şüəra | h.1211/1796-1216/1801 | ? |
| | | **XIX əsr** | | |
| 12 | Əbdürrəzzaq bəy Dünbüli | Təcrübətül-əhrar və təsliyyətül əbrar | h. 1228/1813 | 3 fəsil |
| | | Hədayiqül-üdəba | h.1230/1814 | |
| | | Nigaristani-Dara | h. 1241/1825 | 4 fəsil |

| | | | | |
|---|---|---|---|---|
| 13 | Məhəmməd Fazil xan Gorusi Ravi | Əncüməni-xaqan | h.1234/ 1818-19 | 4 əncümən |
| 14 | Mahmud mirzə Qacar | Gülşəni-Mahmud | h.1236/1820 | |
| | | Bəyanül-Mahmud | h.1240/1824 | 2 qismət |
| | | Nüqli-məclis | h.1241/1825 | 4 fəsil |
| 15 | Seyfüddövlə Sultan Məhəmməd Tağı | Bəzmi-xaqan | h.1245/1829 | 1 bəzm, 5 əncümən |
| 16 | Bəhmən mirzə | Təzkireyi-Məhəm-mədşahi | 1247/1831 | 4 riştə |
| 17 | Məhəmməd Saleh Şamlu | Məhəküş-şüəra | h. 1252/1836 | |
| 18 | Hülaku mirzə Qacar | Xərabat | h.1255-1256/1839 | əlifba |
| 19 | Xudaverdi xan Qacar | Təzkireyi-mədayih-i elxaniyyə | h. 1256/1840 | - |
| 20 | Məhəmməd Bağır xan Qacar | Fələkül-Mərrix | h.XIII əsrin I yarısı | - |
| 21 | Məhəmməd Həsən xan Etimadüssəltənə | Xeyrati-hesan | h.1304/1886-1306/1888 | əlifba |
| 22 | Heydərqulu mirzə | Təzkireyi-Xavər | XIX əsr | 3 bəxş |
| 23 | Məhəmmədqulu Mirzə Qacar | Təzkireyi-Xosrovi | XIX əsr | |
| 24 | Seyid Əzim Şirvani | Təzkirə | 1875-1883 | 4 fəsil |
| 25 | Məhəmməd Kazım Əsrar Əlişah Təbrizi | Behcətüş-şüəra | h.1294-99/ 1877-82 | əlifba |
| 26 | Əli Rza mirzə Qacar | Bosatinül-xaqaniyyə | XIX əsrin 30-cu illəri | 5 bostan |
| 27 | Ziyai | Təzkireyi-Ziyai | XIX əsrin ikinci yarısı | qarışıq |
| 28 | Əbülqasım Möhtəşəm Şirvani | Əxtəri-taban | h. 1298/1880 | əlifba |
| 29 | Mir Möhsün Nəvvab | Təzkireyi-Nəvvab | 1891 | iki hissədə |
| | | **XX əsr** | | |
| 30 | Məhəmməd ağa Müctəhidzadə | Riyazül-aşiqin | 1910 | 2 hissə (yalnız I cildi nəşr olunub) |
| 31 | Həsənəli xan Qa-radaği | Təzkireyi-Qaradaği | XX əsrin əvvəlləri | - |
| 32 | İbrahim Tahir Musayev | Riyazül-arifin | 1918 | |
| 33 | Şəmsəddin xan Həqqi Təbrizi | Əncümənül-üdəba | h.1307-1310/ 1928-1931 | 3 qismət və 9 cild |
| 34 | Məhəmmədəli Tərbiyət | Danişməndani-Azərbaycan | 1935 | əlifba |
| 35 | Qulam Məmmədli | Təzkirə | 1954 | əlifba |
| 36 | Seyid Əbdülhəmid Xalxali | Təzkireyi-şüərayi-müasiri-İran | 1333 / 1954 | 2 cilddə |
| 37 | Əziz Dövlətabadi | Süxənvərani- | 1956 | Coğrafi |

| | | | | |
|---|---|---|---|---|
| | | Azərbaycan | | |
| | | Sərayendeqani-şeri-parsi dər Qəfqaz | 1991 | coğrafi |
| 38 | Əli Nəzmi | Devist süxənvər | 1396/1976 | - |
| 39 | Yəhya Şeyda | Ədəbiyyat ocağı | 1985-2002 | coğrafi |
| 40 | Məhəmməd Deyhim | Təzkireyi-şüərayi-Azərbaycan | 1989-1992 | coğrafi |
| | | **XXI əsr** | | |
| 41 | Şahin Fazil | Təzkireyi-Şahin | 2006 | - |

## 2.5. TARİXİ ƏSƏRLƏRİN TƏZKİRƏ HİSSƏSİ

Bioqrafik əsərlər bəzən müstəqil, bəzən isə başqa bir əsərin bir bölümü olaraq qələmə alınır. İkincidə daha çox tarix kitablarının bir bölümü olaraq bioqrafik əsərlərə rast gəlirik[74]. Azərbaycan və Osmanlı müəlliflərinin qələmə aldıqları ümumi tarixlər içərisində şairlər haqqında məlumat verilməsi ənənəsi də olmuşdur. Prof. ***M.İsen*** XVI əsr Osmanlı bioqrafiya ənənəsinin 3 fərqli növünün olduğunu qeyd edir:

1. Ümumi tarixlərdə yer alan bioqrafiyalar;
2. Şəqaiq, təlif, tərcümə və zeyllərdə yer alan bioqrafiyalar;
3. Şüəra təzkirələrində verilən bioqrafiyalar[75].

Araşdırmalar nəticəsində məlum olmuşdur ki, orta əsrlərdə Şərq müəlliflərinin bəzi tarixi əsərlərində şairlərə xüsusi yer ayrılmışdır. Məsələn, Hülakular dövrünün tarixçisi ***Həmdullah Mustovfi Qəzvininin*** h. 730/1330-cu ildə yazdığı ***"Tarixi- güzidə"*** əsərinin beşinci babının altıncı fəsli şairlərin tərcümeyi-hallarına həsr olunmuşdur[76].

Səfəvilər dövründə, XVII əsrdə yaşayıb-yaratmış və Azərbaycanın qızılbaş tayfalarına mənsub olmuş üç tarixçi öz əsərlərində şairlərin həyat və yaradıcılıqlarına xüsusi fəsillər ayrılmışdır.

---

74 Bayram Ö. Gülistan-i İremin tezkire kısmı // Klasik Türk Edebiyatında Biyografi Sempozyumu Bildirileri. Ankara: AKMBY, 2011, s. 109.
75 İsen M. Tezkireden bioqrafiye. – İstanbul: 2010, s. 8.
76 Məani Ə.G. Tarixi-təzkirəhayi-farsi. II c., s. 549.

| Müəllif | Əsər |
|---|---|
| 1. İsgəndər bəy Türkman | Tarix-i aləmara-yi Abbasi |
| 2. Vəliqulu bəy Şamlu | Qisəsül-xaqani |
| 3. Məhəmmədqulu xan Qacar Gənceyi | Lübbül-lübab |
| 4.Abbasqulu ağa Bakıxanov | Gülüstani-İrəm |

I Şah Abbasın saray tarixçisi ***İsgəndər bəy Münşi Türkman "Tarixi-aləmarayi-Abbasi"*** əsərində I Şah Təhmasib zamanının şairlərinə xüsusi bir fəsil ayırmış, onların həyatlarını təsvir etmiş və əsərlərindən nümunələr vermişdir[77]. Əsərin birinci cildində XVI əsr tariximizə dair qiymətli bilgilərin verilməsi ilə yanaşı, Azərbaycan ədəbiyyatının həmin dövrdə yaşamış bəzi nümayəndələrinin – Şah İsmayıl Xətainin, İbrahim mirzə Cahinin, Xoca Cəlaləddin Məhəmməd Keçəçinin, Müseyib xan Şərəfəddinoğlu Təkəlünün, Şahqulu bəy Rumlunun, Qasım bəy Halətinin, Sadıq bəy Əfşarın, Xoca Əmir bəy Keçəçinin, Vüqui Təbrizinin və başqalarının yaradıcılığı haqqında da müəyyən məlumatlar yer almış və onların bəzilərinin şeirlərindən nümunələr əksini tapmışdır. "Tarixi-aləmarayi-Abbasi"nin birinci cildində 15 azərbaycanlı şairin adı çəkilmişdir. Bunların 13 nəfəri Səfəvi dövründə, xüsusən də XVI əsrdə yaşayıb-yaratmış şairlərdir. Mənbədə adları çəkilən azərbaycanlı şairlərin 6-sı əslən Ərdəbildən (Səfəvi nəslinin nümayəndələri), 3-ü Təbrizdən, 1-i Gəncədən, 1-i Şamaxıdandır, digər 4-ü isə əfşar, türkman, təkəlü və rumlu oymaqlarına mənsubdur. Haqqında bəhs olunmuş şairlərin 4-ü peşəkar şair, 4-ü şah, 2-si şahzadə, 2-si vəzir, 2-si hərbçi və 1-i naqqaş olmuşdur. İsgəndər bəy Münşi əsərinin birinci cildində bu şairlərimizin şeirlərindən cəmi 44 misraya yer

[77] Türkman İsgəndər bəy Münşi. Tarix-i aləmara-yi Abbasi. I cild. Bakı: Təhsil, 2009, s. 371-389.

vermişdir ki, bunların da 8 misrası türkcə, 36 misrası isə farscadır[78].

Məlum olduğu kimi, azərbaycanlıların etnogenezində iştirak etmiş və Səfəvilər dövlətinin hərbi-siyasi həyatında mühüm rol oynamış türk qızılbaş oymaqlarından biri də şamlu tayfasıdır[79]. XV əsrin başlanğıcından etibarən Ərdəbil şeyxlərinin yanında yer almış bu tayfa, XVI-XVII əsrlərdə Səfəvilərin nüfuzu artdıqca Azərbaycan hüdudlarını aşaraq, İranın, Əfqanıstanın və s. Şərq ölkələrinin müxtəlif bölgələrinə yayılmışdır. Davudqulu bəyin oğlu ***Vəliqulu bəy Şamlu*** h. 1035/1625-26-cı ildə Heratda anadan olmuşdur. Gəncliyində Heratı tərk etmiş və Sistanda Məlik Nüsrət xanın mustovfisi olmuşdur. Bir neçə ildən sonra o, Qəndəhara getmiş və oranın hakimi Zülfüqar xanın saray idarəçisi (hacibi) olmuş, lakin h.1073/1662-63-cü ildə Qəndəharın yeni hakimi Mənsur xan tərəfindən tutduğu vəzifədən azad edilmişdir. Məhz o zaman 38 yaşlı Vəliqulu bəy tarixi əsər yazmaq üçün kifayət qədər asudə vaxtının olduğunun fərqinə varmış və ***"Qisəsül-xaqani"*** adlı salnamə qələmə almağa başlamışdır. Müəllif öz əsərini tam şəkildə h. 1085/1674-75-ci ildə bitirmişdir[80].

"Qisəsül-xaqani" bir müqəddimədən, üç babdan və bir xatimədən ibarətdir. Müqəddimədə II Şah Abbasın şəcərəsindən, I babda Firuzşahdan I Şah İsmayıla qədər Səfəvi əcdadlarının həyat yolundan, II babda I Şah İsmayıldan II Şah Abbasın hakimiyyətə gəlişinə qədərki Səfəvi tarixindən, III babda isə II Şah Abbasın hakimiyyəti dövründən bəhs olunmuşdur. Əsərin xatimə hissəsi üç təzkirəyə bölünmüşdür. I təzkirədə müəllifin müasiri olan alimlərdən, həkimlərdən və fazillərdən 25 nəfərin tərcümeyi-halına yer verilmişdir. II təzkirədə II Şah Abbas dövrünün 101 şairinin həyat

---

78 Musalı N. "Tarixi-i aləmara-yi Abbasi" əsərində XVI əsr Azərbaycan ədəbiyyatı məsələləri / "Azərbaycan Dünya ədəbiyyatında" Beynəlxalq simpoziumun materialları. Xəzər Universiteti nəşriyyatı, 2012, s. 578-589.

79 ASE, X c., s.462.

80 Ч.А.Стори. Персидская литература. Москва, 1972, ч. 2, с.894.

və yaradıcılığına nəzər salınmışdır. III təzkirədə isə o dövrün 19 məşhur dərvişindən söz açılmışdır[81].

Əsərdə azərbaycanlı şairlərdən Məliküşşüəra Saib Təbrizi, Mirzə Tahir Vəhid Qəzvini, Məczub Təbrizi, Molla Ədhəm Əzləti Xalxali, Təbrizin şeyxülislamı Mirzə Saleh, Bayandur xan Şeyxavənd, Molla Murad Təsuci, Sultanəli bəy Şamlu, Mirzə Məhəmməd Rza Ünvan Təbrizi, Vahid Türkman, Məlik bəy Avcı, Abbas bəy Kisvəti Təbrizi, Mürtəzaqulu bəy Bayat və başqalarının tərcümeyi-hallarına, şeirlərindən örnəklərə yer verilmişdir[82].

Araşdırmalarımız zamanı "Qisəsül-xaqani"nin Tehrandakı İslami Şura Məclisi kitabxanasında saxlanan 8530 saylı əlyazma nüsxəsini əldə etmişik[83]. Əsərin "Xatimə" hissəsində şairlərdən bəhs edən "ikinci təzkirə" əlyazmanın 645-733-cü səhifələrini əhatə edir. Təzkirə şeiri və şairliyi öyən qısa girişlə başlayır. Maraqlıdır ki, Vəliqulu bəy Şamlu da özündən əvvəlki Azərbaycan tarixçisi İsgəndər bəy Münşi kimi əsərinin təzkirə hissəsinin girişinə Nizami Gəncəvinin bu beytini daxil etmişdir:

Ulu Tanrı insanlardan cərgələr qurdu,
Peyğəmbərlərin ardınca şairlər durdu.

Təzkirədə ilk öncə Saib Təbriziyə yer verilmiş, o, "yüksək uğur sahibi olan padşahın zamanındakı şairlərin öndəgedəni" deyə vəsf edilmişdir və şairin yaradıcılığı geniş şəkildə təsvir edilmişdir. Müəllifin Saibdən bəhs edərkən, "indi hicri 1076-cı ildir" qeydindən aydın olur ki, təzkirə m. 1665-66-cı ildə qələmə alınmışdır[84] .

Vəliqulu bəy şairlərimizin farsca şeirləri yanaşı, ana dilində şeirlərindən də nümunələr təqdim etmiş və türkcə yazan şairlərin

---

[81] Salehi N. Kitabşinasiyi-tovsifiyi-mənabeyo-mütuni-təshihşodeyi-Səfəvi dər do dəheyi-axir // Kitab-i mah (tarix və coğrafiya), IV/1-2, 1379 (mahi-azər), s.40-50.

[82] Məani Ə.G. Tarixi-təzkirəhayi-farsi. II c., s. 694-699.

[83] Vəliqulu bəy Şamlu. Qisəsül-xaqani. İran İslami Şura Məclisi kitabxanası – 8530.

[84] Yenə orada, s. 648.

yaradıcılığının bu yönü haqqında da məlumat vermişdir. Məsələn, müəllif Təbriz şeyxülislamı Mirzə Salehdən söz açarkən, "onun türkcə və farsca şeirlərinin böyük şöhrətə malik olduğunu" bildirərək, şairin aşağıdakı mətlə ilə başlayan türkcə qəzəlindən beytləri oxuculara təqdim edir[85]:

Kimsə açmaz qapımı badi-səbadan qeyri,
Tanımaz kimsə məni dərdü-bəladan qeyri...

Əslən Ərdəbildən olan Bayandur xan Şeyxavənddən bəhs edərkən, müəllif onun "kəlamlarının sorağı yerdən göyə qədər yüksəlmiş və bəyənilmiş ali şövkətli türk qövmünün nümayəndəsi" olduğunu qabardır[86]. Tarixçi-təzkirəçinin mənsub olduğu türk etnosu haqqında bu cür tərifli ifadələrinə sonrakı səhifələrdə də rast gəlirik[87]. Vəliqulu bəy türkcənin şirin bir dil olduğunu vurğulayaraq, Səfəvi dövründə "farsdilli cavanmərdlərin" də bu dilə aludə olub onu öyrəndiklərini qeyd edir[88]. Müəllif ikidilli (yəni həm türkcə, həm də farsca şeir yazmış) şairlərimizdən bəhs edərkən, onların ilk növbədə məhz türkcə şeirlərindən nümunələr təqdim etməyi üstün tutmuşdur.

Məlik bəy Avcının türkcə gözəl şeirlər yazdığı qeyd edən Vəliqulu bəy onun bir müxəmməs-müstəzadını misal gətirir. İlk misralarını belədir[89]:

Bir afət imiş eşq ki, sevdasinə düşmək
Divanəlik istər.
Gəncin diləyib kuhinə, səhrasinə düşmək
Viranəlik istər....

[85] Yenə orada, s. 675.
[86] Yenə orada, s. 678.
[87] Yenə orada, s. 684.
[88] Yenə orada, s. 675.
[89] Şeirin daha dolğun forması üçün bax: Hüseyni M. Ədəbiyyat tariximizdən səhifələr. Bakı, 2004, s.113-114.

Abbas bəy Kisvəti Təbrizinin də türkdilli poeziyasına diqqət çəkən müəllif onun türkcə "Var" rədifli beş beytlik qəzəlinə yer vermişdir[90].

Səfəvilərin hakimiyyəti dövründə fəaliyyət göstərmiş XVII əsr Azərbaycan tarixçisi gəncəli ***Hacı Məhəmmədqulu xan Qacar*** Gəncə şəhərində hərbçi ailəsində doğulmuşdur. Uzun müddət hərbi işlə məşğul olması səbəbindən təhsilinə çox vaxt ayıra bilməsə də, tarix elminə maraq göstərmiş, bəzi tarixi əsərləri mütaliə etmiş və axırda özü də tarixi əsər yazmaq həvəsinə düşmüşdür. Hicri 1097 / miladi 1685-86-cı ildə o, müsəlman xanədanlarının tarixinə dair 23 fəsildən ibarət ***"Lübbül-lübab"*** ("Seçilmişlərin cövhəri") adlı farsca əsər yazmışdır. Bu tarixi qaynağın günümüzə qədər iki əlyazma nüsxəsi gəlib çıxmışdır. Onlar Londonda Britaniya Muzeyində və Tehranda yerləşən kitab fondlarında aşkar edilmişlər[91].

Axtarışlarımız zamanı ***"Lübbül-lübab"***ın Tehran Universitetindəki Hikmət kolleksiyasında saxlanan 289 saylı əlyazma nüsxəsini əldə etdik. Hacı Məhəmmədqulu xan Qacar Gənceyinin əsərinin şairlərdən bəhs edən 23-cü fəsli "Farsca şeir demiş Əcəm şairlərinin zikri" adlanır və əlyazmanın 180-212-ci səhifələrini əhatə edir. Müəllif təzkirə qisminin qısa dibaçəsinə belə başlayır: "Deyirlər ki, İslamın peyda olmasından öncə alimlər və fazillər fars dilində şeir tapmamışlar və farsca şeir demiş bir şair tanımamışlar". Qeyd edilir ki, yalnız bir rəvayətə görə, Sasani hökmdarı Bəhram Gurun şir ovladıqdan sonra bir misra söyləməsi və kənizi Dilaramın ona bir misra ilə cavab verməsi məlumdur. Gəncəli tarixçi-təzkirəçi hesab edir ki, farsdilli poeziya məhz islam dövründə inki-

---

[90] Vəliqulu bəy Şamlu. Qisəsül-xaqani. İran İslami Şura Məclisi kitabxanası 8530, s. 706.

[91] Стори Ч.А. Персидская литература: био-библиографический обзор; перевел с английского, переработал и дополнил Ю.Э.Брегель. Москва, 1972, ч. I, с.443

şafa başlamış və "farsca şeir demiş ilk şair Ustad Əbül-Həsən Rudəkidir"[92].

İlk babda azərbaycanlı şairlərdən Əbülüla Gəncəvi, Xaqani Şirvani, Fələki Şirvani, Nizami Gəncəvi, Əvhədi Marağayi, ikinci babda Ağqoyunlu Sultan Yaqub, üçüncü babda Şah İsmayıl Xətai, Şah Təhmasib, Bəhram mirzə, Sam mirzə, Şah Məhəmməd Xudabəndə, II Şah Abbas, Ünsi Zülqədər, Ənisi Şamlu, Deyri Zülqədər, Türk Heydər bəy Zehni, Rzapaşa Təbrizi, Salim Təbrizi, Səbri Təbrizi, Sadiqi bəy Naqqaş (Sadıq bəy Əfşar), Saib Təbrizi, Tövfi Təbrizi, Mücrüm təxəllüslü Quluxan bəy Şamlu, Molla Məhəmməd Məczub Təbrizi, Füzuli, Qəsəmi Əfşar, Lisani Təbrizi, Meyli Təkəlü, Müseyib xan Təkəlü və b. haqqında məlumat verilmişdir. Buradakı biblioqrafik məlumatlar və şeir örnəkləri qısadır. Bu əsərdən bəzi tərcümeyi-hal nümunələrini təqdim edirik:

"Fələki Şirvani – Xaqaninin müasirlərindəndir və bəziləri deyirlər ki, o, Xaqaninin ustadıdır. (Bu beyti) şirvanşahın mədhinə dair demişdir"[93].

"Cənnətməkan fateh Şah İsmayıl ibn Sultan Heydər Səfəvi əl-Hüseyni Bahadır xan buyurmuşdur:

Bisütun mənim naləmi eşidən kimi yerindən qalxdı,
Fəryad etdi ki, daha bir Fərhad peyda olubdur.

Onun türkcə və farsca mübarək təxəllüsü Xətaidir"[94].

"Ünsi Zülqədər – ismi Həsən bəydir və könül oxşayan sözləri vardır. (Bu beyt) ondandır". "Ənisi Şamlu – yüksək səviyyəli şairdir və xanlar xanının məddahı olmuşdur. (Bu rübai) ondandır". "Salim Təbrizi – adı Mahmud bəydir və yüksək dərəcəli şairlərdəndir. Caminin "Yusif və Züleyxa"sına yaxşı bir cavab demişdir. (Bu beyt) ondandır". "Mövlana Füzuli Bağdadi – türkcə üstün ba-

---

[92] Məhəmmədqulu xan Qacar. Lübbül-lübab. Tehran Universitetindəki Hikmət kolleksiyası 289, vər. 180-181.
[93] Yenə orada, vər. 183.
[94] Yenə orada, vər. 198.

carığa malikdir və farsca şeirləri də son dərəcə pakizədir". "Lisani Təbrizi – xoş kəlama malik bəlağətlilərdəndir".

XIX əsrin birinci yarısı Azərbaycan bədii, mədəni və elmi fikrinin ən görkəmli nümayəndələrindən biri ***Abbasqulu ağa Bakıxanovdur.*** O, ilk növbədə şair kimi fəaliyyət göstərərək, klassik Azərbaycan və Şərq poeziyasının müxtəlif janrlarında Azərbaycan və fars dillərində şeirlər yazmış, milli poeziyamızın və nəsrimizin inkişafında müəyyən rol oynamışdır[95].

A.Bakıxanovun Azərbaycan mədəniyyəti və elmi tarixində ən mühüm xidməti onun tarixşünas alim kimi fəaliyyəti ilə bağlı olub. O, 1841-ci ildə fars dilində Azərbaycan tarixşünaslığında misli görünməmiş məşhur "Gülüstani-İrəm" adlı əsərini tamamlamışdır. Alim əsərini qədim yunan, Roma, Bizans, Ərəb, fars, türk tarixçilərinin, həmçinin öz dövrünün Avropa və rus tarixçilərinin və Azərbaycan və Dağıstanın tarixi ilə bağlı əsərlərindən, səyahətlərindən topladığı zəngin materiallar əsasında yazmışdır. Bu əsərdə əsasən Şirvan və Dağıstanın ən qədim dövrlərdən başlamış 1813-cü ilə qədərki dövrünün tarixi tədqiq edilmişdir[96].

Bu tarixi əsər müqəddimə, beş fəsil və nəticədən ibarətdir. Əsərin strukturu aşağıdakı kimidir:

***Müqəddimə*** Şirvan və Dağıstan vilayətlərinin hüdud və ərazisi, adlanmalarının səbəbi, əhalisinin mənşəyi, dilləri və dinləri haqqında;

***Birinci fəsil*** İslam dövlətinin zühurundan ərəb qoşununun gəlməsinə qədər Şirvan və Dağıstan ölkələrində baş verən qədim hadisələr haqqında;

***İkinci fəsil*** ərəb ordusunun gəlməsindən başlayaraq moğolların istilasına qədər;

***Üçüncü fəsil*** moğol istilasından Səfəvilərin zühuruna qədər və Şirvanşahlar sülaləsinin səltənəti dövrü;

***Dördüncü fəsil*** Səfəvilərin zühurundan Nadir şahın vəfatına qədər;

---

[95] Azərbaycan ədəbiyyatı tarixi. IV c., Bakı, 2011, s. 102.
[96] Yenə orada, s. 134.

***Beşinci fəsil*** Nadir şahın vəfatından «Gülüstan» adlı yerdə Rusiya və İran dövlətləri arasında bağlanan sülh müahidəsi zamanına qədər;

***Nəticə*** Şirvan vilayətində və onunla qonşu olan yerlərdə təlifat sahibi və ya başqa fəzilət və məziyyətə malik olan şəxslərin tərcümeyi-halları haqqında. Əsərin nəticə hissəsi təzkirə xarakteri daşıyır. Burada Şirvanda və onunla qonşu olan vilayətlərdə elmi və ədəbi fəaliyyətləri və başqa məziyyətləri ilə seçilən görkəmli simaların həyat və fəaliyyəti qısaca işıqlandırılmışdır.

A. Bakıxanov yazır: "Hər bir tayfanın kəmalat dərəcəsini, vəziyyət və hallarının gözəlliyini onların təlifatından və sair əsərlərindən gözəlcəsinə anlamaq olar. Bir çox şəhər və kənd xarabaları, həzrət Şəmunun Aran şəhərində və yüksək dərəcəli üç imamzadənin Şamaxı, Gəncə və Bərdə şəhərlərində olan türbələri, Bülbülə kəndindəki imamzadə, imam Museyi-Kazımın qızı Həlimə xatunun Bakıda, Bibiheybətdəki türbəsi, Sufi Həmidin Şirvan Qobustanındakı məzarı və bir çox başqa yerlərdə olan məşhur seyidlərin, şeyxlərin və hörmətli fazil kimsələrin qəbirləri göstərir ki, bu ölkə həmişə din böyüklərinin məskəni, arif və alimlərin vətəni olmuşdur. Başqa faydaları bir tərəfə dursun, bu ölkə mötədil iqlimli ən yaxşı yerlər sırasına daxildir. Öz dağlarında, çöllərində, meşələrində və vadilərində bütün dünyanın müxtəlif məhsulatını yetişdirməkdədir. Bu ölkədə yaşayanların nəsli bütün insan tayfalarından qarışıqdır. O tayfalardan hər birinin əxlaqı və asarı bunlarda görünməkdədir...

Hər halda, bu ölkənin alim və fazillərinin həyatı imkan daxilində hər birinin əsrinə müvafiq olaraq zikr edilir və azacıq da olsa onların əsərlərindən və fikirlərinin nəticələrindən qeyd olunur"[97].

"Gülüstani-İrəm"in bu hissəsində Məhəmməd Bakuvi, Nizami Gəncəvi, Əbülüla Gəncəvi, Xaqani Şirvani, Fələki Şirvani, Zülfüqar Şirvani, Seyid Yəhya Bakvuvi və b. şairlər haqqında məlu-

---

[97] Bakıxanov A. Gülüstani-İrəm / Tərcümə ed.: R.Ağayev. Bakı, 2001, s.

mat vermişdir. Ö.Bayram "Gülüstani-İrəm"in təzkirə qismini tədqiqata cəlb etmişdir[98].

## 2.6. TƏZKİRƏ XARAKTERLİ ƏSƏRLƏR

Azərbaycanda XX əsrin ortalarından başlayaraq təzkirə xarakterli nümunələr yaradılmışdır. Təzkirə tipli əsərlərin əvvəlki təzkirələrlə müqayisədə ən mühüm fərqi onlarda biblioqrafik informasiya potensialının daha güclü olmasıdır[99].

Ədəbiyyatşünas alim, yazıçı ***Əzizə Cəfərzadənin*** 1974-ci ildə çap etdirdiyi ***"Azərbaycanın aşıq və şair qadınları"***[100] adlı kitabı əlavələrlə 1991-ci ildə yenidən nəşr olunmuşdur. Kitabın 1991-ci il nəşrində sovet dövrünə qədər yazıb-yaratmış səksəndən artıq aşıq və şair qadınlardan bəhs edilmişdir. Əsərdə Məhsəti Gəncəvi, Fatma xanım Ani, Fatma Kəminə, Xanbikə, Nimtac və başqa qadın şairələrimiz xatırlanmış, əsərlərindən nümunələr təqdim olunmuşdur.

Şair, ədəbiyyatşünas, tərcüməçi ***Cəfər Rəmzi İsmayılzadə***nin (1905-1996) tərtib etdiyi ***"Deyilən söz yadigardır"***[101] Bakı şairlərinə həsr olunmuş müasir təzkirədir[102]. İyirmi il ərzində tərtib edilmiş bu əsər ilk dəfə 1981-ci ildə nəşr olunmuşdur. Burada 87 Bakı-Abşeron şairi haqqında məlumat və əsərlərindən nümunə təqdim olunmuşdur. Məlumatlar şairlərin anadan olma tarixləri əsa-

---

[98] Bax: Bayram Ö. Gülüstani-İremin Tezkire Kısmı // Klasik Türk Edebiyatında Biyografi Sempozyum Bildirileri. Ankara, 2011, s.109-120.

[99] Xələfov Ə. Təzkirəçilərin bugünkü sələfləri // Kitabxanaşünaslıq və biblioqrafiya, 2000, N 1, s. 92.

[100] Azərbaycanın şair və aşıq qadınları /Tərt. ed.: Ə.Cəfərzadə. Bakı, 1991, 288 s.

[101] Bax: Azərbaycan yazıçılıarı. Ensiklopedik məlumat kitabı. Bakı: 1995, s. 554; Xələfov Ə. Təzkirəçilərin bugünkü sələfləri // Kitabxanaşünaslıq və biblioqrafiya, 2000, N 1, s. 92-99; Kazımova S. Haqsızlığın qurbanı və ya Cəfər Rəmzi kimdir? // Humanitar elmlərin öyrənilməsinin aktual problemləri, 2007, N 4, s. 93-97.

[102] Deyilən söz yadigardır / Tərt. ed.: C.Rəmzi. Bakı, 1987, 433 s.

sında verilmişdir. Təzkirənin təkrar nəşri 1987-ci ildə işıq üzü görmüşdür. Bu nəşrdə 119 nəfər şairdən bəhs olunmuşdur. Əsərdə, demək olar ki, əksər şairlərin şəkilləri də verilmişdir.

***Nəsrəddin Qarayevin*** tərtib etdiyi və 1987-ci ildə işıq üzü görən ***"Poetik məclislər"*** adlı əsərdə XIX əsrdə Azərbaycanın mədəniyyət mərkəzlərində fəaliyyət göstərmiş "Divani-hikmət", "Gülüstan", "Əncümənüş-şüəra", "Beytüs-səfa", "Məclisi-üns", "Məclisi-fəramuşan" və s. kimi ədəbi məclislərdən və onların nümayəndələrindən söhbət açılmış, əsərlərindən nümunələr təqdim olunmuşdur[103].

***Məmməd Nuru oğlu***nun hazırladığı ***"Azərbaycan qəzəlləri"*** adlı əsər 1991-ci ildə çap olunmuşdur[104]. Bu əsərdə XI-XX əsrlərdə yaşamış Azərbaycan şairləri haqqında qısa bioqrafik məlumat verilmiş və qəzəlləri təqdim olunmuşdur. Kitabdakı şair sayı 327 nəfərdir.

1999-cu ildə ***Nadi Əli Pəyam***ın təzkirə xarakterli ***"Səkkiz yüz ilin Azərbaycan-türk qəzəli***" adlı kitabı nəşr edilmişdir. Kitabda Azərbaycan qəzəlxanlarının həyat və yaradıcılığı haqqında məlumat verilmiş və qəzəllərindən nümunələr təqdim olunmuşdur.

---

[103] Poetik məclislər / Toplayanı və tərtib edəni: N.Qarayev. – Bakı: Yazıçı, 1987, 526 s.

[104] Azərbaycan qəzəlləri / Tərt. ed.: Məmməd Nuruoğlu. Bakı, 1991, 240 s.

# III FƏSİL

# AZƏRBAYCAN TƏZKİRƏÇİLİYİNİN SPESİFİKASI VƏ OSMANLI TƏZKİRƏLƏRİ İLƏ FƏRQLİ VƏ OXŞAR XÜSUSİYYƏTLƏTİ

3.1. Osmanlı təzkirəçiliyinə qısa rakurs

3.2. Azərbaycan və Osmanlı təzkirələrinin fərqli və oxşar xüsusiyyətləri

## 3.1. OSMANLI TƏZKİRƏÇİLİYİNƏ BİR NƏZƏR

Azərbaycan və Osmanlı təzkirələrinin spesifik xüsusiyyətlərini, oxşar və fərqli cəhətlərini qeyd etməmişdən öncə Osmanlı təzkirəçiliyi haqqında qısa məlumat verməyi məqsədəuyğun hesab edirik.

Dövlətşah Səmərqəndi və Əlişir Nəvai təzkirələrinin qazandığı şöhrət səbəbi ilə XVI əsrdən etibarən bu klassik nümunələrin təsiri altında Osmanlı ədəbiyyatında da təzkirələr yazılmağa başlamışdı.

Türk təzkirəçilik tarixində mühüm yer tutan əsərlərdən biri də XVI əsr müəllifi ***Qəribinin "Təzkireyi-məcalis-i şüəra-yi Rum"*** adlı təzkirəsidir[105]. Bu əsər I Şah Təhmasibin zamanında Azərbaycan ərazisində qələmə alınmışdır. Qəribi Anadoludan Azərbaycana mühacirət etmişdir. Əsər Osmanlı türkcəsində yazılsa da, orada Azərbaycan türkcəsinin ciddi təsiri duyulur. Təzkirə XIII əsrin I yarısından XVI əsrin I yarısınadək yaşayıb-yaratmış 54 nəfər şairi əhatə edir. İlk üç vərəqində dibaçə yer almışdır. Təzkirə konkret prinsip əsasında tərtiblənməmişdir. Belə ki, bəzən tarixi-xronoloji ardıcıllığa riayət olunmuşdur.

***Səhi bəyin*** h. 945/1538-ci ildə tamamladığı ***"Həşt behişt"***i ön söz, "behişt" adı verilən 8 təbəqə və bir xatimədən ibarətdir[106]. Ümumilikdə təzkirədə 241 nəfər şair xatırlanmışdır. Bu təzkirə üslub və struktur baxımından Herat təzkirələrini izləyir. "Həşt behişt"in ən önəmli cəhəti Anadoluda yeni bir ədəbi janrın əsasını qoymasıdır.

---

[105] Babacan İ. Tezkire-i Mecalis-i Şu'ara-yı Rum-Garîbî Tezkiresi. - Ankara: Ankara Vizyon Yayınevi, 2010.

[106] Sehi Bey. Tezkire «Heşt bihişt» / hazır: M. İsen. İstanbul: Tercüman qazetesi, 1980, 260 s.; Heşt bihişt: The tezkire by Sehi Beg. Work on Ottoman poets with a critical edition based Suleymaniye Library, Ayasofya O.3545 by Gunay Kut. Harward-Cambridge, 1978.

"Həşt behişt"dən sonra, Anadolu sahəsində yazılmış ikinci təzkirənin müəllifi ***Kastamonulu Lətifi***dir (h.896/ 1491-h.990/1582). ***"Təzkirətüş-şüəra və təbsirətün-nüzəma"*** adlı bu əsər müqəddimə, 3 fəsil və xatimədən ibarətdir. Lətifi təzkirəsini h.953/1546-cı ildə tamamlayıb, Qanuni Sultan Süleymana təqdim etmişdir[107]. I fəsildə, Anadoluda yaşayan və ya buraya gəlib, "Rumi" kimi tanınan 13 şeyx şairdən bəhs olunmuşdur. Təzkirənin II fəslində Osmanlı ölkəsində şeir yazan sultan və şahzadə şairlərə yer verilmişdir. Əsərin ən önəmli hissəsini təşkil edən III fəsildə II Muradın hakimiyyəti dövründən h.950-ci ilə qədər Anadolu və Balkanlarda yaşayıb-yaradan şairlərdən 314 nəfəri haqqında məlumat əlifba sırası ilə verilmişdir.

XVI əsrdə tərtib olunmuş təzkirə müəlliflərindən biri də ***Aşiq Çələbi***dir (h. 926/1520 - h. 979/1572). Tanınmış türk şairi və münşilərindən olan və tərtib etdiyi təzkirəsi ilə şöhrət qazanan Aşiq Çələbinin ədəbi yaradıcılığı təzkirə, tərcümələr və mənzum əsərlərindən ibarətdir. ***"Məşairüş-şüəra"***[108] təzkirəsi Aşiq Çələbinin ən məşhur əsəri olub, h.976/1568-ci ildə tamamlanmış və dövrün padşahı II Səlimə təqdim olunmuşdur. "Məşairüş-şüəra" müqəddimə və şairlərdən bəhs edən hissədən ibarətdir. "Məşairüş-şüəra"nı daha əvvəl və sonra bu janrda yazılan təzkirələrdən fərqləndirən spesifik cəhət, müasiri olan şairlərə geniş yer verməsi, onların dostları, yaşayış tərzləri, məişətləri, əyləncələri və xarakterləri ilə canlandırmasıdır. Müəllif şairlərdən bəhs edərkən öz fikirlərini, lətifə və hekayələri də bura əlavə etmiş və beləliklə, əsərə digər təzkirələrdə olmayan cəhətləri artırmışdır. Bundan əlavə, bu təzkirə Şərq təzkirəçilik tarixində əbcəd ardıcıllığı əsasında tərtiblənmiş yeganə təzkirə kimi xatırlanır.

---

[107] Latifi. Latifi tezkiresi / hazırl. M.İsen. Ankara: Kültür Ba-kanlığı, 1990, 513 s; Latifi Tezkiretüş-şuara ve Tabsıratün- nuzama (İnceleme-metin) / haz. R.Canım. Ankara: 2000, IX+ 935 s.

[108] Aşık Çelebi. Meşa'irü'ş-Şu'ara / hazır.: Prof. Dr. F. Kılıç. 3 cildde. – İstanbul: İstanbul Araştırmaları Enstitüsü, 2010; Aşık Çelebi ve şairler tezkiresi üzerine yazılar / Derleyenler: Aynur H., Niyazioğlu A. – İstanbul: Yapı Kredi Yayınları, 2011. – 192 s.

XVI əsrdə yazılmış təzkirələrdən digər birinin müəllifi ***Qınalızadə Həsən Çələbi***dir (h.953/1546-h.1012/1604). Həsən Çələbi dövrünün tanınmış alimlərindən biri olmuşdur. ***"Təzkirətüş-şüəra"*** adlı əsərini h.994 /1586-cı ildə qələmə almışdır[109]. Təzkirənin strukturuna gəlincə, əsər müqəddimə, sultan, şahzadə və əsl şairlər olmaqla 3 fəsildən ibarətdir. I və II fəsildəki padşah və şahzadələr xronoloji prinsipə, III fəsildəki şairlər isə əlifba sırasına uyğun sıralanmışlar. Təzkirənin I fəslində 6 padşahdan, II fəslində 5 şahzadədən, III fəsildə isə 627 nəfər şairlərdən bəhs olunmuşdur. Qınalızadə təzkirəsinin 600-dən artıq şairi əhatə etməsini nəzərə alsaq, bu əsəri türk təzkirəçiliyi tarixində ən iri həcmli təzkirələrdən hesab etmək olar. Təzkirə ağır, çətin üslubda qələmə alınmışdır.

XVI əsrdə Osmanlı sahəsində təzkirə tərtib etmiş digər bir təzkirəçi ***Mustafa Bəyani***dir. Bəyani ədəbi mühitdə "Təzkirətüş-şüəra"sı (h.1006/1597) ilə tanınmışdır[110]. Təzkirə müqəddimə və iki bölmədən ibarətdir. ***"Təzkirətüş-şüəra"***nın birinci bölməsində 5 padşah və 4 şahzadədən bəhs olunmuşdur. Əsərin ikinci bölməsində isə XV-XVI əsrdə yaşamış 377 nəfər şairə yer verilmişdir. Bu əsər Qınalızadə təzkirəsinin xülasəsidir və müqəddimədən də məlum olduğu kimi, Bəyani, Qınalızadə təzkirəsini tamlıqla köçürə bilmədiyi üçün yalnız tanınmış şairləri seçib əsərinə daxil etmişdir. Bəyani əsərinə Qınalızadə təzkirəsində olmayan bəzi şairləri də əlavə etmişdir.

Türkiyə ədəbiyyatında XVII əsrdə də təzkirəçilik ənənəsi davam etmişdir. Bu əsərlər XVI əsrdə yazılmış təzkirələrin, demək olar ki, zeylidir və XVI əsrdə təməli qoyulan və bir-birinin ardınca qiymətli nümunələr verən Türkiyə təzkirəçiliyini fasiləsiz davam etdirən əsərlərdir. XVII əsr təzkirəçilərindən Riyazi, Faizi, Rza, Yümni, Asim və Güftinin adlarını çəkə bilərik.

---

[109] Kınalızade Hasan Çelebi. Tezkiretüş-şuara. / İ.Kutluk. C.I-II, Ankara: Türk Tarih Kurumu Basımevi, 1978 - 1989, 1094 s.

[110] Beyani Mustafa bin Carullah Tezkiretüş–şuara / eleştirmeli baskıya hazırlayan Dr. İ.Kutluk. Ankara: TDK, 1997, 90 + 345s.

XVII əsrdə də Osmanlı təzkirəçiləri təzkirəçilik ənənəsini davam etdirmişlər. Ancaq XVII əsr təzkirələri XVI əsrdə bu janrda tərtiblənmiş əsərlərdən müəyyən cəhətlərinə görə fərqlənmişdir. Belə ki, XVI əsr təzkirəçiləri öz dövrlərindən əvvəl yaşayan şairləri əsərlərində xatırlamışdılar. Bu səbəbdən təzkirələrdəki bio-biblioqrafik məlumat da çox geniş olurdu və bu təzkirələrin həcminə də təsir etmişdir. XVII əsr təzkirəçiləri isə daha çox öz dövrlərində yaşayıb-yaradan şairlərdən bəhs edir və bio-biblioqrafik məlumatı çox qısa verirdilər. Əvəzində isə şeirlərdən nümunələr artırılırdı. Beləliklə, qeyd olunan bu dəyişikliklər nəticəsində XVII əsrdən etibarən Osmanlı təzkirəçiliyi tarixində antologiya xarakterli təzkirələr tərtiblənməyə başladı.

***Riyazi*** təzkirəsi bu iki əsr arasında keçid dövrünün məhsuludur. Riyazi təzkirəsini h.1016/1607-ci ildə yazmağa başlayıb, h.1018/1609-cu ilin rəcəb ayında bitirdiyini əsərin sonunda yazdığı tarixdən öyrənirik. Təzkirə tərtiblənərkən daha əvvəl yazılmış təzkirələrdən istifadə edilmişdir. Əsər müqəddimə və 2 rövzədən ibarətdir. Təzkirədə ümumilikdə 424 şair haqqında məlumat verilmişdir. Riyazi özündən əvvəlki təzkirəçiləri tənqid etsə də, ikinci rövzədəki şairlər haqqında məlumat verərkən bu əsərlərdən bəhrələnmişdir. ***“Riyazüş-şüəra”*** XVII əsrin ən diqqətəlayiq təzkirəsidir. Əsərin ən önəmli cəhəti bütün şairlərin vəfat tarixlərini əks etdirməsindədir. Riyazi təzkirəsinə daxil etdiyi bütün şairlərin, demək olar ki, əsərlərinin hamısını nəzərdən keçirmiş və yalnız tərifə layiq olan şeirləri seçmişdir. Ancaq digər təzkirəçilər bu çətinliyi öz üzərlərinə götürməmişlər [111].

***Qafzadə Faizi*** (h.998/1589-h.1031/1622) ***“Zübdətül-əşar”*** adlı antologiya xarakterli təzkirəsi ilə tanınmışdır. Təzkirədə XV əsrin ortalarından başlayaraq, yazıldığı 1621-ci ilə qədər yaşamış 14-ü qadın olmaqla 515 nəfər şairdən bəhs edilmişdir. Bunlardan 57-si ancaq bu təzkirədə xatırlanmışdır. Əsərdə şairlər haqqındakı bio-biblioqrafik məlumat iki-üç cümlədən artıq deyildir. Faizi təz-

[111] Gibb V. Osmanlı şiir tarihi / terc. A.Çavuşoğlu. 3-4-5. c. Ankara: Akçağ, 1999, s. 149.

kirəsinə daxil etdiyi şairlərin vəfat tarixlərini verməyə diqqət yetirmiş, dəqiq bilmədiyi tarixləri isə şairlərin yaşadığı dövrü əks etdirən ifadələrdən istifadə etməklə vermişdir. Faizinin "Zübdətül-əşar"ı təzkirədən çox antologiyanı xatırladır.

Əsrin digər bir təzkirəçisi ***Zəhrimarzadə Rza***dır. Divan müəllifi olan Rza h.1050/1640-cı ildə təzkirəsini tamamlayıb, Sultan İbrahimə təqdim etmişdir. Təzkirə qısa bir ön söz, 2 fəsil və xatimədən ibarətdir. Təzkirəçi ön sözdə əsərinə əvvəlki dövr padşahları ilə yanaşı, h.1000/1591-ci ildən sonra yetişən şairləri daxil etdiyini yazır[112]. Təzkirənin "Zikri-şüərayi-səlatini-maziyyə" başlıqlı birinci bölməsində 9 şair padşahdan bəhs olunmuşdur. Onlardan hər birinin təxəllüsü, səltənət tarixləri və müddəti, şeirlərindən iki-üç beyt nümunə verilmişdir. Əsərin II bölməsində əlifba sırası ilə h.1000/1591-1050/1640-cı illər arasında yetişən 257 şair haqqında məlumat yer almışdır. Padşahlarla birlikdə təzkirədəki şair sayı 266-ya çatır.

Riyazi və Rza təzkirələrini qarşılaşdırdıqda məlum olur ki, bu iki əsər XVI əsr klassik təzkirələri ilə antologiya xarakteri daşıyan təzkirələr arasında yer almışdır.

XVII əsrdə tərtiblənmiş başqa bir təzkirənin müəllifi Yümnidir (?-1073/1662). O, Qafzadə Faizinin təzkirəsinə zeyl yazaraq "təzkirənevislər" sırasına düşmüşdür. ***Yümni***nin qələmə aldığı yeganə əsər ***"Təzkireyi-şüərayi-Yümni"*** adlı təzkirəsidir[113]. Təzkirə 1621-1622-ci illərdə yaşayıb-yaratmış 29 şairi əhatə edir. Əsər 1622-ci ildə təzkirəçinin vəfatı səbəbi ilə yarımçıq qalmışdır. Yümni şairlər haqqında bir-iki sətirlik çox qısa məlumat və şeirlərindən iki beytlə üç qəzəl arasında nümunə verir. Yümni təzkirəsi digər təzkirələrdə rast gəlmədiyimiz 11 nəfər şair haqqında məlumat verən ilkin mənbə kimi dəyərlidir.

---

[112] Zavotçu G. Rıza tezkiresi (inceleme-metin). İstanbul: 2009; Rıza. Tezkire-i Rıza, İstanbul: Dersaadat, 1316; Seyyid Riza Zehrimarzade. Riza tezkiresi / neşreden. Dr. S.Erdağı. Ankara: 2002, VII+109 s.

[113] Erdem S. Mehmet Salih Yumni-Tezkirei-şuarayi-Yümni // Türk dünyası araştırmaları, 1988 Ağustos, № 55, s.85 – 112.

Faizinin "Zübdətül-əşar"ına Yümnidən sonra ikinci zeyli ***Seyrəkzadə Mehmed Asim*** (?-1675) yazmış və əsərini ***"Zeyli-zübdətül-əşar"*** adı vermişdir. Əsər antologiya xarakterlidir. Təzkirəçi əsərinə h. 1030/1620-21-ci ildən ölümünə qədər 55 il ərzində yaşayıb-yaratmış şairləri toplamışdır. Asim əlifba sırasına görə verdiyi 123 şairdən sonra, əsərin Qafzadə Faizinin təzkirəsinə zeyl olduğunu və "Zeyli-zübdətül-əşar" adlandırdığını yazır. Antologiya xarakterli təzkirələr içərisində ən az məlumatı əhatə edib, ən çox nümunəni əks etdirən Asim təzkirəsidir.

XVII əsrin ikinci dərəcəli şairi hesab olunan ədirnəli ***Əli Güfti*** (?- h.1088/1677) orijinal əsərləri ilə diqqəti cəlb etmişdir. Güftinin 2400 beytdən ibarət olan ***"Təşrifatüş-şüəra"*** adlı təzkirəsi türk ədəbiyyatında nəzmlə qələmə alınmış yeganə təzkirədir[114]. Türk ədəbiyyatında Güftidən başqa heç bir təzkirəçi ***mənzum təzkirə*** qələmə almamışdır. Təzkirədə 106 şairdən bəhs olunmuşdur. Digər təzkirələrdə rast gəlmədiyimiz 25 şair haqqında məlumatı məhz bu əsərdən alırıq.

Prof. Dr. ***F.Kılıç*** apardığı araşdırmalara əsasən XVII əsr təzkirələrinin forma və məzmun baxımından XVI və XVIII əsr təzkirələrindən fərqli quruluşa malik olduğunu, lakin məlumatların verilmə sistemində, istifadə olunan terminologiyada fərqlilik təsbit edilmədiyini yazır. Alim XVI və XVIII əsr təzkirələrinin həcm etibarilə XVII əsrdən daha böyük olduğundan bunlarda istifadə olunan terminlərin çox və çeşidli olduğunu vurğulayır[115].

XVIII əsrdə də Osmanlı ədəbiyyatında təcrübəli təzkirəçilər yetişmişdir. ***Mustafa Mücib əfəndi*** XVIII əsrin ilk təzkirəçisidir. O, gəncliyində şairlərin şeirlərindən ibarət məcmuə tərtibləmiş, daha sonra əsəri genişləndirərək, h. 1120/1710-cu ildə təzkirəsini yaratmışdır. Təzkirəsinə qısa bir giriş və IV Muradın bioqrafiyası ilə başlayan Mücib Əfəndi, əvvəlki təzkirəçilər kimi sultanları, müəyyən məslək sahiblərini bir qrupda sistemləşdirməyərək, sadəcə

---

[114] Güfti ve Teşrifatüş-şuarası / hazır.: K.Yılmaz. - Ankara: 2001, 300 s.

[115] Kılıç F. XVII. yüzyıl tezkirelerinde şair ve eser üzerine değerlendirmeler. Ankara, 1998, s. 353.

müasiri olan şairləri əlifba sırası ilə vermişdir. Təzkirə XVI əsrin sonlarından başlayaraq müəllifin çağdaşı olan şairlərdən 107 nəfəri əhatə edir[116].

Dövrünün tanınmış təzkirəçilərindən biri də Mustafa Səfayidir. Səfayi, Rza təzkirəsinin qaldığı 1640-cı ildən öz dövrünə qədər yetişən şairləri təzkirəsinə daxil etmişdir. Onun h.1132/ 1720-ci ildə tamamladığı "Nüxbətül-əsar min fəvaidil-əşar" bir ön söz, on səkkiz təqriz (rəy) və əlifba sırası ilə 476 nəfər şair haqqında verilən bilgilərdən ibarətdir[117]. Müəllif təzkirəsini dövrünün sədrəzəmi Damad İbrahim paşaya təqdim etmişdir. Səfayi təzkirəsini tamamladıqdan sonra dövrünün tanınmış on səkkiz elm adamına göstərib, onlardan əsər haqqında rəy almışdır və həmin rəyləri əsərin əvvəlinə əlavə etmişdir. Təzkirəçilik tarixində Səfayiyə qədər belə bir ənənəyə rast gəlinməmişdir. Səfvət Əfəndi XVIII əsrin sonlarında Səfayi təzkirəsini qısaldaraq yeni bir təzkirə tərtibləmişdir [118].

Salim adlı təzkirəçi h.1134/1722-ci ildə təzkirəsini tamamlamışdır[119]. Giriş və iki fəsildən ibarət olan təzkirədə 428 şairdən bəhs olunmuşdur. Bursalı İsmayıl Bəliğ h.1139/1727-ci ildə tamamladığı "Nüxbətül-əsar li zeyli-Zübdətül-əşar" adlı əsərini Qafzadə Faizinin "Zübdətül-əşar"ına zeyl yazmışdır[120]. "Ədəbi-zürəfa" müəllifi Hüseyn Ramizin h.1198/1784-cü ildə tamamladığı və "Ramiz təzkirəsi" kimi məşhurlaşan əsəri h.1132/1720-h.1198/ 1784-cü illər arasında yaşayıb-yaratmış 375 şair haqqında məlumat verir[121]. XVIII əsrin ikinci yarısında yaşayan Silahzadə Mehmed Əminin h.1204/1790-cı ildə sistemsiz şəkildə tərtiblədiyi "Təz-

---

116 Mücib Mustafa. Tezkire-i Mücib. Ankara, 1997, 84 s.

117 Mustafa Safayi Efendi. Tezkire-i Safayi / haz.: P.Çapan. Ankara: 2005, 750 s.

118 İsen M., Kılıc F., Aksoyak İ., Eyduran A. Şair tezkireleri, Ankara, 2002, s. 106.

119 Salim Efendi. Tezkiretüş-şüara. İnceleme-metin / haz: A.İnce. Ankara: 2005, 756 s.

120 İsmail Beliğ. Nuhbetül-asar li-zeyli Zübdetil-eşar. Ankara, 1985, XXII +718 s.

121 Ramiz ve Adab-ı Zurafası. Ankara, 1994, XLVII+401 s.

kirətüş-şüəra"sı h.1164/1751-h.1204/1790-cı illər arasında yaşayan 127 şairin həyat və yaradıcılığını əhatə edir. Bu təzkirə Bəliğ təzkirəsinin zeylidir. Əsl adı Səfvət olub, Kəmiksizzadə kimi tanınan XVIII əsr təzkirəçisi h.1197/1783-cü ildə Səfayi təzkirəsini ixtisar edərək təzkirə tərtibləmişdir. Bu təzkirə Səfayi təzkirəsinin əvvəlindəki rəylərin qısaldılmış şəklindən, həmin əsərdən seçilmiş 326 şair haqqında məlumatdan və sona əlavə olunmuş "Teyzil-kitab" hissəsindən ibarətdir.

XVIII əsrdə mövləvilər arasında tanınmış şairlərdən biri Əsrar Dədədir. Onun tərtiblədiyi "Təzkireyi-şüərayi mövləviyyə" h.1211/1797-ci ilə qədər yaşayan 212 mövləvi şairi əhatə edir[122]. Əndərunlu Akif isə "Miratüş-şeir" adlı təzkirə tərtibləmişdir [123].

XVIII əsr təzkirələri üzərində araşdırma aparmış Prof.Dr. P.Çapan bu əsərləri aşağıdakı şəkildə xarakterizə edir: "XVIII. yüzyıl tezkirelerinin iddia edilenin aksine, bir özentiden ziyade ananenin gelişip olgunlaşmasının ürünü oldukları kanaatindeyiz"[124].

XIX əsrdə Osmanlı ədəbiyyatında təzkirəçilik əvvəlki əhəmiyyətini itirməyə başlamışdı. Bu əsrin ilk təzkirəçisi Seyid Əbdülfəttah Şəfqətdir. Onun h. 1229/1814-cü ildə yazdığı "Təzkirətüş-şüəra" 1730-1814-cü illər arasında yetişmiş 125 şair haqqında məlumatı əhatə edir.

Əsəd Əfəndinin h. 1251/1835-ci ildə qələmə aldığı "Bağçeyisəfa-ənduz" adlı təzkirəsində h.1135/1722–1251/1835-ci illərdə yaşayıb yaradan 209 şairdən bəhs olunmuşdur. Əsər Salim təzkirəsinə zeyl olaraq yazılmışdır.

Dövrünün tanınmış alimi və şeyxülislamı olan Arif Hikmətin tərtib etdiyi təzkirə h. 1000/1592 - 1252/1837-ci illərdə həm Osmanlı ölkəsində, həm də Azərbaycanda, Krımda yaşayıb-yaratmış 203 şair haqqında məlumatı əhatə edir. Əsərin dövrümüzə gəlib

---

[122] Esrar Dede. Tezkire-i Şuara-yi Mevleviye. Ankara, 2000, VI+596 s.
[123] İsen M., Kılıc F., Aksoyak İ., Eyduran A. Şair tezkireleri. Ankara, 2002, s.129.
[124] Çapan P. 18. yy. tezkirelerinde edebiyat araştırma ve eleştirisi. Fırat Üniversitesi, SBE, yayımlanmamış doktora tezi. Elazığ, 1993, s. 541.

çatmış yeganə nüsxəsi Millət Kitabxanası Əli Əmiri bölümündə 789 şifrəsi ilə mühafizə olunmaqdadır.

XIX əsr şairi Fatin Əfəndinin (1814-1866) qələmə aldığı "Xatimətül-əşar" adlı təzkirəsində h.1134/1721-ci ildən h.1269/ 1853-cü ilə qədər yetişən 683 nəfər şair haqqında məlumat vermişdir[125]. Əsər Salim və Səfayi təzkirəsinə zeyl olaraq yazılmışdır. Əsərin əvvəlində təzkirənin tamamlandığına dair beş təqriz və altı tarix yer almışdır. Təzkirədə şairlər təxəllüslərinə görə deyil, adlarına görə əlifba prinsipi əsasında sıralanmışdır. "Xatimətül-əşar"ın digər təzkirələrdən fərqləndirən cəhəti əsərlərdən nümunələrin əvvəldə, tərcümeyi-halların isə ondan sonra verilməsidir.

XX əsrdə yazılan təzkirələrdən birincisi "Təzkireyi-şüərayi-Amid"dir. Əli Əmiri tərəfindən qələmə alınan bu təzkirə Diyarbəkrdə yetişən 73 şair haqqında məlumat verir.

Ədəbiyyat tarixçisi və tədqiqatçısı Mahmud Kamal İnalın "Kamalüş-şüəra" adlı əsəri Fatin təzkirəsinə zeyl olaraq yazılmışdır. Əsər 1800-1941-ci illər arasında yaşayıb-yaratmış 556 nəfər şairin tərcümeyi-halını və əsərlərindən örnəkləri əhatə etməkdədir. İndiyə kimi əsərin dörd cildi nəşr olunmuşdur[126]. Sadəcə beşinci cild işıq üzü görməmişdir. Bu təzkirə XIX əsr mühacir Azərbaycan şairləri haqqında məlumatı əhatə etməsi baxımından önəmli yerə sahibdir[127].

Sonuncu Türkiyə təzkirəçisi Naili Tumandır. O, "Töhfeyi-Naili" adlı təzkirəsini 1949-cu ildə tamamlamışdır. Bu əsəri "təzkirələr təzkirəsi" də adlandırmaq olar. Çünki Nail Tuman digər təzkirələrdəki məlumatları bir yerə toplayaraq təzkirə tərtibləmişdir.

---

[125] Fatîn Davud - Hâtimetü'l-Eş'ar. T.C. Kültür ve Turizm Bakanlığı Yay. (e-kitap), Ankara; Fatin Davud. Xatimətül-əşar. İstanbul, 1271.

[126] İnal İbnül-Emin Mahmud Kemal. Son asır Türk şairleri (Kemalüş-şuara) 4 cildde. 1. c. Haz: M. Cunbur. Ankara: 1999, X+678 s.; 2.c., haz: M.Kayahan Özgül. Ankara: 2000, 544 s.; 3. c., haz: H.Özcan. Ankara: 2000, VII+493 s.; 4. c., haz: İ.Baştuğ. Ankara: 2002, VIII+490 s.

[127] Musalı V. Mahmud Kamal İnal təzkirəsində azərbaycanlı şairlər / "Azərbaycan dünya ədəbiyyatında" Beynəlxalq simpoziumun materialları. Bakı, 2012, s. 629-637.

Osmanlı təzkirələri XV-XX əsrlərdə Türkiyəyə müxtəlif səbəblərlə mühacirət etmiş Azərbaycan ədəbiyyatı nümayəndələrinin həyat və yaradıcılığını, eləcə də Azərbaycan mühacirət ədəbiyyatının qeyd olunun bölümünü araşdırmaq üçün mühüm qaynaqlardandır.

## 3.2. AZƏRBAYCAN VƏ OSMANLI TƏZKİRƏLƏRİNİN FƏRQLİ VƏ OXŞAR XÜSUSİYYƏTLƏRİ

Yrd. Doç. Dr. Ö.Bayram Azərbaycan və Türkiyə ədəbiyyatları arasındakı əlaqə və oxşarlıqdan bəhs edərkən yazır: *"Azerbaycan ve Anadolu sahası Türk edebiyatları bir ağacın iki kolu gibidir. Bu kollar, asırlarca birlikte geliştikten sonra günümüzden beş yüz yıl kadar önce iki dala ayrılarak paralel bir şekilde gelişmeye devam etmiştir. Tabii bu ağacın kökü ve kaynakları aynı olduğu için dallar arasında pek çok benzer nokta bulunmaktadır... Aynı millete mensup bu iki kardeş ülkenin edebiyatları, İslam tesiri altında gelişen Türk edebiyatı döneminde farklı iki kola ayrılmıştır"*[128].

Azərbaycan və Osmanlı təzkirələrini müqayisə etdikdə bəzi oxşar və fərqli cəhətlərin olduğu üzə çıxır. Bu oxşar və fərqli xüsusiyyətləri aşağıdakı maddələrlə təqdim etmək mümkündür[129]:

- Təzkirələrin yazılma dinamikası baxımından müqayisə;
- Təzkirələrin strukturundakı oxşarlıqlar və fərqlər;

---

[128] Bayram Ö. Azerbaycan sahası tezkireleri ve Seyid Azim Şirvaninin tezkiresi. – Doktora Tezi. Gazi Üniversitesi, Ankara, 2005. s. IV.

[129] Musalı V. Azərbaycan və Osmanlı təzkirələrinin fərqli və oxşar xüsusiyyətləri // Akademik V.Məmmədəliyevin yubileyinə həsr olunmuş "Şərqşünaslığın aktual problemləri" mövzusunda Respublika elmi konfransının materialları, Bakı, 2012, s.179-181.

- Təzkirələrin əhatə etdiyi coğrafiya və dil nöqteyi-nəzərindən uyğunluqlar və fərqlər;
- Müəllifliklə bağlı fərqlər.

### *Təzkirələrin yazılma dinamikası*

Təzkirəçilik tarixinə nəzər salsaq görəcəyik ki, həm Azərbaycan, həm də Osmanlı təzkirəçiləri əsərlərini Herat təzkirəçilik məktəbinin tanınmış nümayəndələri Əlişir Nəvai və Dövlətşah Səmərqəndinin təzkirələrinin təsiri ilə qələmə almışlar. Sonradan Azərbaycan və Osmanlı təzkirələrinin tərtibində, strukturunda və s. özünəməxsus dəyişikliklər aparıldığı müşahidə olunur.

Azərbaycan təzkirəçiləri say etibarilə Osmanlı təzkirəçilərindən daha çox əsər qələmə almışlar. 41 Azərbaycan təzkirəçisi 46 təzkirə tərtibləmişdir. Osmanlı təzkirələrinin sayı isə 32-dir. Azərbaycan və Osmanlı təzkirələrinin yazılma dinamikasını izləmək üçün aşağıdakı cədvələ nəzər salaq:

| **Əsr** | **Azərbaycan təzkirələri** | **Osmanlı təzkirələri** |
|---|---|---|
| XVI əsr | 1. Sam Mirzə "Töhfeyi-Sami"<br>2. Əhdi Bağdadi "Gülşəni-şüəra"<br>3. İbrahim mirzə "Fərhəngi-İbrahim"<br>4. Tövfi Təbrizi "Təzkireyi-Tövfi" | 1. Qəribi "Təzkireyi-məcalisi-şüərayi-Rum"<br>2. Səhi bəy "Həşt behişt"<br>3. Lətifi "Təzkirətüş-şüəra"<br>4. Aşiq Çələbi "Məşairüş-şüəra"<br>5. Həsən Çələbi "Təzkirətüş-şüəra"<br>6. Bəyani "Təzkirətüş-şüəra" |
| XVII əsr | 1. Sadiq bəy Əfşar "Məcməül-xəvas"<br>2. Nazim Təbrizi "Nəzmi-güzidə" | 1. Riyazi "Riyazüş-şüəra"<br>2. Faizi "Zübdətül-əşar"<br>3. Rza "Təzkirətüş-şüəra"<br>4. Yümni "Təzkirətüş-şüəra"<br>5. Asim "Zeyli-Zübdətül-əşar"<br>6. Güfti "Təşrifatüş-şüəra" |
| XVIII əsr | 1. Əliqulu xan Valeh "Riyazüş-şüəra"<br>2. Lütfəli bəy Azər "Atəşkədə"<br>3. İshaq bəy Üzri "Təzkireyi-İshaq"<br>4. Əbu Talib xan Təbrizi "Xülasətül- | 1. Mucib "Təzkirətüş-şüəra"<br>2. Səfayi "Təzkirətüş-şüəra"<br>3. Salim "Təzkirətüş-şüəra"<br>4. Bəliğ "Nüxbətül-asar li zeyli zübdətül- |

| | | |
|---|---|---|
| | əfkar"<br>5. Sultan Məhəmməd mirzə Bahadır xan Səfəvi "Töhfətüş-şüəra" | əşar"<br>5. Safvət "Nüxbətül-asar fi Fəvaidil-əşar"<br>6. Ramiz "Adabi-zürəfa"<br>7. Silahdarzadə "Təzkirətüş-şüəra"<br>8. Əsrar Dədə "Təzkireyi-şüərayi-mövləviyyə"<br>9. Akif "Mirati-şeir" |
| XIX | 1. Əbdürrəzzaq bəy Dünbüli "Təcrübətül-əhrar və təsliyyətül əbrar"; "Hədayiqül-üdəba"; "Nigaristani-Dara"<br>2. Məhəmməd Fazil xan Gorusi Ravi "Əncüməni-xaqan"<br>3. Mahmud mirzə Qacar. "Gülşəni-Mahmud"; "Bəyanül-Mahmud"; "Nüqli-məclis"<br>4. Bəhmən mirzə "Təzkireyi-Məhəmmədşahi"<br>5. Məhəmməd Saleh Şamlu "Məhəküş-şüəra"<br>6. Hülaku mirzə Qacar "Xərabat"<br>7. Xudaverdi xan Qacar "Təzkireyi-mədayihi-Elxaniyyə"<br>8. Məhəmməd Bağır xan Qacar "Fələkül-Mərrix"<br>9. Məhəmmədhəsən xan Etimadüs-səltənə "Xeyrati-hesan"<br>10. Heydərqulu mirzə "Təzkireyi-Xavər"<br>11. Məhəmmədqulu mirzə Qacar "Təzkireyi-Xosrovi"<br>12. Seyfüddövlə Sultan Məhəmməd Tağı "Bəzmi-xaqan"<br>13. Seyid Əzim Şirvani "Təzkirə"<br>14. Məhəmməd Kazım Əsrar Əlişah Təbrizi "Behcətüş-şüəra"<br>15. Əli Rza mirzə Qacar "Bosatinül-xaqaniyyə"<br>16. Ziyai "Təzkireyi-Ziyai"<br>17. Mir Möhsün Nəvvab "Təzkireyi-Nəvvab"<br>18. Əbülqasım Möhtəşəm Şirvani "Əxtəri-taban" | 1. Şəfqət "Təzkireyi-şüəra"<br>2. Əsad Əfəndi "Bağşeyi-səfa-ənduz"<br>3. Arf Hikmət "Təzkirətüş-şüəra"<br>4. Fatin "Xatimətül-əşar"<br>5. Tevfiq "Məcmueyi-təracim"<br>6. Məhəmməd Tevfiq "Qafileyi-şüəra" |
| | 1. Məhəmməd ağa Müctəhidzadə "Riyazül-aşiqin"<br>2. Həsənəli xan Qaradaği "Təzkireyi-Qaradaği"<br>3. İbrahim Tahir "Riyazül-arifin" | 1. Faiq Rəşad "Əslaf"<br>2. Məhəmməd Siracəddin "Məcmueyi-şüəra"<br>3. Əli Əmiri "Təzkireyi-şüərayi-Amid"<br>4. Mahmud Kamal İnal "Kamalüş-şüəra" |

| | | |
|---|---|---|
| XX əsr | 4. Şəmsəddin xan Həqqi Təbrizi "Əncümənül-üdəba"<br>5. Məhəmmədəli Tərbiyət "Danişməndani-Azərbaycan"<br>6. Qulam Məmmədli "Təzkirə"<br>7. Seyid Əbdülhəmid Xalxali "Təzkireyi-şüərayi-müasiri-İran"<br>8. Əziz Dövlətabadi "Süxənvərani-Azərbaycan"; "Sərayendeqani-şeri-parsi dər Qəfqaz"<br>9. Əli Nəzmi "Devist süxənvər"<br>10. Yəhya Şeyda "Ədəbiyyat ocağı"<br>11. Məhəmməd Deyhim "Təzkireyi-şüərayi-Azərbaycan" | 5. Nail Tuman "Töhfeyi-Naili" |
| XXI | 1. Şahin Fazil "Təzkireyi-Şahin" | - |

XVI əsr təzkirələrini nəzərdən keçirdiyimiz zaman məlum olur ki, Osmanlı təzkirəçiləri bu janrda 6 əsər qələmə almışlar. Azərbaycan təzkirəçiləri isə cəmi 4 təzkirə tərtibləmişlər. Bu təzkirələrdən ikisi zamanımıza gəlib çatmamışdır.

XVII əsrdə də Osmanlı sahəsində say artımı müşahidə olunur. Osmanlı müəlliflər 6, azərbaycanlılar isə 2 təzkirə hazırlamışlar.

XVIII əsrdə də Osmanlı təzkirəçiliyi inkişaf etmiş və 9 təzkirə qələmə alınmışdır. Azərbaycan təzkirəçiləri isə 5 təzkirə yazmışlar.

Azərbaycan və Osmanlı təzkirələrinin yazılma dinamikası arasında XIX əsrdə çox ciddi fərq müşahidə olunmaqdadır. Bu əsrdə yazılmış Azərbaycan təzkirələrinin sayı 22-yə çatmışdır. Osmanlı təzkirəçiləri isə 6 təzkirə tərtibləmişlər.

XX əsrdə də Azərbaycan təzkirələrinin sayı 12-yə çatmışdır. Osmanlı təzkirələrinin sayı isə 5-dir.

Beləliklə, apardığımız araşdırmalardan nəticə çıxararaq deyə bilərik ki, Osmanlı təzkirəçiliyi say baxımından kuliminasiya nöqtəsinə XVIII əsrdə çatmışdır. Azərbaycan təzkirəçiliyində isə say-artımının maksimum həddi XIX əsrə təsadüf edir.

Azərbaycan müəlliflərinin təzkirələrinin əlyazma nüsxələrini araşdırarkən məlum olmuşdur ki, XVI əsr Osmanlı təzkirəçisi Cərullah Bəyani h.975/1567-ci ildə Sam mirzə təzkirəsini köçürmüşdür. Bu Əlyazma AMEA Əlyazmalar İnstitutunda B – 5119 şifrəsi ilə saxlanmaqdadır. Ancaq Bəyani öz təzkirəsində bu əsərin adını çəkməmişdir. Halbuki Bəyaninin təzkirəsi (h.1006/1597) Qınalızadə Həsən Çələbinin "Təzkirətüş-şüəra"sının xülasəsi mahiyyətindədir. Məlum olduğu kimi bu əsərdə bəzi Azərbaycan şairləri haqqında da məlumat yer almaqdadır. Bəyani Sam mirzə təzkirəsindən istifadə edərək Həsən Çələbinin öz təzkirəsində xatırlamadığı şairlər haqqındakı informasiyaları əsərinə daxil etməklə təzkirəsinə orijinallıq qazandıra bilərdi. Bizcə bunun əsas səbəbi Bəyaninin öz təzkirəsində Osmanlıların rəqibi olan Səfəvilər sülaləsi şahzadəsinin yazdığı təzkirədəki bilgilərə və ümumiyyətlə Səfəvi şairləri haqqında məlumatlara yer verməmək istəyi olmuşdur.

Qeyd edək ki, Bəyaninin Sam mirzənin təzkirəsini köçürməsi faktı Azərbaycan və Osmanlı təzkirələri arasındakı əlaqələrin maraqlı və diqqətəlayiq bir məqamıdır[130].

## *Təzkirələrin strukturundakı oxşarlıqlar və fərqlər*

İlk Azərbaycan və Osmanlı təzkirəçiləri Herat təzkirəçilik məktəbinin nümunələrini təsiri altında öz əsərlərini qələmə almışlar. Nümunə üçün XVI əsr Osmanlı təzkirəçisi Səhi bəyin "Həşt-behişt" və XVI əsr təzkirəçisi Sam mirzənin "Töhfeyi-Sami"sinin strukturunun müqayisəsinə nəzər salaq:

| **"Töhfeyi-Sami"** | **"Həşt-behişt"** |
|---|---|
| 1. Şah nəslindən olan şairlər | 1. Qanuni Sultan Süleyman |
| 2. Seyyid və alim nəslindən olan şairlər | 2. Qanuni dövrünə qədər şeir yazmış padşah və şahzadələr |
| 3. Peşəkar şair olmayıb, bəzən şeir söylə- | 3. Vəzir, qazıəsgər, dəftərdar, nişançı, |

[130] Yenə orada, s. 97.

| | |
|---|---|
| yənlər | bəylərbəyi kimi dövlət adamları |
| 4. Vəzirlər və şeir yazan başqa qələm sahibləri | 4. Bilgin şairlər |
| 5. Əsl şairlər və yüksək qələm sahibləri | 5. Səhidən öncə yaşamış və vəfat etmiş şairlər |
| 6. Türk təbəqəsi və onların ən böyük şairləri | 6.Səhinin gəncliyində tanınmış və şəxsən görüşdüyü şairlər |
| 7. Xalq təbəqəsindən olan digər şairlər | 7. Əsərin yazıldığı tarixdə həyatda olan şairlər |
| 8. - | 8. Yeni şairlər |

Osmanlı təzkirəçiləri Kastamonolu Lətifinin təzkirəsindən sonra əsərlərini əlifba prinsipi əsasında tərtibləmişlər. Yəni təbəqə üsulu öz aktuallığını itirmişdir. Azərbaycanlı müəlliflər isə, demək olar ki, XIX əsrə qədər təbəqə üsulundan istifadə etmişlər. Təbii ki, başqa tərtib tərzləri də mövcud olmuşdur.

XVI əsr Osmanlı təzkirəçisi Aşiq Çələbi ilk dəfə olaraq əsərində şairləri əbcəd hərfləri əsasında sıralamışdır. XVII əsr müəllifi Güfti isə türk ədəbiyyatında yeganə mənzum təzkirəsi ilə məşhurlaşmışdır. Azərbaycan təzkirəçiləri bu strukturda və səpkidə əsər tərtibləməmişlər.

Osmanlı təzkirəçilərindən Əsrar Dədə və Akif mənsub olduqları çevrənin şairləri haqqında təzkirə tərtibləmişlər. Əsrar Dədə əsərində mövləvi şairlər, Akif isə əndərun (saray) şairləri haqqında məlumat verib əsərlərindən örnəkləri əhatə edən təzkirə qələmə almışlar. Prof.Dr. F.Kılıç bu əsərləri "zümrə təzkirələri" adlandırır[131].

Fətəli şahın oğlu Mahmud mirzə Qacarın h.1236/1820-21-ci ildə qələmə aldığı və Qacarlar xanədanının mənsubu olan şairlərə həsr edilmiş "Gülşəni-Mahmud" adlı ailə təzkirəsini də "zümrə təzkirəsi" adlandıra bilərik.

[131] Kılıç F. Edebiyat tarihimizin vazgeçilmez kaynakları: şair tezkireleri. s. 9.

Azərbaycan təzkirəçiləri sadəcə qadınlara həsr olunmuş təzkirə də qələmə almışlar. Belə ki, Mahmud mirzə Qacar h.1241/1825-ci ildə qadın şairlərdən bəhs edən "Nüqli-məclis" adlı təzkirə tərtib etmişdir.

Azərbaycan təzkirələrinin strukturu Osmanlı təzkirələri ilə müqayisədə daha mürəkkəb və rəngarəngdir. Azərbaycan təzkirələri təbəqə, əlifba, coğrafi prinsip, ədəbi nümunələrin janrları əsasında tərtiblənmişdir. Bunlardan əlavə sistemsiz yazılmış təzkirələrə də rast gəlmək mümkündür.

Azərbaycan təzkirəçiləri şairlərin əsərlərindən nümunələri də özünəməxsus şəkildə seçmişlər. Məsələn, XVII əsr təzkirəçisi Nazim Təbrizi "Nəzmi-güzidə" adlı əsərinə yalnız qəzəl və rübailərdən nümunə vermişdir.

XVIII əsr təzkirəçiləri Salim və Səfayinin əsərlərinin əvvəlində təzkirəyə dair müxtəlif şəxslərdən alınmış "təqriz"lərə yer verilmişdir ki, bu ənənəyə Azərbaycan təzkirələrində rast gəlməmişik.

Mir Möhsün Nəvvabın və Yəhya Şeydanın təzkirəsində şairlərin avtoqraf tərcümeyi-halları və əsərlərindən nümunələr verilmişdir ki, bu da Osmanlı təzkirələrində görmədiyimiz yenilikdir.

### *Təzkirələrin əhatə etdiyi coğrafiya və dil nöqteyi-nəzərindən uyğunluqlar və fərqlər*

Azərbaycanlı müəlliflərin təzkirələrinin böyük qismi fars dilindədir. Osmanlı təzkirəçiləri isə əsərlərini türkçə qələmə almışlar.

Osmanlı təzkirələrinin böyük əksəriyyəti Osmanlı ölkəsində yaşayan və ya buraya mühacirət etmiş müxtəlif xalqların nümayəndələrindən olan şairləri əhatə etməkdədir. Ancaq Azərbaycan təzkirələrinin çox hissəsinin daha geniş zaman və coğrafi arealı özündə əks etdirdiyini görürük. Məsələn, Sadiq bəy Əfşar, Əliqulu xan Valeh, Lütfəli bəy Azər, Seyid Əzim Şirvani və b.

XVI əsrdən XX əsrə qədər yazılmış Osmanlı təzkirələrində təxminən 60 Azərbaycan şairi haqqında bio-biblioqrafik məlumat və əsərlərindən örnəklər verilmişdir. Bu şairlərdən yarıya qədəri ilk dəfə məhz osmanlı təzkirəçiləri tərəfindən yad edilmişdir və Azərbaycan ədəbiyyatının araşdırılmamış səhifələrini təşkil etməkdədir[132].

Azərbaycan təzkirələrində də Osmanlı şairləri xatırlanmışdır. Məsələn, Sadiqinin "Məcməül-xəvas"ında (Sultan Süleyman, Necati Rumi, Baqi Çələbi), Hülaku mirzə Qacarın "Xərabat"ında (Qalib Əfəndi Osmanlı, Zehni Osmanlı, Ruhi Osmanlı, İbrahim Əfəndi, Bağdad vəziri Əlirza paşa, Pərtöv paşa, Raşid Əfəndi, Kamal Əfəndi Osmanlı, Nədim), Seyid Əzim Şirvaninin "Təzkirə"sində (Nabi, Fayizi Rumi, Fövzi Əfəndi Rumi, İzzət Rumi, Vəcdi bəy Rumi, Fazil Rumi, Hüsni Çələbi, Vəsli Rumi, Fitnət xanım Rumi, Dərviş Əfəndi Rumi, İffət, Nisari və b.) Osmanlı şairlərinin bəziləri haqqında bilgi verilmiş və əsərlərindən nümunələr təqdim olunmuşdur.

### *Müəlliflikla bağlı bənzərliklər və fərqlər*

Azərbaycan təzkirələrinin bəzilərinin müəllifləri şahzadələrdir. Məsələn, Sam mirzə, Bəhmən mirzə, Hülaku mirzə Qacar, Məhəmməd Bağır xan Qacar, Mahmud mirzə Qacar, Heydərqulu mirzə, Məhəmmədqulu mirzə, Seyfüddövlə Sultan Məhəmməd Tağı. Osmanlı təzkirəçiliyində şahzadələrin təzkirə yazmasına rast gəlməmişik.

Azərbaycanda təzkirə yazmaq ailə ənənəsinə çevrilmişdir. Belə ki, Fətəli şahın övladlarının bir neçəsi təzkirə tərtibləmişlər.

Azərbaycan təzkirəçilərindən bəziləri bir deyil, iki-üç təzkirə tərtibləmişlər ki, buna da Osmanlı təzkirəçiliyində rast gəlmirik. Məsələn, XIX əsr Azərbaycan təzkirəçiləri Əbdürrəzzaq bəy Dün-

[132] Musalı V., Musalı N. Osmanlı tezkirelerine göre Azerbaycan edebiyatının araştırılmamış sayfaları // Klasik Türk edebiyatında biyografi. Bildiriler, Ankara, Atatürk Kültür Merkezi Başkanlığı Yayınları, 2011, s. 501-522.

büli Azərbaycani "Təcrübətül-əhrar və təsliyyətül əbrar", "Nigaristani-Dara", "Hədayiqül-üdəba" adlı üç, Mahmud mirzə Qacar isə "Gülşəni-Mahmud", "Bəyanül-Mahmid" və "Nüqli-məclis" adlı üç təzkirə qələmə almışlar.

Azərbaycan təzkirələrinin bəzisi hökmdarların göstərişi ilə yazılmışdır. Nazim Təbrizi təzkirəsini Səfəvi hökmdarı I Şah Abbasın göstərişi ilə yazdığını bildirir. Əbdürrəzzaq bəy Dünbüli Azərbaycani h. 1241/1825-ci ildə "Nigaristani-Dara" adlı təzkirəsini Azərbaycan hakimi Abbas mirzə Qacarın göstərişi əsasında yazmışdır. Osmanlı təzkirəçiləri isə yazdıqları əsərlərini dövrlərinin sultanlarına və b. dövlət adamlarına təqdim edərək əvəzində mənsəb və ya sərvət əldə etmişlər. Məsələn, Səhi bəy və Lətifi öz təzkirələrini Qanuni Sultan Süleymana, Aşiq Çələbi II Səlimə, Qınalızadə Həsən Çələbi Xoca Sadəddin Əfəndiyə, Riyazi II Əhmədə, Rza isə Sultan İbrahimə təqdim etmişdir.

Apardığımız araşdırmalar nəticəsində Azərbaycan və Osmanlı təzkirələri arasında fərqliliklərin daha çox olduğunu müəyyən etdik.

# IV FƏSİL

# AZƏRBAYCAN TƏZKİRƏÇİLİYİNİN İNKİŞAF MƏRHƏLƏLƏRİ

4.1. XVI əsr

4.2. XVII əsr

4.3. XVIII əsr

4.4. XIX əsr

4.5. XX əsr

4.6. XXI əsr



لله الحمد قبل کل کلام ٭ بصفات الجلال و الاکرام
حمد او تاج تارک سخن است ٭ مصدر هر نامهٔ نو و کهن است
خامه چون تاج نامه آراید ٭ درة التاج نام او شاید
سر غزل دیوان فصاحت بیانان قافیه سنجان معجز طراز و حسن
مطلع طوطی صفتان شیرین کلام سحر پرداز حمد ناظمیست که نظم
سلسلهٔ مکونات از اشعهٔ قدرت او قصیده ایست مطلعش منور
بکواکب ثواقب نور محمدی که اول ما خلق الله نوری اشارتیست
بران و مقطعش مزین بحلی اجلال خاتم نبوت احمدی که ولکن رسول الله
وخاتم النبیین کنایتیست ازان ٭ نعت کمال اجلالش شمسهٔ دیوان
بهارستان فصحای بلاغت انتما و منقبت آل کثیر النوالش سرلوحهٔ
تذکرهٔ شعرای فصاحت لوا ٭ اعنی آن صدر نشینان مجالس نفایس
قدس و نفحات شمایم انس ٭ جامی لیس کلامی یفی بنعت کماله
صلی الهی علی النبی و آله ٭ نثر صلی اللهم و بارک علیه و ارزقنا درجه

**Sam mirzə. "Töhfeyi-Sami"**
**AMEA Əlyazmalar İnstitutu B-5119**

# SAM MİRZƏ SƏFƏVİ

Azərbaycan ədəbiyyatında ilk təzkirə Şah İsmayıl Xətainin oğlu Sam mirzə Səfəvi tərəfindən farsca qələmə alınmışdır. Çox təəssüf ki, bu Səfəvi şahzadəsinin nə həyatı, nə də təzkirəsi Azərbaycanda indiyə kimi geniş şəkildə tədqiqata cəlb olunmamışdır. İlkin olaraq bu sətirlərin müəllifi tərəfindən Sam mirzənin həyatı ayrı-ayrı mənbələrə səpələnmiş məlumatlar əsasında öyrənilmişdir. Şah İsmayılın oğlu olan Sam mirzənin həyatı haqqında Səfəvilər dövrünün ayrı-ayrı tarixi mənbələrində əhəmiyyətli, lakin addabudda, səpələnmiş faktlara, həmçinin müxtəlif təzkirələrdə yığcam və əsasən bir-birini təkrarlayan məlumatlara yer verilmişdir.

Səfəvi dövrünün salnaməçilərindən olan Mirzə bəy Cünabədinin verdiyi məlumata görə, Sam mirzə seşənbə günü, 21 şaban 923-cü ildə (8 sentyabr 1517) Şah İsmayıl Sorluq yaylağından Naxçıvan qışlağına doğru yolda olarkən Cənubi Azərbaycanın Marağa şəhərində dünyaya gəlmişdir. Bundan xeyli sevinən Şah İsmayıl ziyafət qurmuş, hədsiz qızıl və gövhər nəzir vermiş, həmçinin məşhur qızılbaş sərkərdəsi Durmuş xan Şamlunu Sam mirzənin lələsi təyin edərək, şahzadənin təlim-tərbiyəsi ilə bağlı işləri ona tapşırmışdı[133]. Sam mirzə həyatının ilk illərini atasının hüzurunda keçirsə də, h.927/1521-ci ilin yayında öz lələsi Durmuş xanla birlikdə şah tərəfindən Herat şəhərinə göndərilmiş və Xorasanın idarəçiliyi ona həvalə olunmuşdu[134]. Lakin Sam mirzə azyaşlı olduğundan bütün idarəçilik işləri faktiki olaraq onun lələsi Durmuş xan tərəfindən həyata keçirilirdi.

1524-cü ildə Səfəvilər dövlətində I Şah Təhmasib hakimiyyətə keçdi və o, qardaşı Sam mirzənin Xorasan vilayətində hakim-

[133] Mirzə bəy Cünabədi. Rövzətüs-Səfəviyyə. Be kuşeş-i Qulamrza Təbatəbayi Məcd. Tehran, 1378, s.299.

[134] Xacə Zeynalabidin Əli Əbdi bəy Şirazi.Təkmilətül-əxbar (Səfəvi dövrü - Şah İsmayıl və Şah Təhmasib dövrləri tarixi). Bakı, 1996, s.52.

lik hüququnu təsdiqləyən fərman imzaladı[135]. H.931 /1524-25-ci ildə özbək qoşunları Xorasana daxil olub, Heratı mühasirəyə aldıqda Durmuş xanın məsləhəti ilə Sam mirzə özbək xanlarının ali rəhbəri Kuçkunçi xana hədələyici məktub yazıb, ondan Xorasanı tərk etməyi tələb etdi. Gərgin döyüşlərdən sonra Heratı tuta bilməyən özbəklər geri çəkilməli oldular[136].

H.932/152526-cı ildə Durmuş xan vəfat etmiş və onun qardaşı Hüseyn xan Şamlu Sam mirzənin lələsi təyin olunmuşdu[137]. O, öz lələliyi dövründə (1526-1531) qızını Sam mirzəyə ərə vermiş və onunla bağlılıqlarını daha da gücləndirmişdi. H.934/1527-28-ci ildə özbək hökmdarı Übeydulla xanın ordusu Sam mirzənin və Hüseyn xanın qoruduğu Herat şəhərini 7 ay mühasirədə saxlasa da, oranı tuta bilməyib geri çəkildi. Lakin h.936/1529-30-cı ildə Übeydulla xan daha güclü bir ordu ilə Herata növbəti həmlə etdi və qüvvələrin qeyri-bərabərliyini, vəziyyətin çətinliyini görən Hüseyn xan Sam mirzəni və qoşununu götürərək Sistan tərəfə çıxıb getdi. Sistan hakimi Məlik Mahmud onlara layiqli hədiyyələr bağışladı və bir neçə gün qonaq saxladı. Bundan sonra şahzadə və lələsi Fars vilayətinə gedib orada qışlamağı qərara aldılar. Onlar yolüstü Səfəvilərə qarşı itaətsizlik göstərən Kic və Məkran hakimi Məlik Dinarın qüvvələrini darmadağın edib Farsa getdilər və h.937/1530- 31-ci ilin qışını orada keçirdilər[138].

2 zilqədə 937/17 iyun 1531-ci ildə Sam mirzə və Hüseyn xan İsfahanın Kəndəman yaylağında dincələn Şah Təhmasibin hüzu-

---

[135] Mirzə bəy Cünabədi. Rövzətüs-Səfəviyyə. Be kuşeş-i Qulamrza Təbatəbayi Məcd. Tehran, 1378, s.364-365.

[136] yenə orada, s. 366-369.

[137] Mirzə bəy Cünabədi. Rövzətüs-Səfəviyyə. Be kuşeş-i Qulamrza Təbatəbayi Məcd. Tehran, 1378, s.371-372; Şah Təhmasibin təzkirəsi / tərcümə: Ə.Rəcəbov. Bakı, 1996, s.17; Xacə Zeynalabidin Əli Əbdi bəy Şirazi. Təkmilətül-əxbar (Səfəvi dövrü-Şah İsmayıl və Şah Təhmasib dövrləri tarixi). Bakı, 1996, s.56.

[138] Mirzə bəy Cünabədi. Rövzətüs-Səfəviyyə. Be kuşeş-i Qulamrza Təbatəbayi Məcd. Tehran, 1378, s. 404- 406.

runa gəlib onunla görüşdülər[139]. Tezliklə Hüseyn xan qızılbaş əmirləri arasında əsas rəqibi olan Çuxa sultan Təkəlünü aradan qaldıraraq, Şah Təhmasib tərəfindən vəkil və əmirül-üməra vəzifələrinə təyinat almağa nail olur və faktiki olaraq, şahdan sonra dövlətin ikinci şəxsinə çevrilir.

H.941-ci ilin məhərrəm ayında (13.07.-11.08.1534) Şah Təhmasib yenidən Sam mirzəni Xorasan hakimliyinə təsdiq edir və Ağzıvar xan Şamlunu onun yeni lələsi təyin edir[140].

Osmanlı – Səfəvi müharibəsinin başlanmasından istifadə edən Hüseyn xan, Osmanlı sultanı I Süleymanla sövdələşməyi və Təhmasibi devirib onun yerinə öz kürəkəni Sam mirzəni şah elan etməyi qərara alır. Lakin bu qəsdin üstü vaxtında açılır və Hüseyn xan Təhmasibin əmri ilə edam edilir[141]. Gizli planın ifşa olunduğunu görüb həyatları üçün təlaş keçirən Sam mirzə və Ağzıvar xan Heratda şaha qarşı üsyan qaldırmaqdan başqa çarə görmürlər və 15 şaban h.941 (19 fevral 1535)-ci ildə qiyam qaldırıb, Qəndəhar şəhərini də ələ keçirməyə cəhd edirlər[142]. Bu xəbəri eşidən Sultan Süleyman Sam mirzəni Səfəvi hökmdarı kimi tanımağa qərar verir[143].

Lakin qiyam uğursuzluğa düçar oldu. Qəndəhar şəhəri yaxınlığında Böyük Moğol şahzadəsi Mirzə Kamranın ordusu ilə döyüşə girən Sam mirzənin qüvvələri darmadağın edildi, Ağzıvar xan isə öldürüldü. Sam mirzə Gərmsirat və Təbəs ərazilərinə qaçmağa

---

[139] Xacə Zeynalabidin Əli Əbdi bəy Şirazi.Təkmilətül-əxbar (Səfəvi dövrü - Şah İsmayıl və Şah Təhmasib dövrləri tarixi). Bakı, 1996, s.61; Şah Təhmasibin təzkirəsi / tərcümə: Ə.Rəcəbov. Bakı, 1996, s.24; Эфендиев О. Азербайджанское государство Сефевидов в XVI веке. Баку: 1981, s. 72.

[140] Xacə Zeynalabidin Əli Əbdi bəy Şirazi.Təkmilətül- əxbar. Bakı, 1996, s.70; Mirza bəy Cünəbadi. Rövzətüs-səfəviyyə. Tehran, 1378, s.421; Şah Təhmasibin təzkirəsi. Bakı, 1996, s.32-33.

[141] Эфендиев О. Азербайджанское государство Сефевидов в XVI веке. Баку: 1981, s. 73-74.

[142] Mirza bəy Conabədi. Rouzətüs-səfəviyye. Be kuşeş-e Qulamrza Təbətəbayi Məcd. Tehran, 1378, s.438- 439.

[143] Бидлиси Шараф-хан. Шараф-наме (перевод, предисловие, примечания и приложения Е.И.Васильевой). II том. Москва: Наука, 1976, s.183.

məcbur oldu və Şah Təhmasibə yalvarış dolu məktub göndərib əfv olunmasını xahiş etdi[144]. 1536-cı ildə Təhmasib Xorasana gəlib Əbivərd məntəqəsində dayanarkən Sam mirzə onun hüzuruna yetişib itaətini bildirdi[145].

Təhmasib onu bağışlasa da, heç bir yerə hakim təyin etmədi və 1536-cı ildən 1549-cu ilədək öz yanında saxladı. Bu illər ərzində Sam mirzə rəsmi dövlət qəbullarlında və tədbirlərində iştirak etmişdir. 1540-cı ildə Səfəvilər dövlətində olmuş Venesiya elçisi Mikele Membre Sam mirzə haqqında yazır: "Şah Sam mirzəyə hakimiyyət vermir... O, (yəni Sam mirzə - V.M.) saqqal saxlamır. O, 28 yaşında, güclü, qısaboylu gəncdir"[146]. Mikele Membre Sam mirzənin zahiri görünüşü barədə məlumat verən yeganə müəllifdir. Əgər nəzərə alsaq ki, həmin zaman Samın cəmi 23 yaşı vardı, onda onun zahiri əlamətlərə görə yaşından böyük göründüyünü söyləyə bilərik. 1544-cü ildə Səfəvilər dövlətinə gəlmiş Böyük Moğol hökmdarı Hümayun padşahın Sultaniyyə şəhəri yaxınlığındakı Sorluq yaylağı ətrafında qarşılanma mərasimində Sam mirzə də yaxından iştirak etmişdi[147].

H.956/1549-cu ildə Sam mirzə Təhmasibin əmri ilə Ərdəbil hakimi təyin olunmuş və 1562-ci ilin əvvəllərinə kimi bu postda qalmışdır. Lakin Sam mirzənin hakimiyyət iddiaları ilə bağlı yeni məlumatlar alıb şübhəyə düşən Təhmasib onu həbs etdirərək, Cənubi Azərbaycanın Qəhqəhə qalasında zindana saldırmış və Sam mirzə həyatının son illərini orada keçirmişdir. Sam mirzənin ölüm tarixi, şəraiti, səbəbi haqqında tədqiqatçılar müxtəlif versiyalar irəli sürmüşlərsə də, bu hadisəni dəqiqləşdirən Ə.Rəhimov olmuşdur. Sam mirzə Qəhqəhə qalasında bir müddət məhbus həyatı keçdik-

---

[144] Mirzə bəy Cünabədi. Rövzətüs-Səfəviyyə. Be kuşeş-i Qulamrza Təbatəbayi Məcd. Tehran, 1378, s. 440- 442.

[145] Xacə Zeynalabidin Əli Əbdi bəy Şirazi. Təkmilətül-əxbar. Bakı, 1996, s.81.

[146] Əfəndiyev O. Venesiyalılar Şah I Təhmasibin sarayında (Mikele Membre və Vinçenso Alessandri). Bakı, 2005, s. 45-46.

[147] Эфендиев О. Азербайджанское государство Сефевидов в XVI веке. Баку: 1981, s. 109.

dən sonra, h.975-ci ilin cəmadiyüssani (1567-ci ilin dekabr) ayında iki oğlu ilə birlikdə Şah Təhmasibin əmri ilə öldürülmüşdür[148].

Sam mirzə bir şahzadə kimi görkəmli alim və şairlərdən təlim və tərbiyə almışdır. Gözəl xəttat, təliq və şikəstə xətlərinin mahir ustası olan Sam mirzənin adı tarixə həm də şair kimi düşmüşdür. Şeirlərini Sami təxəllüsü ilə yazan Səfəvi şahzadəsinin ən mühüm əsəri ***"Töhfeyi-Sami"*** adlı təzkirəsidir. Təzkirə ilə tanış olan ingilis şərqşünası E.Broun əsərin təcili çap olunmasının vacibliyini yazır[149]. Türk alimi M.F.Köprülü "Töhfeyi-Sami"nin XVI əsrdə yetişmiş türk və iranlı şairlər və xüsusilə Azəri, yəni şərqi oğuz türk ədəbiyyatı haqqında məlumat almaq üçün müraciət ediləcək başlıca mənbələrdən biri olduğunu bildirir[150]. Ancaq təzkirə bəzi tənqidlərə də məruz qalmışdır. Belə ki, Sam mirzənin atasının əksinə olaraq farspərəst olduğunu, fars dili və mədəniyyətinə pərəstiş etdiyi və atasının Azərbaycan dilində yaratdığı zəngin ədəbi irsə etinasız yanaşdığı, təzkirəsində "mütəəssüb bir fars kimi" hərəkət edərək, əsərlərinin mühüm qismini azərbaycanca yazmış olan Xətainin şerlərindən nümunə üçün yalnız farsca beyt verdiyini qabardırlar[151]. A.Topalova da fars dilində qələmə alınmış təzkirələri tənqid edərək yazır: *"Sam mirzənin, Lütfəli bəy Azərin və Mir Möhsün Nəvvabın təzkirələrində isə Azərbaycan şairlərinin əsərlərindən, Azərbaycan ədəbiyyatından bu və ya digər dərəcədə bəhs olunsa da, biz türkcə təzkirələrdə olan vətən, millət, xalq təəssübkeşliyini, yanğısını bu əsərlərdə görmürük"*[152].

---

148 Rəhimov Ə. Sam Mirzənin qətli haqqında yeni məlumat // AEA Xəbərləri. Ədəbiyyat, dil və incəsənət seriyası, 1990, № 4, s.98- 99.

149 A Desccriptive Catalogue of the Arabic, Persian and Urdu Manuscripts in the Library of the University of Bombay. Bombay, 1935, p.41.

150 Köprülü F. Sam Mirza Safevi ve eseri // Azerbaycan Yurt bilgisi, 1934, № 3, s.32.

151 Azərbaycan ədəbiyyatı tarixi: 3 cilddə, I c., Bakı, 1960, s.372; Səfərli Ə., Yusifli X. Qədim və orta əsrlər Azərbaycan ədəbiyyatı. Bakı, 1998, s. 370.

152 Topalova. Ədəbiyyat tarixinin öyrənilməsində təzkirələrin rolu və Ağa Məhəmməd Müctəhidzadənin "Riyazül-aşiqin" təzkirəsi. Bakı: 2001, s. 43.

Lakin nəzərə almaq lazımdır ki, Sam mirzə Xətainin türkcə şerlər yazdığını da qeyd etmiş, bəzi şairlərin yaradıcılığından bəhs edərkən onların türkcə şeirləri olduğunu xüsusi vurğulamış, Sultan Hüseyn Bayqara və Zəhirəddin Babur şah kimi hökmdarların türkcə şeirlərindən nümunələr gətirmişdir. Sam mirzə özündən əvvəlki təzkirəçilərdən fərqli olaraq, ilk dəfə böyük türk şairlərinə xüsusi bir fəsil ayırmağı zəruri hesab etmiş və "Töhfeyi-Sami"nin VI fəslini türk ədəbiyyatına həsr etmişdir. Bu məsələyə diqqət çəkən A.Səttarov yazır: "Bu halət, əlbəttə ki, səbəbsiz deyildi. Çünki xüsusən XV əsrin II yarısında və Sam mirzənin zamanında türkdilli şairlərin nüfuzu xeyli artmışdı"[153]. Buna görə də Sam mirzəni türk ədəbiyyatına laqeyd yanaşmaqda və farspərəst mövqe tutmaqda ittiham etmək doğru deyildir. Həm də ona görə ki, o, öz həyatının ilk illərindən türk qızılbaş oymaqlarından olan şamlu tayfasının əmirlərinin qayğısı ilə əhatə olunmuş, Hüseyn xan Şamlunun qızı ilə evlənmiş və siyasi fəaliyyətində, hakimiyyət iddiaları ilə çıxış edərkən məhz türk qızılbaş tayfalarının dəstəyinə arxalanmışdır.

***"Töhfeyi-Sami"*** adlı təzkirəsinin nə vaxt, harada yazılması haqda təzkirəçinin özünün qeydi yoxdur. Bir çox tədqiqatçılar əsərin h.957/1550-h.968/1561-ci illər arasında tərtib olunduğunu yazırlar[154]. Buradan belə qənaətə gəlmək olar ki, əsər Sam mirzə Ərdəbildə olarkən qələmə alınmışdır. Təzkirə müqəddimə, "səhifə" adı verilən yeddi fəsil və xatimədən ibarətdir.

A.Səttarov qeyd edir ki, Sam mirzə öz təzkirəsini şairlərin təbəqələrinə və onların şeirə və şairliyə olan münasibətləri əsasında tərtib etmişdir[155].

"Töhfeyi-Sami"nin ***birinci fəsli*** şah nəslindən olan şairlərə, ***ikinci fəsli*** seyid və alim nəslindən olan şairlərə, ***üçüncü fəsil*** peşəkar şair olmayıb, bəzən şeir söyləyənlərə, ***dördüncü fəsil*** vəzirlər və şeir yazan başqa qələm sahiblərinə, ***beşinci fəsil*** əsl şairlər və yüksək qələm sahiblərinə, ***altıncı fəsil*** türk təbəqəsi və onların

[153] Саттаров А. Тухфаи Соми ва хусусиятхои он. - Душанбе: 1972, с. 73.
[154] Məani Ə.G. Tarixi-təzkirəhayi-farsi. I cild. Tehran: 1350, s.155.
[155] Саттаров А. Тухфаи Соми ва хусусиятхои он. Душанбе: 1972, с. 74.

ən böyük şairlərinə, ***yeddinci fəsil*** isə xalq təbəqəsindən olan digər şairlərə ayrılmışdır.

Əsərin müqəddiməsində təzkirəçi şair, şeir haqqında məlumat verir və özündən əvvəlki təzkirəçiləri xatırlayır: "… belə ki, "Baharistan", "Məcalisün-nəfais" və "Təzkirətüş-şüəra" bu təbəqədəndir. Bu yaradıcı tayfadan (şairlərdən - V.M.) xəbərsiz olan əsər yoxdur. Onların əsərlərinin böyük bir dövlət kimi məcmuələnib divan halına salınması aləmlərə nur saçan bir günəşin doğuluşuna bənzəyir. Şöləsi bizim günlərə qədər yetişməkdədir. Sonralar bu ləyaqətli fəsahət bayrağı və bəlağətli ayinlərin məcmuələnməsi işinə bütün diyarlarda başladılar"[156]. Sam mirzə öz təzkirəsinin də bu əsərlər sırasına daxil olduğunu yazır. Əsərdə ümumilikdə 714 şair haqqında məlumat verilir.

Təzkirənin xatiməsində müəllif təzkirəsini necə yazması haqqında məlumat və öz yaradıcılığından nümunələr verir. Sam mirzə öz əsərlərindən 4 mətlə, rübai və qəsidə verir ki, bunların sayı 32 beytdir.

"Töhfeyi-Sami"də XV əsrin ikinci yarısı və XVI əsrin ilk yarısına aid şairlər haqqında məlumat verilmişdir. Təzkirədə türkcə şeir yazdıqları açıq söylənilən Azərbaycan şairləri arasında Xətai, Füzuli, Ayqut sultan, Yusif bəy, Cədidi, Əmni, Kəlimi Təbrizi və Susəninin adlarını çəkmək olar. Bu şairlərin bəzilərinin əsərlərində Anadolu, bəzilərinkində cığatay ləhcələrinin təsiri gözə çarpır[157].

E.Broun təzkirədəki şairlərin heç də hamısının tanınmış şairlər olmadığını xüsusi vurğulayır: "Töhfeyi-Sami"də və o dövrün digər bioqrafiyalarında və tarixi əsərlərində xeyli sayda şairlərin adları çəkilsə də, onların əksəriyyətini birinci dərəcəli şairlər sırasına qoymaq çətindir (Cami, Hatifi, Hilali və Xorasan məktəbinin həqiqi davamçıları olan şairlər istisnadır)"[158]. Ancaq bu təzkirədə

---

[156] Sam mirzə. Töhfeyi-Sami. Əlyazmalar İnstitutu, B-5119, vər. 4 b.
[157] Cavad Heyət. Azərbaycan ədəbiyyatına bir baxış. Bakı, 1993, s. 62.
[158] Bax: Browne E.G. A History of Persian Literature in the Modern Times (A.D.1500-1924). Cambridge University Press, 1924, p. 490.

bəhs olunan əksər şairlər haqqındakı məlumata digər mənbələrdə rast gəlmədiyimiz üçün bu informasiyalar çox dəyərlidir.

Təzkirənin dünyanın müxtəlif əlyazma xəzinələrində çoxsaylı nüsxələri mühafizə olunmaqdadır. Onu da qeyd edək ki, XV əsrin ikinci yarısı və XVI əsrin birinci yarısında yaşayan şairlər haqqında məlumat verən təzkirə hələ də Azərbaycan dilinə tərcümə olunmamışdır.

### *Əlyazmaları*

*Kayseri Rəşid Əfəndi, Əski əsərlər K/X. № 922.*
*Amasya Bayəzid İl Xalq K/X. 05 Ba 1073.*
*Manisa İl Xalq K/X. 45 Hk 6381.*
*İstanbul Millət K/X., Ali Əmiri Kolleksiyası 34 Ae 945.*
*Milli Kitabxana, Çankırı İl Xalq K/X. 18 Hk 180.*
*Vəqflər Genel Müdürlüyü, Safranbolu İzzət Məhəmməd Paşa Kolleksiyası 65 Saf 550.*
*Çarls Şeffer kolleksiyası (Paris) P 182.*
*Çarls Şeffer kolleksiyası (Paris) 1144.*
*Çarls Şeffer kolleksiyası (Paris) 1145.*
*Çarls Şeffer kolleksiyası (Paris) P 151.*
*Özbəkistan EA Şərqşünaslıq İnstitutu № 57.*
*Rusiya EA Şərqşünaslıq İnstitutu B – 116.*
*Rusiya EA Şərqşünaslıq İnstitutu B – 118*
*Sankt-Peterburq Şərq Əlyazmaları İnstitutu 950 e.*
*Sankt-Peterburq Şərq Əlyazmaları İnstitutu 101.*
*Ayətullah Mərəşi Ümumi K/X. № 3674.*
*Ayətullah Mərəşi Ümumi K/X. № 7531.*
*Ayətullah Mərəşi Ümumi K/X. № 12096.*
*Tehran Universiteti Mərkəzi K/X. 49443.*
*Tehran Universiteti Mərkəzi K/X. 169.*
*Tehran Universiteti Mərkəzi K/X. 3007.*
*Məlik Milli K/X. 3848.*
*Müctəba Minui K/X. 67.*

*İran İslami Şura Məclisi K/X. 615*
*İran İslami Şura Məclisi K/X. 529.*
*İran İslami Şura Məclisi K/X. 15004.*
*İran İslami Şura Məclisi K/X. 14313.*
*İran İslami Şura Məclisi K/X. 5649.*
*İran Milli K/X. 251.*
*İran Milli K/X. 805.*
*İran Milli K/X. 896.*
*Şəhid Mütəhhəri Ali Mədrəsəsi K/X 2721.*
*Şeyxülislam Arif Hikmətin kolleksiyası, Mədinə 544.*
*Hümayun Sənətizadə Kolleksiyası.*
*Ayətullah Məhəmməd Hüccət Kolleksiyası 81.*
*Los-Ancels K/X. C – 103.*
*İndia Ofis K/X. № 2570.*
*İndia Ofis K/X. № 601.*
*Britaniya Muzeyi Or. 490.*
*Berlin K/X. (Königlichen) № 643.*
*Berlin K/X. (Königlichen) № 643 a.*
*Vyana K/X. Mxt. 401.*
*Bombey Universiteti K/X. № 42.*
*Astani-Qüdsi-Rizəvi K/X.*
*AMEA Əlyazmalar İnstitutu B – 5119.*
*AMEA Əlyazmalar İnstitutu B – 5778.*
*AMEA Əlyazmalar İnstitutu B - 1118.*
*Konya Bölgə Yazma Əsərlər K/X. 44 Dar 279.*
*Ayasofya K/X. № 1041.*
*Britaniya Muzeyi K/X. Or. 3490.*
*Britaniya Muzeyi K/X. add 7670.*
*Britaniya Muzeyi K/X. add 2436.*
*Vyana Dövlət K/X. № 1201.*
*Gürcüstan Şərqşünaslıq İnstitutu 244.*
*Gürcüstan Şərqşünaslıq İnstitutu 166.*
*Leyden K/X. 831.*

# ƏHDİ BAĞDADİ

Azərbaycan ədəbiyyatı tarixinə nəzər yetirdikdə məlum olur ki, Azərbaycan dilində ilk təzkirəni Əhdi Bağdadi yazmışdır. İraqın türkman əhalisi tarixən Azərbaycan xalqının tərkib hissəsi olmuşdur. Görkəmli türk alimi M.F.Köprülü İraqın türkdilli əhalisini soykök, dil, adət-ənənə və ədəbiyyat baxımından Azərbaycan mədəniyyəti regionuna daxil etmişdir[159]. Əhdi haqqında ilkin məlumatları Aşiq Çələbi, Qınalızadə, Bəyani, Riyazi təzkirələrindən alırıq. Bağdadda anadan olan Əhdinin əsl adı Aşiq Çələbi və Riyazi təzkirələrində Mehdi[160], Qınalızadə təzkirəsində və "Künhül-əxbar"da isə Əhməddir. Ədəbi mühitdə isə Əhdi Bağdadi kimi tanınmışdır. Tarixçi Mustafa Ali "Künhül-əxbar"ında Əhdinin azərbaycanlı olduğunu xüsusi vurğulayır: "…hətta bir zaman əcəmiliyini bilmədi. Əcəmiliyi halında şüərayi-Rum təzkirəsini yazmağa meyilləndi"[161].

"Gülşəni-şüəra" təzkirəsində atası Şəmsi Bağdadi, qardaşları və yaxın qohumları haqqında verdiyi məlumatlar ailənin şəxsiyyəti və nüfuzunu təsdiq edir[162]. Bağdadda mədrəsədə təhsil aldıqdan sonra Rum elinə səyahətə çıxmış, İstanbulda olmuş, görkəmli şəxsiyyətlər, alim və şairlərlə yaxından tanış olmuş, şeir məclislərində iştirak etmişdir. İstanbula gəldikdən sonra onun şəhərdə yerləşməsində Qanuni Sultan Süleymanın oğlu şahzadə Səlimin böyük rolu olmuşdur. Ö.F.Akün Əhdinin şahzadə Səlimlə tanışlığının h.960/ 1553-cü ilə təsadüf etdiyini yazır[163]. Bu münasibətlər şahzadənin sancaqbəyi olduğu Manisada davam etmişdir. Əhdinin təzkirə-

---

[159] Xıdırov C. İraq türkmanları. Bakı: Azərnəşr, 1993, s. 6.

[160] Aşiq Çələbi. Məşairüş-şüəra. Britaniya Muzeyi, Or. 6434184b.; Riyazi. Riyazüş-şüəra. Nurosmaniyyə kitabxanası, 3724. 102a..

[161] Ali Mustafa. Künhül-ahbarın tezkire kısmı / hazır.: M.İsen. Ankara, 1994, s. 319.

[162] Feyzullayeva V. Əhdi Bağdadi və onun "Gülşəni-şüəra" təzkirəsi // Ədəbiyyat məcmuəsi, 2000, s. 198.

[163] Akün Ö.F. Ahdi. DİA, c. I, İstanbul, 1988, s.510.

sindəki bəzi ifadələrdən onun Manisadan əvvəl bir müddət Adana və Konyada da qaldığı məlum olur. Ədəbiyyat aləminin tanınmış simaları ilə yaxın münasibət yaradan Əhdi orada keçirilən ədəbi məclislərin daimi iştirakçısı olmuşdur. Onun ədəbi məclislərdə tanış olduğu şairlərin adlarına təzkirəsində də rast gəlmək olur. Mənbələr Əhdinin h.971/1562-63-cü ildə Bağdada qayıtdığını yazırlar[164]. Əhdi demək olar ki, hazır olan təzkirəsini ona göstərdiyi köməyə və qayğıya görə təşəkkür üçün şahzadə Səlimə təqdim etmişdir. Kınalızadə Həsən Çələbidən başlayaraq Əhdidən bəhs edən digər təzkirəçilər "Gülşəni-şüəra"nın Bağdadda yazıldığını bildirirlər. Ö.Akün bunun səbəblərindən biri kimi Əhdinin Bağdada yola düşməsini ifadə edən "əzimət" sözünün "ovdət"[*] şəklində oxunmasını göstərir. Bundan başqa, Əhdi Bağdada qayıtdıqdan sonra əsərini yenidən işləməsi (dördüncü rövzəni əlavə etməsi) əsnasında ön sözə əlavə etdiyi ifadələr də təzkirənin Bağdadda yazılması kimi nəticəni çıxarmağa səbəb olumşdur.

Müəllif tərəfindən təzkirəyə edilmiş əlavələr h.1001/1592-93-cü ilə təsadüf edən hadisələri də əhatə etdyinə görə, Əhdinin təxminən sözügedən tarixdən sonra vəfat etdiyini söyləmək olar.

Təzkirələrdən əlavə, Ruhi Bağdadi "Divan"ında da Əhdi xatırlanmışdır. Mehmet Halit Bayırı 1933-cü ildə "Azerbaycan Yurt bilgisi"ndə Əhdi Bağdadi ilə bağlı dərc etdirdiyi məqaləsində yazır: "Ahdi hakkında zamanının telakkisini anlamak için hemşehrisi ve muasırı Ruhi divanına muracaat etmek lazım gelir"[165]. Məqalədə Ruhi divanında Əhdiyə həsr olunmuş misralar verilir. Daha sonra M.H.Bayırı Ruhi divanındakı bu beytlərin zamanında Əhdiyə verilən qiyməti əks etdirdiyini göstərir: "Bütün bunlar Ruhinin ve dolayısile zamanının Ahdi hakkındakı düşüncelerine

---

[164] Bax: Ahdi ve Gülşeni-şuarası. Ankara, 2005, s. 4.

[*] Ovdət - ayrıldığı yerə dönmək.

[165] Bayırı M.H. Bağdatlı Ahdi // Azerbaycan Yurt bilgisi, 1933 haziran, № 18, s. 266.

terceman olan hülasalar olmak itibarile ehemmiyetle göz önünde bulundurulmağa şayandırlar”[166].

F.e.d. A.Musayeva da Ruhi Bağdadi ədəbi irsini araşdırarkən Ruhi və Əhdi Bağdadi münasibətlərinə də aydınlıq gətirmişdir: “Ruhi “Gülşəni-şüəra” müəllifi, həm də şair tək anılan Əhdi Bağdadi ilə eyni dövrdə, Bağdada yaşamışdır. Onlar bir-birlərini şəxsən tanımışlar. Əhdi Ruhidən yazdığı tək, Ruhinin də onunla bağlı söylədikləri ilkin mənbələrdən biri kimi diqqətəlaiqdir”[167]. Tədqiqatçı Ruhi “Divan”ının Sankt-Peterburq İmperator kitabxanasındakı THC-143 şifrəli əlyazmasında Əhdi ilə bağlı beytləri ilkin olaraq ədəbiyyatşünaslara təqdim etmişdir:

Şüəra əskisi ol piri-süxəngu, yəni
Sahibi- “Təzkirə” Əhdiyi-qəzəlxan nicədür?



Gül gibi Əhdi tazə qəzəllər edərmi tərh?
Ol əndəlibi-gülşəni-irfan nə dəmdədür?



Tazələr ruhu sözü olsa nola köhnə vücüd,
Əhdiyi-zindədil, ol sahibi-peyman eyüdür.



Kimsənin məclisinə getdiyi yok “təzkirə”siz,
Sahibi-“Təzkirə”, ol piri-süxəndan eyüdür.

Əhdinin həyatı haqqında Azərbaycan ədəbiyyatşünaslığına ilk məlumatı İsmayıl Hikmət verir: “Hicri X əsrin yetişdirdiyi klassik türk şairlərindən biri də Əhdidir. Əhdi uzun müddət səyahətdə olmuş, Türkiyədə yaşamış olmasına rəğmən ləhcə etibarilə Azərbaycana mənsubdur”[168].

---

[166] Bayırı M.H. Bağdatlı Ahdi // Azerbaycan Yurt bilgisi, 1933 haziran, № 18, s.267.

[167] Musabəyli A. Ruhi Bağdadi: mühiti, həyatı, poetikası və Divanı (əlyazma qaynaqları əsasında). Bakı: 2005, s.102.

[168] İsmayıl Hikmət. Azərbaycan ədəbiyyatı tarixi. I c. Bakı: 1924, s.158.

Osmanlı ölkəsini gəzən və dövrün bir çox məşhur şairlərini yaxından tanımaq və əsərlərini görmək imkanı verən ədəbi və elmi mühitlə arasıkəsilməz təmas, Əhdinin bu uzun səfərinin sonunda tamamladığı təzkirəsi üçün məlumat mənbəyi olmuşdur. Azərbaycan türkcəsində ilk təzkirə olan "Gülşəni-şüəra" təzkirəçinin müasirlərini əhatə etdiyinə görə, Əhdiyə qədər yazılmış təzkirələrdən xüsusilə fərqlənir. Türk alimi S.Solmaz Əhdi təzkirəsinin önəmini içərisindəki başqa qaynaqlarda yer almayan şairlərin təyin etdiyini vurğulayır və yazır: "Çoğunluğu devletin doğu kesiminden olan, diger tezkirelerin hiç birinde yer almayan 147 şair bunun en bariz delilidir. İrak mihver olmak üzere bugünkü İran ve Azerbaycan, hatta Buharayı da içine alan, Suriye ve Mısıra kadar uzanan bir bölgede yetişmiş bir çok şair ilk defa Ahdi ile edebiyat dünyamızdakı yerini almıştır"[169].

Əhdi əsərini şahzadə Səlimə Kütahyada təqdim etmişdir. Aşağıdakı qitəni də bu münasibətlə yazmışdır:

Cəm idüp ərbabi-nəzmi itdüm ol sultanə ərz,
Adət olmuşdur sunar bəndə şahi-dövranə ərz.



Xaki-payindən bitər məqsudi ərbab-i dilün
Nola sunsa xaki-payə Əhdiyi-fərzanə ərz[170].

Əhdi təzkirəsini h.971/1563-64-cü ildə tamamlamış və yazılma tarixini aşağıdakı şeir parçası ilə göstərmişdir:

Gül kimi nəzmi ilə əhli-dilin,
Olsa rəşki-cinan bu rövzə nola.
Eyləyib cəm bir yerə Əhdi,
Dedi tarixi-Gülşənüş-şüəra[171].

---

[169] Ahdi ve Gülşen-i şuarası (İnceleme-metin). Ankara, 2005, s. VIII.
[170] yenə orada, s. 90.
[171] yenə orada, s. 91.

Əhdi bu tarixdə yazdığı təzkirəsini üç rövzəyə ayırmışdır. Sonralar müəllif əsəri yenidən gözdən keçirərək h.1001/1592-93-cü ilə qədər yetişmiş şairlər haqqında topladığı məlumatları əlavə edərək, təzkirəsinə bir rövzə də artırmışdır. Dördüncü rövzəyə əlavə olunan şairlər aşağıdakılardır: Təmərrüd Əli paşa, Həsən paşa, Mehmet paşa, Əhməd paşa, Əhməd bəy, Dərviş bəy, Ömər bəy, Təbi, Gərmi bəy, Feyzi, Mövlana Əhməd Həriri, Ülfəti, Əhməd Zərif, Atəşi, Bəyani, Turabi, Cəmali, Xayiri, Həmdi, Hüseyni, Hökmi bəy, Xürrəmi, Hisali, Xülusi, Xadimi, Xumari, Xəndan, Duayi, Ruhi Bağdadi, Ruhi Çələbi, Zari, Zöhdi, Sami, Sai, Səmai, Şərhi, Şəmsiyi-Divanə, Ziyai, Tüfeyli, Tərzi, Təriqi, Zühuri, Elmi, Arif, Əbdülvahid, Adni bəy, İzari, Ətiqi, Qafuri, Fəxri, Mövlana Katib, Ləli, Lisani, Mühiti Əfəndi, Mühyi, Minnəti, Natiqi, Nüsrəti, Vəhdəti, Vəsfi.

Beləliklə, “Gülşəni-şüəra”nın ilk variantı müqəddimə, üç rövzə və bir xatimədən ibarətdir. Təzkirənin tam nüsxəsi isə dörd rövzədir. İlkin variantda təzkirədə Qanuni dövrü şairlərindən bəhs olunmuşdursa, əlavələr zamanı əsərə II Səlim və III Murad dövrü şairləri də xatırlanmışdır.

Təzkirənin birinci rövzəsində Qanuni Sultan Süleyman, şahzadə Sultan Səlim və digər şahzadələr, ikinci rövzədə dövrünün tanınmış dövlət xadimləri, üçüncü rövzədə üləma və müdərrislər, sancaq bəyləri və əyalət dəftərdarları, dördüncü rövzədə isə əlifba sırası ilə müasiri olan şairlər haqqında məlumat və əsərlərindən nümunələr verilmişdir.

Əsərin müqəddimə və xatiməsi çətin bir dillə qələmə alınmışdır. Təzkirənin ilk üç bölməsində də sultan, şahzadə, bəylərbəyi, dəftərdar şairlərdən də bəhs olunarkən ərəb-fars ibarələri ilə dolu ağır bir dildən istifadə olunmuşdur. Təzkirənin dilini təhlil edən S.Solmaz yazır: “Dil yer yer ağırlaşmakta, ikili, üçlü terkipler çok kullanılmaktadır. Birinci, ikinci ve üçüncü bölümlerde kul-

lanılan dilin belli bir standartı yoktur. Bu bölümlerde dilin kullanış biçimini şairin sosyal statüsü belirlemektedir”[172].

“Gülşəni-şüəra”nın müqəddiməsində Qanuni Sultan Süleyman və şahzadə Sultan Səlim tərif edilmiş, “Səbəbi-nəzmi-kitab” başlığı altında Türkiyə səfərini, İstanbulun elm adamları və şairləri ilə tanışlığını, Bağdada qayıtmasını təsvir etmişdir. Təzkirəçi “Səbəbi-təlifi-kitab” sərlövhəsi altında təzkirənin yazılma səbəbini izah edir: “Səlatini-izamun və üləmayi-fixamun və sahibi-dövlətani xubcamalun və eyşü nuş itdügüm şüərayi-şeirin maqalun və xidmətlərinə irişüb söhbətlərindən müstəfid olduğum kimsələrdə nəvsafi-xamisin guş qıldığum füsəhayi-niku-xisalün məmha-əmkən tətəbbüyi-əhval idüb dörd rövzə təriqilə əla-qadrit-takə bu bir neçə pərişan əvraqa cəm qılıb “Təzkireyi-ərbabi-səfa ani “Gülşəni-şüəra” diyü nam verildi”[173].

C.S.Robinson ədəbiyyatın bu janrında özünü sınamış iki sələfi və çoxsaylı xələflərindən fərqli olaraq Əhdinin onu bu işə sövq edən adi səbəblərin adını çəkmədiyini yazır və daha sonra əlavə edir: “Əhdinin sətiraltı fikirlərini oxuyarkən belə bir nəticəyə gəlmək olur ki, “Gülşəni-şüəra” təzkirəsinin tərtibi, çox ehtimal ki, müəllifin Anadolu və İstanbul camaatına minnətdarlıq rəmzi olaraq Osmanlı ədəbi tarixinə şəxsi töhfəsini vermək arzusundan doğmuşdur. Ehtimal ki, təzkirə yazmaqda o, iki məqsəd güdmüşdür: Rum xalqına öz təşəkkürünü bildirmək və Bağdad əhlini məlumatlandırmaq”[174].

*Onu da qeyd etmək lazımdır ki, Azərbaycan təzkirəçisi Əhdi Bağdadi h.972/1564-65-ci ildə Sam mirzənin “Töhfeyi-Sami” təzkirəsini İstanbulda köçürmüşdür*[*]*. Əlyazma hal-hazırda İran Milli*

---

[172] Ahdi ve Gülşen-i şuarası (İnceleme-metin) / haz. S.Solmaz. Ankara, 2005, s.16.

[173] yenə orada, s. 89.

[174] Robinson C.S. Əhdi Bağdadinin “Gülşəni-şüəra” təzkirəsi / “Şərq” tərcümə toplusu, № 3, Bakı, 2006, s.176-177.

[*] Qeyd: Yuxarıda qeyd etdiyimiz kimi, bəzi müəlliflər Əhdinin h.971-ci ildə İstanbuldan Bağdada qayıtdığını bildirirlər. Əgər Əhdinin h.972-ci ildə İstanbulda “Töhfeyi-Sami”ni köçürməsi haqqında kataloqlarda yer almış məlumat

*kitabxanasında 896 şifrəsi ilə mühafizə olunmaqdadır*[175]*. "Gülşəni-şüəra" adlı təzkirə qələmə almış Əhdi Bağdadi əsərinin ön sözündə Sam Mirzənin təzkirəsi ilə tanış olması haqqında heç bir məlumat vermir. Çox güman ki, Əhdi öz təzkirəsini Osmanlı şahzadəsinə təqdim etdiyi üçün orada Səfəvi şahzadəsinin əsərinin adını çəkməyi lazım bilməmişdir. Belə ki, o dövrdə Səfəvi – Osmanlı münasibətlərində soyuqluq və ziddiyyət mövcud idi.*

Əhdi əsərində yeri gəldikcə təzkirəsinin ***qaynaqları*** haqqında da bilgi verməkdədir. S.Solmaz "Gülşəni-şüəra"nın qaynaqlarını ***üç qismə*** ayırır: Əhdinin görüşdüyü şairlər, vəsfini etdiyi şairlər və Əhdi ilə məktublaşan şairlər[176]. Belə ki, təzkirəçi bəzi şairlərlə söhbət etdiyini, onların əsərlərini öyrəndiyini, bəzilərində isə aralarında "hüquqi-sabiqə" olduğunu qeyd etmişdir. Bir qism şairlər haqqında isə "əvsafın quş itdigümüz şüəradandur" şəklində ümumi açıqlama vermişdir. Əhdi bəzi şairlərlə məktublaşdığını, bəzilərinin yaxınlarından məlumat aldığını, bəziləri ilə isə dost olduğunu söyləyir. Təzkirəçi Piri paşa (Adana)[*], Təmərrüd Əli paşa (Sivas), Pərviz Əfəndi, Süruri Əfəndi, Riyazi Əfəndi (Dimetoka, Ədirnə və İstanbul), Əmiri Çələbi (Ədirnə və Bağdad), Əmani, Behişti (İstanbul), Cüdayi, Həmdiyi-Bursəvi (Bağdad), Hatəmi bəy (Ədirnə və İstanbul), Sami, Ruhi Çələbi (Bağdad), Rəfi Çələbi, Tüfeyli (Bağdad), Tərzi (Bağdad), Təriqi (Bağdad), İzari Çələbi (Ədirnə və İstanbul), Adni (Bağdad), Arifi, Fani (Bağdad), Lütfiyi-Əcəm (Bağdad), Məcdi (İstanbul və Bursa), Məhvi (İstanbul və Bursa), Növi Çələbi (Ədirnə və İstanbul), Valehi Çələbi (Ədirnə və İstanbul), Vüsali Çələbi (Ədirnə və İstanbul) ilə görüşmüşdür. Əhdi Əhməd paşa və Muradi Bağdadi ilə məktublaşmışdır. Şübhəsiz ki, "Gülşəni-şüəra"nın qaynaqları bu qədər deyildir. Təbii ki, Əhdi özündən əvvəl yazılmış təzkirələri də görmüşdür. O, təzkirəsində Lətifidən

---

doğrudursa Əhdinin Bağdada qayıtma tarixini yenidən dəqiqləşdirməyə ehtiyac yaranacaqdır.

[175] Bax: Musalı V. Türk təzkirəçiliyi: biblioqrafiya. Bakı: 2011, s. 94.

[176] Ahdi ve Gülşen-i şuarası (İnceleme-metin). Ankara, 2005, s. 25.

[*] Əhdinin şairlərlə hansı şəhərdə görüşdüyü mötərizə içərisində verilmişdir.

bəhs edərkən "Lətifi təzkirəsi"ni gördüyünü, fəqət bu əsəri bəyənmədiyini yazır: "Kastamonıdan əhli-qələmdən üslubi-inşada kəndü rəyi ilə bi-mislü-bi-həmta olduğıçün muüqəddəmə təzkireyi-şüara yazmışdur. Lakin pəsəndi-zürəfa və məqbuli-füzəla olmamışdur. Zira ki, çok yerdə təəssüb itmişdür"[177].

S. Robinson təzkirənin qaynaqlarına toxunaraq göstərir ki, Əhdi təzkirəsini təşkil edən müqəddimə və tərcümeyi-hallardan belə təəssürat yaranır ki, şairlər haqqında verilən bütün məlumatlar ya birbaşa həmin şairlərdən, ya da dolayı surətdə onları tanıyan və onlar haqqında məlumatları olan başqa şəxslərdən alınmışdır. Daha sonra tədqiqatçı qeyd edir ki, Eşqi, Qəndi, Qüdsi və Həlaki ilə bağlı təqdim edilən məlumatlar Əhdinin Səhi və Lətifi təzkirələrindən istifadə etməsi haqqında fikir söyləməyə əsas verir[178].

Təzkirədə Azərbaycan şairləri haqqında verilən məlumatlar da maraq doğurur. Bunların arasında Əflatun, Bəsiri, Pənahi, Bidari, Cəlili, Həsiri, Xəlifə, Hali, Xəlili, Zehni, Ruhi, Rindi, Zayi, Arifi, Elmi Bağdadi, Ətiqi, Füzuli, Fəzli, Mir Qədri, Muradi Bağdadi, Həmdəminin adını çəkmək olar.

Nümunə üçün Həsirinin boqrafiyasına nəzər salaq: *"Şirvâniyyül-asl ve sâhib-nesldür. Hayli nezâket-i tab' ve zerâfet-i vasfla ârâste ve esbâb-ı lehv ü lu' bla ol felâket-me' âb pirâste ve bir bî-riyâ 'âşık-ı şeydâ ve' l-perişân-menzil ü bî-me' vâ olmagın bûriyâdan bî-ser-i bî-devletine bir tâc-ı pür-revâc peydâ idüp bîkaydlıgında şâhân-ı 'âleme ser-fürû' idüp 'arz-ı ihtiyâc itmez ve hûb-rûyân-ı cihânı sûfî gibi bâg-ı cinâna satmaz. Bir nîce müddet dârü' s-selâm-ı Bagdâd' da sâkin olup erbâb-ı nazmla ihtilât-ı küllî eylemegin kelimâtına cüz' î irtibât virüp vâdî-i şi' re sâlik ve emti' a-ı gazelden hayli mâl ü menâle mâlik olmışlardur. Cümle elfâz-ı güher-nisârlarından bir iki beyt-i*

---

[177] Ahdi ve Gülşen-i şuarası (İnceleme-metin). Ankara, 2005, s.501.

[178] Robinson C.S. Əhdi Bağdadinin "Gülşəni-şüəra" təzkirəsi / "Şərq" tərcümə toplusu, № 3, Bakı, 2006, s.178.

*pürnikât bu cem᾽ iyyet-i zurefâya sebt olunması münâsib görüldi. Ebyâtına eşhâs-ı ʻâşık-pîşe tâlibdür.*
*Nazm*

*Bize bir yâr-ı vefâ-dâr gerekmez mi gerek*
*Olıcak yâr-ı cefâ-kâr gerekmez mi gerek*

*Diğer : Türkî-vârınca söylerem şi᾽ ri*
*Kâtî arınca söylerem şi᾽ ri*[179].

Müxtəlif variantlarda davamlı şəkildə əsərə edilən əlavələr üzündən təzkirənin bir-birindən fərqlənən nüsxələri meydana çıxmışdır. Təzkirə üzərində S.Solmazın apardığı araşdırma nəticəsində əsərdəki şairlərin sayı 381-ə çatmışdır[180]. Əlavələr əsərin bəzi yerlərində əlifba prinsipinin pozulmasına da səbəb olmuşdur.

Azərbaycan türkcəsində ilk təzkirə hesab olunan "Gülşəni-şüəra"da Lətifi təzkirəsində bəhs olunmayan 272 şairin həyat və yaradıcılığı haqqında məlumat almaq mümkündür. Başqa təzkirələrdə bəhs olunmayan və yalnız "Gülşəni-şüəra"da rast gələ biləcəyimiz şairlərin sayı 147 nəfərdir.

Ö.F.Akün Əhdi təzkirəsinin çox qiymətli əsər olduğunu xüsusi vurğulayır: "Künhül-ahbar"ın Ahdiyi küçümseyen o bilgili ve tahkiki kuvvetli mağrur müellifi Ali gibi bir şahsiyet bile, bazı hal tercümelerinde ondakı bilgilere yeni hiçbir şey katamayarak aynı muhteva ile onu nakil ve tekrarlamak mecburiyyetinde kalmıştır"[181].

Riyazi h.1018/1609-cu ildə yazdığı təzkirəsində Əhdi təzkirəsinin unudulduğunu yazırsa da[182], bu məlumatı doğru saymaq olmaz. Çünki "Gülşəni-şüəra" Əbdürrəhman Hibrinin "Ədirnə tarixi"nə, "Ənisül-müsamirin" əsərinə və Əsrar Dədənin təzkirəsi-

---

179 Ahdi ve Gülşen-i şuarası (İnceleme-metin). Ankara, 2005, s. 271.
180 İsen M., Kılıc F., Aksoyak İ., Eyduran A. Şair tezkireleri, Ankara, 2002, s.44.
181 Akün Ö.F. Ahdi. DİA, I c. İstanbul, 1988, s. 512.
182 Riyazi. Riyazüş-şüəra. Nurosmaniyyə kitabxanası, No.3724, vər. 102 a.

nə qaynaq olmuşdur. XIX əsrin əvvəllərində P.Hammerdən başlayaraq, Ata Bəyin "Əndərun tarixi"ndə, Məhəmməd Sürəyyanın "Sicilli-Osmani"sində və s. başlıca müraciət qaynaqlarından olmuşdur[183]. Ruhi Bağdadi "Divan"ından isə Əhdi təzkirəsinin Bağdadda nə qədər məşhur olduğunu öyrənirik.

Türkiyədə Cümhuriyyətdən əvvəlki illərdə "Gülşəni-şüəra"nın Vəliyiddin Əfəndi kitabxanasındakı nüsxəsi istisna olmaqla, digər əlyazmaları şəxsi kitabxanalarda mühafizə olunmuşdur[184]. Bu səbəbdən də təzkirədən yetərincə istifadə olunmamışdır. Təzkirənin Sankt-Peterburq Dövlət Universiteti Şərq bölməsində T-16 şifrə altında saxlanılan əlyazma h.1217/1802-ci ildə Abdulla ibn İbrahim Üsküdari tərəfindən köçürülmüşdür. Həcmi 290 vərəqdir. Əlyazmanın fotosurəti Azərb. MEA Əlyazmalar İnstitunda mühafizə olunur.

***Əlyazmaları***

***Təzkirənin üç rövzədən ibarət olan nüsxələri***

*İstanbul Universiteti K/X., İbnül-Əmin kitabları 3111.*
*İstanbul Universiteti K/X. TY 9598.*
*Süleymaniyə K/X. Halət Əfəndi 107.*
*Topqapı Sarayı Muzeyi K/X. Xəzinə 1303.*
*Ankara Genel Kitablığı, Adnan Ötükən 47.*
*İzmir Milli K/X. 1154.*
*Berlin K/X. Ms. or. oct 3449.*
*Bayəzid Dövlət K/X. 10266.*
*Vyana K/X. 379.*
*Yuqoslaviya K/X.*
*Bursa El Xalq K/X.*
*Paris Milli K/X. Turc. 518.*

---

[183] Akün Ö.F. Ahdi. DİA, c. I, İstanbul, 1988, s. 512.
[184] Yenə orada.

***Təzkirənin dörd rövzədən ibarət olan nüsxələri***

*Fateh Millət K/X. Əli Əmiri 774.*
*İstanbul Universiteti K/X. Ty. 2604.*
*Agah Sırrı Levend nüsxəsi, Türk Dil Kurumu K/X. B-55.*
*İstanbul Divan Ədəbiyyatı Muzeyi 669.*
*London Britaniya Muzeyi Add. 7876.*
*Misir Qahirə Milli K/X. M. 108.*
*Sankt - Peterburq Dövlət Universiteti, Şərq bölməsi T-16.*



**Əhdi Bağdadi "Gülşəni-şüəra"**
**Sankt-Peterburq Şərq Əlyazmaları İnstitutu T-16**

# İBRAHİM MİRZƏ SƏFƏVİ

XVI əsrdə təzkirə tərtibləmiş digər bir müəllif Səfəvilər sülasindən olan I Şah İsmayılın nəvəsi və Zəhirəddin Bəhram mirzənin oğlu İbrahim mirzə Əbülfəthdir.

İbrahim mirzə Səfəvi, I Şah Təhmasib zamanında (1524-1576) əvvəlcə Məşhəd hakimi olmuş, daha sonra isə şah sarayında çalışmışdır. I Şah Təhmasib öz qızı Gövhərsultan xanımı ona ərə vermişdir. Axırda II Şah İsmayılın əmri ilə öldürülmüşdür.

I Şah Abbasın (1587-1629) saray tarixçisi İsgəndər bəy Münşi Türkman öz əsərinin Səfəvi şahzadələrindən bəhs edən bölməsində İbrahim mirzə haqqında bu məlumatları verir:

"Bəhram mirzənin ikinci oğlu İbrahim mirzədir. Onun anası Şirvan vilayətinin əsilzadələrinə mənsub idi. O, cənnətməkan şah həzrətlərinin (I Şah Təhmasibin – V.M.) kürəkəni idi və o həzrətin vəfatı zamanı ulu dərgahda eşikağası mənsəbi ilə əzizlənmiş və şərəflənmiş bir vəziyyətdə idi. O, yüksək qabiliyyətə, istedada, ağıla və idraka malik idi və ali dərəcəli əmisinin (I Şah Təhmasibin – V.M.) hüzurunda əziz, möhtərəm, sözükeçən, əhəmiyyətli, rəyi dinlənən və məşvərətçi bir şəxs idi. Daha sonra qeyd edəcəyimiz kimi, İsmayıl mirzənin (II Şah İsmayılın – V.M.) zamanında şəhidlik şərbətini nuş etmişdir… Sözügedən Sultan İbrahim mirzə çeşidli fəzilət və kamilliklərlə bəzənmiş və incəsənət fənləri ilə zinətlənmiş bir şəxs olub, zəmanənin istedad sahiblərindən idi. O, nəstəliq xətti ilə çox yaxşı yazırdı və incə qələmli bir müsəvvir (rəssam – V.M.) idi. Musiqi və ədvar (musiqi nəzəriyyəsi – V.M.) elmində zəmanənin öncülü idi. O, musiqi bəstələmək sahəsində Mövlana Qasım Qanuninin şagirdi olmuşdur. Yaxşı saz çalardı. Dülgərlik etmək, saz yonmaq və mozaika ("xatəmbəndi") yaratmaq sənətlərində böyük məharətə malik idi. Xorasanda olarkən əksər vaxtlarda şairlərlə, nəzm və bəlağət sahibləri ilə söhbət edərdi və özü də "Cahi" təxəllüsü ilə şeir yazardı. Ondan aşiqanə qəzəllər

qalmışdır. O cümlədən bu iki məqtə onun əhvalatını qələmə alarkən xatirimizə gəldi:

Qitə

Getmək anı yetəndə yar gəlib çıxdı,
Cahi, Gözünü aç ki, əgər görməyə taqət varsa.

Qitə

Min gecədən sonra ki, sən yarla görüşdün,
Cahi, fürsətdir, gözünü ondan ayırma.

Onun yaratdığı böyük kitabxana[dakı kitablar] köhnə ustadların və gözəl yazan xəttatların xətlərindən və misli-bərabəri olmayan qızıl qələmli müsəvvirlərin çəkdikləri təsvirlərdən ibarət idi. Onun mülkiyyətində çoxlu digər töhfələr də vardı. Onun çinixanası Çin və Xəta nigarxanalarını utandırırdı. [İbrahim] mirzənin [ölüm] hadisəsindən sonra onun möhtərəm hərəmi o əsərlərin İsmayıl mirzənin əlinə keçməməsi üçün onların əksəriyyətini suya tökdü, çiniləri sındırdı, qalanlarına isə od vurdu və mirzənin matəmi üçün həddən artıq fəryad və fəğan qopardı. Axırda o, ahu-zarının çoxluğu üzündən xəstələnib, yorğan-döşəyə düşdü və elə həmin ay fani dünyaya vida edib, əbədiyyət aləminə qovuşdu"[185].

II Şah İsmayıl taxta çıxdıqdan sonra Şamxal sultan onun əmri ilə h. 984/1576-cı ildə İbrahim mirzəni öldürmüşdür. Mirzə bəy Cünabədi bu hadisəni belə təsvir edir: "Bəhram mirzənin oğlu İbrahim mirzə xeyli istedada, təb lətafətinə, gözəl nəzmə və yaxşı xəttə malik idi, təxəllüsü Cahi idi, ovtar (simli musiqi)fənnində və digərlərində kamal sahibi idi və həmin vaxt (yəni h.984/1576-cı ildə II İsmayıl hakimiyyətə gələrkən – V.M.) darüssəltənə Qəzvində yaşayırdı. II Şah İsmayıl da yaxşı təbə və zehnə malik idi və çox yaxşı şeirlər deyirdi. Təxəllüsü Adil idi. Hələ o, hakimiyyətə gəlməzdən əvvəl İbrahim mirzə ilə müşairə və mükalimə etmişdi

[185] İsgəndər bəy Münşi Türkman. Tarixi-aləmarayi-Abbasi. I cild / farscadan tərcümənin, ön sözün, şərhlərin və göstəricilərin müəllifləri: O.Ə.Əfəndiyev və N.S.Musalı. Bakı: Təhsil, 2009, 423-424.

və cənab mirzə onun cavabında bir şeir demişdi, bu isə onların arasında inciklik yaranmasına səbəb olmuşdu. Bu inciklik İsmayılın xatirində qalmışdı və o, padşah olduğu vaxt şahzadələrin həlak edilməsinin əncamını çəkən zaman bir qorçuya əmr etdi ki, İbrahimi qətlə yetirsin. Həmçinin qatilə demişdi ki, İbrahim mirzənin ömür boyu yığdığı sərvət sənin ixtiyarına keçəcəkdir. Həmin qorçu padşahın əmri ilə mirzənin evinə getdi və hökmü həyata keçirib onu öldürdü. Amma padşahın doğma bacısı mirzənin arvadı idi və dərhal matəm və şivən qopardı. O, mirzənin mal-dövlətinin və cavahirlərinin qorçuya verilməməsi üçün onları xarab etdi və nəfis əşyaları çaya tulladı. Qadın bundan sonra şəxsən özü İbrahim mirzənin cəsədinə qüsl verdi, onu kəfənə tutdu, iki rükət namaz qıldı, həmçinin onun ölümünün səbəbkarlarına nifrin yağdırdı”[186].

Deyilənlərə görə, İbrahim mirzə ölümünün yaxınlaşdığını bilmiş və II Şah İsmayıla belə bir məktub yazmışdır[187]:

Ey qardaş, boyama sən əlini insan qanından,  
Əlin üstə digər bir əl var ki, güclüdür ondan.  
Fələk o adamın ki, başına qızıl tac qoyar,  
Axırda qara torpaq altında onu quylayar.

Qəbrimiz bir neçə ay səninkindən köhnə görünər, ancaq sən bu çirkin işlərinlə ömründə bəhrə almazsan. Ey ağam, səkkiz ay şahlıq müddətində ədalətli şahın fərmanı ilə 44220 nəfər dövlət işçisi və qara camaat günahsız olaraq öldürülmüşdür ki, onlardan 320 nəfər peyğəmbər övladıdır. Onların çoxu həddi-büluğa çatmamış, məsum idilər. Bu dünyanı və axirəti yaradan Allah səndən haqq-hesab istəyən gündə ona nə cavab verəcəksən? Sənin əhvalın o baqqala bənzəyir ki, gün batana yaxın dükanını açar. Onun bu müddətdə nə qədər alveri olar, məlumdur. Sənin cavanlığının yaxşı

---

[186] Mirzə bəy Cünabədi. Rövzətüs-Səfəviyyə. Be kuşeş-i Qulamrza Təbatəbayi Məcd. Tehran, 1378, s. 579-580.

[187] Bax: Kərimov P. Şah İsmayıl Xətainin nəvəsi İbrahim Mirzənin ana dilində şeirləri // Azərbaycan. - 2012. - № 1. s. 184-189.

dövrü ötmüş, ömründən 48 il keçmişdir. Hər şeydən agah olan Allah bilir ki, kafirlərə qarşı müharibədə mən həmişə şəhid olmağı arzulayardım. İndi isə ümid edirəm ki, şəhidlərə qoşulacağam. "İnna lillah və inna ileyhi raciun" ("Allahdanıq və ona qayıdacağıq")[188].

İstəyirsən sən nəslimizə son qoyasan?
Bu nə cinayət? Görüm nəsilsiz qalasan!"

Qazi Əhməd Qumi İbrahim mirzənin yazdığı şeirlərin 3000 beytdən artıq olduğunu, divanına arvadı Gövhərşad banunun dibaçə yazdığını, Qazi Əhməd Quminin atası Mir Münşinin isə bu əsəri köçürdüyünü qeyd edir[189].

Bu şahzadə müxtəlif hünər sahələrində mahir olmuş və sənətkarları himayə etmiş, zəngin bir kitabxana qurmuşdur[190].

İbrahim mirzə haqqında məlumat verən Məmmədəli Tərbiyət yazır: “Mir münşi oğlu Hacı Əhməd Qumlunun qeyd etdiyinə görə, bu şahzadənin qiymətli kitabxanasında bir çox dəyərli kitablar və az tapılan albomlar vardır. Bu albomların birində görkəmli xəttatların yazısı, ustad Behzad və digər rəssamların əsərləri toplanmışdır. Bu albomun qiyməti bir ölkənin birillik dövlət büdcəsinə bərabərdir”[191]. Tərbiyət "Xansahibin bayazı", "Gülüstani-hünər" və "Xülasətül-əşar"a istinadən İbrahim mirzənin şeirlərindən farsca örnəklər təqdim etmişdir.

Elə bilmə ki, gözləri heç aldatmaq bacarmır,
Elə göstərir ki, guya hiylə satmaq bacarmır.

---

188 Tərbiyət Məhəmmədəli. Danişməndani-Azərbaycan (fars dilindən tərcümə edənlər: İsmayıl Şəms, Qafar Kəndli). Bakı, 1987, s. 164.

189 Məmmədova Ş. “Xülasət ət-təvarix” Azərbaycan tarixinin mənbəyi kimi. Bakı, Elm, 1991, s. 103-104.

190 Cavad Heyət. Azərbaycan ədəbiyyatına bir baxış. Bakı, 1993, s.63.

191 Tərbiyət Məhəmmədəli. Danişməndani-Azərbaycan (fars dilindən tərcümə edənlər: İsmayıl Şəms, Qafar Kəndli). Bakı, 1987, s.162.

Dilbər canıma qəsd edir, öcəşir yenə,
Davamsız dünya tək ondan vəfa gözləmə!

Camalın görməyə tabım yox, baxmayaraq,
"Ləntəbani" deyir, tənə vurur o mənə.

Atın tərifinə deyilmiş şeir:

Şığan oxdur, ötən fikir, arzu tək sevinc yaradır,
Döyünən ürəkdir, axan xəyal, göyləri sarsıdır.

Çapır, sanki yaşıl günbəz üstə damcıdır o süzür,
Qıdıqlayır külək onu, yerindən qovlayır, üzür.

Hərəkətdə incə, huşda misli yoxdur bu dünyada,
Qədəh yanından ötsə, nə qədəh tərpənər, nə badə.

F.e.d. Paşa Kərimov İbrahim mirzənin həyat və yaradıcılığından bəhs edən və türkcə şeirlərini əhatə edən bir məqalə nəşr etdirmişdir. Tədqiqatçı yazır: “İllərlə axtarışdan sonra İbrahim mirzənin Azərbaycan türkcəsində yazdığı şeirləri Almaniyada yaşayan həmvətənimiz Məhəmmədəli Hüseyni Tehranın Saray kitabxanasından aşkar edərək surətini çıxartmış, AMEA-nın Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutuna göndərmişdir. Aşıq şeiri formasında yazılan bu 27 şerin, varsağıların dili çox aydın və sadədir. Şair bu şeirlərin son bəndində İbrahim imzasından istifadə edibdir...Şairin bu şeirlərini nəzərdən keçirərkən ilk növbədə, Şah İsmayılın xalq şeir üslubunda yazdığı qoşma, varsağı, gəraylı və bayatıları yada düşür...”.

Orasını da qeyd etmək istərdik ki, İbrahim mirzənin haqqında danışdığımız şeirləri 1581-ci ildə köçürülmüşdür”[192]. Məqa-lə-

[192] Kərimov P. Şah İsmayıl Xətainin nəvəsi  İbrahim Mirzənin ana dilində şeirləri  // Azərbaycan. - 2012. - № 1. s. 186.

nin sonunda P.Kərimov ilk dəfə olaraq şairin türkcə şeirlərini oxucuların diqqətinə çatdırmışdır:

Məni böylə zar eyləmə,
Aman dilbər, aman dilbər.
Dərdə giriftar eyləmə,
Aman dilbər, aman dilbər.

Qeyr ilə həmsüxən olma,
Bəlayi-canü tən olma;
Mana böylə düşmən olma,
Aman dilbər, aman dilbər.

Bir dəm mana yar ola gör,
Mərhəmi-əsrar ola gör;
Qəmimə qəmxar ola gör, -
Aman dilbər, aman dilbər.

Gözdən qanlu yaşum axdı,
Hicrin məni oda yaxdı;
Həsrətindən canım çıxdı, -
Aman dilbər, aman dilbər.

İbrahim der, gözəl xanım,
Çıxdı əflakə əfğanım;
Hicrində qalmadı canım, -
Aman dilbər, aman dilbər.

***

Şol zamanın cövhərindən,
Könül, incinmə, səbr eylə.
Əhli-aləmin tövründən,
Könül, incinmə, səbr eylə.

Fələk sana cəfa qulur,
Görəlim kim, sonu nolur
Bu dünyadur, böylə olur,
Könül, incinmə, səbr eylə.

Seyli-qəm cuş edib daşdı,
Möhnətü-qəm həddən aşdı,
Neyləyəlim, böylə düşdi,
Könül, incinmə, səbr eylə.

Necə kim, bidad etmələr,
Sənin qətlünə yetmələr,
Necə səni incitmələr,
Könül, incinmə, səbr eylə.

İbrahim der: ol sərvi-naz,
Olmaz bizə məhrəmi-raz,
Həq kərimdür, böylə qalmaz,
Könül, incinmə, səbr eylə.

İbrahim mirzənin məclisləri həmişə elm və ədəbiyyat xadimlərinin yığıncağı olmuş, Hindistana səfər edən hər bir söz ustası Xorasandan keçdikdə İbrahim mirzə onu bir müddət qonaq saxlayar və ona böyük hörmət göstərərdi.

İbrahim mirzə görkəmli söz ustalarının tərcümeyi-halı və əsərlərindən nümunələri əhatə edən "Fərhəngi-İbrahim" adlı təzkirə yazmışdır[193]. M.Tərbiyət yazır ki, bu təzkirə "Səfinəyi-Xoşgu" müəllifinin istifadə etdiyi mənbələrdən olmuşdur. Təzkirə dövrümüzə çatmadığı üçün bu məlumatla kifayətlənməli oluruq.

[193] Tərbiyət Məhəmmədəli. Danişməndani-Azərbaycan (fars dilindən tərcümə edənlər: İsmayıl Şəms, Qafar Kəndli). Bakı, 1987, s.163; Məmmədova Ş. "Xülasət ət-təvarix" Azərbaycan tarixinin mənbəyi kimi. Bakı, Elm, 1991, s. 104.



**İbrahim mirzənin “Gülüstani-hünər” adlı əsərdəki minyatürü**

# TÖVFİ TƏBRİZİ

Tövfi Təbrizi h. X/m.XVI əsrin ikinci yarısında öz zamanının şairləri haqqında "Təzkireyi-Tövfi" adlı təzkirə qələmə almışdır. Sadiq bəy Əfşar bu şair haqqında məlumat vermiş, hətta onu tənqid etmişdir: "Təbrizlidir. Şairliyi mötəbər sayılmadığından sərrafçılıqla gün keçirirdi. Hal-hazırda deyirlər ki, o vilayətdə nəzm əhli onu qəbul edir. Həqiqətən, zövqü və aşiqliyi olan bir insandır. Lahican şəhərində onunla rastlaşdım. Vaxtını kimyagərliklə keçirirdi. Bu fənndə dərrakəsizliyinə baxmayaraq, risalə də yazmışdı. Yoxlamaq xatirinə məndən soruşdu: "Həcərin (daşın) neçə növü var?". Dedim: "Sən de görüm həcər nədir, mən deyim neçə növü var". Və məlum oldu ki, həcər sözünün mənasını bilmir. Çox sadəlövh insandır. Hər halda, yaxşı şeirləri var. Bu beytlər də o cümlədən (16 beytini nümunə göstərir)"[194].

Sadiq bəydən fərqli olaraq, "Zikri" təxəllüslü Təqiəddin Məhəmməd ibn Şərəfəddin Əli əl-Hüseyni əl-Kaşani "Xülasətül-əşar və zübdətül-əfkar" əsərində öz müasiri olan Tövfinin şairliyini yüksək qiymətləndirmiş, onu "Təbrizin seçkin şairlərindən" hesab etmiş, "şairlikdə təbinin mükəmməl dərəcədə yüksək" olduğunu vurğulamış, "rəngin qəzəllərə və mətin qəsidələrə" malik olduğunu qeyd etmiş və yaradıcılığından 316 beyt örnək vermişdir. Zikri eyni zamanda Tövfinin təzkirəsi haqqında da məlumat vermişdir: "Amma öz şairliyi və öz şeirinə olan inamı ilə yanaşı, digərlərinin də şeirlərini toplamış və deyirlər ki, son dərəcə yaxşı bir "Təzkirətüş-şüəra" yazmışdır. Və bu əyyamda fəsahət meydanında at çapmaqda olan şairlərin çoxusu haqqında həmin əsərində məlumat vermişdir"[195]. Qeyd edək ki, Zikrinin Tövfi haqqında qeydləri h. 992/1584-cü ilə aiddir.

Məhəmmədəli Tərbiyət təzkirəsində Tövfi haqqında yazır: "Təbrizin tanınmış şairlərindəndir. O, şairlikdə və şeir yazmaqda

---

[194] Sadiq bəy Sadiqi. Məcməül-xəvas. Bakı, 2008, s.204-205.
[195] Məani Ə.G. Tarixi-təzkirəhayi-farsi. I c., s. 312-313.

tay-tuşlarından fərqlənərdi. Tövfi qəzəldə isfahanlı Mövlana Zəmirinin şivəsini izləyirdi. Onun bir çox məzmunlu, aşiqanə şeirləri vardır. Tövfi həmişə müxtəlif çalarlı qəzəllər və səlis qəsidələr yazar, başqa şairlərin şeirlərini də toplayardı. O, rəvan dildə bir təzkirə tərib etmiş, orada öz dövründəki bir çox fəsahətli şairlər haqqında məlumat vermişdir. O dövrdə yaşayan şairlərin çoxu, o cümlədən Əczi, Səburi və həkim Əbu Talib onun şagirdlərindən olmuşlar"[196]. M.Tərbiyət bu məlumatları "Xülasətül-əşar" və "Sühufi-İbrahim" adlı əsərlərinə istinadən verir. Daha sonra M. Tərbiyət "Şəmi-əncümən" əsərində Tövfi haqqında verilmiş məlumatı olduğu kimi təqdim edir: "Tövfi zərgərlik edərdi. O, bütün varını kimyagərliyə sərf etmiş, bir nəticəyə də çatmamışdır. Ola bilsin ki, Gilan havasının təsirində Tövfi belə bir həvəsə düşmüşdür, yoxsa səliqəli şairlər simurq quşu ovlamaq kimi belə boş fikirlərə düşməzlər. Tövfinin təzkirəsi və iyirmi min beytdən ibarət divanı vardır"[197]. Təzkirədə Tövfinin şeirlərindən dörd beyt nümunə verilmişdir:

Eşq oduna yanana qəmindən uzaqlıq çətin,
Didara alışana ayrılıq bir dərddir gərgin.

Divardakı şəklə can verib dirildən o canan,
Bir baxışla divara çevirdi, aldı məndən can.

Xəlvətdə rəqiblə görüşmüş olsan da əgər,
Utancaqlığın min gözətçiyədir bərabər.

Etdin cəfa mənə, sən görməyəsən heç bir an,
Miskin Tövfi diləyi ancaq budur Allahdan.

---

[196] Məhəmmədəli Tərbiyət. Danişməndani-Azərbaycan. Bakı, 1987, s. 337.
[197] Yenə orada, s. 337.

Təzkirə müəllifi olan Tövfi eyni zamanda "Divan" sahibi olmuşdur. Lütfəli bəy Azər onun "Divan"ını şəxsən gördüyünü bildirir[198].

Təəssüf ki, "Təzkireyi-Tövfi" haqqında Sadiq bəy Əfşarın, Lütfəli bəy Azərin, Zikrinin, M.Tərbiyətin və Ə.G.Məaninin qeydlərindən savayı, əlavə məlumat əldə edə bilmədik.

---

198 Məmmədova M. Lütfəli bəy Azər və Azərbaycan ədəbiyyatı. Bakı: 2001, s. 93.

# SADİQ BƏY ƏFŞAR

Görkəmli Azərbaycan şairi, xəttatı, rəssam-naqqaşı, musiqişünası olan Sadiq bəy Əfşar həm də təzkirəçidir. Sadiqi Təbrizin Vərci məhəlləsində h.939/1532-33-cü ildə anadan olmuş, babası Sadiq bəy türk xudabəndəli elindən olub, eli ilə birlikdə Şah İsmayıl zamanında Şamdan Azərbaycana gəlib yerləşmişlər[199]. Lütfəli bəy Azər və Şəmsəddin Sami Sadiqinin əfşar tayfasına mənsub olduğunu yazırlar[200].

Sadiqinin naqqaşlıq və rəssamlıq sahəsində böyük xidmətləri olmuşdur. İsgəndər bəy Türkman Sadiqinin rəssamlığından danışarkən onun "əvəzsiz müsəvvir", "iti qələmli rəssam" adlandırır[201]. Sadiqinin rəssamlığından bəhs edən Rocer Seyvori yazır: "…Saray kitabxanasının kitabdarı kimi yüksək bir vəzifəyə ucalmış aqressiv və çılğın dahi olan Sadiq bəy Əfşar rəssamlıqda heyrətamiz realizm nümayiş etdirirdi ki, bu da Səfəvi incəsənətində yeni bir yolun əsasını qoymuş və XVII-XVIII əsrlərdə realizmin yüksəlməsinə gətirib çıxarmışdı"[202].

Sadiqi II Şah İsmayılın dövründə sarayda kitabxanaçılıq xidmətinə başlamış, I Şah Abbas dövründə "kitabdar" (saray kitabxanasının müdiri) vəzifəsinə təyin olunmuşdur. Bir müddət sonra Sadiqi bu vəzifədən uzaqlaşdırılmışdır. Nəvaişünas f.e.d. C.Nağıyeva Sadiqi Kitabdarın Nəvai ilə yaradıcılıq əlaqəsindən bəhs edərkən yazır: "…saray kitabxanasında Sadiqi Nəvainin əsərlərini mütaliə edə-edə, əsərlərini nəstəliq xətti ilə köçürə-köçürə, onları bədii cəhətdən müəyyənləşdirib tərtib edə-edə Nəvai sənətinə, onun əsərlərinə vurulmuş və cığatay dilini öyrənmişdir"[203]. Sa-

---

[199] Muradova M. Sadıq bəy Sadiqinin həyat və yaradıcılığı. Bakı: 1999, s.20.
[200] Şəmsəddin Sami. Qamusul əlam. IV c., s. 2913.
[201] İsgəndər bəy Türkman. Tarix-e aləmara-ye Abbasi. Moəllef-e moqəddeme və gərdavərənde-ye fehrest İrəc Əfşar. Tehran, 1350, s.260.
[202] Savory R. Iran under the Safavids. Cambridge, 1980, p.131.
[203] Nağıyeva C. Azərbaycanda Nəvai. Bakı: Tural-Ə, 2001, s. 160.

diq bəy ondan artıq müxtəlif nəzm və nəsr əsərlərinin müəllifidir. Bunlar arasında onun türk və fars dillərində qələmə aldığı şeirlər "Divan"ı, "Qanunüs-süvər" risaləsi, Şah Abbas hakimiyyətinin ilk illərindən və apardığı müharibələrdən bəhs edən "Fəthnameyi-Abbasi-namdar" adlı poeması, nəsihətnamələri və mənzum hekayələri də vardır. Sadiqi "Külliyyat" da tərtibləmişdir. "Külliyyat"a daxil olan əsərləri içərisində şübhəsiz ki, ən önəmlisi və qiymətlisi "Məcməül-xəvas" adlı təzkirəsidir. Cığatay türkcəsində tərtiblənmiş ikinci təzkirə nümunəsi olan "Məcməül-xəvas" I Şah İsmayıl dövründən yazıldığı zamana qədər yaşayıb-yaratmış fars və türk əsilli şairlərdən bəhs edir. "Məcməül-xəvas"ın yazılma ili məlum olmasa da, tədqiqatçılar bu tarixin təxmini olaraq 1607-1608-ci ilə təsadüf etdiyini müəyyənləşdirmişlər[204].

Sadiq bəy təzkirəsini tərtibləmək üçün uzun illər ərzində məlumat toplamışdır. Prof. Q.Kəndli Sadiqinin "Məcməül-xəvas"a yazdığı müqəddiməyə əsasən, bu əsərin Şah Abbasın gəncliyində və padşahlığının ilk dövründə yazıldığını göstərir:

Yüz şükr ki, bu təzkireyi-xeyri kəlam,
Bu şahi-cahan zamanında buldı tamam.
Ol ki, dəftərxaneyi-qədrında səbt etmiş adın,
Şahi-Abbas Əbülfəthi-Müzəffər giridar.
Bu şahənşahi-cavanbəxtin nihali-dövləti,
Gülşəni-iqbalü nüsrət icrə bulsun payidar[205].

İsmayıl Hikmət və Məntiqə Muradova isə təzkirənin h.1007 /1598-99-cu ildə yazıldığını irəli sürmüşlər[206]. Təzkirə ***ön söz, səkkiz "məcmə"*** və ***xatimə***dən ibarətdir.

---

[204] Kəndli-Herisçi. Sadıq bəy Sadiqinin həyat və yaradıcılığı haqqında bəzi qeydlər // Azərbaycan ədəbiyyatı məsələləri. Bakı: 1964, s.233; Levend A.S. Türk edebiyyatı tarihi. Ankara, 1984, s.257; İsen M., Kılıc F., Aksoyak İ., Eyduran A. Şair tezkireleri. Ankara, 2002, s.78; Kılıç F. XVII. yüzyıl tezkirelerinde şair ve eser üzerine değerlendirmeler. Ankara, 1998, s.XXX.

[205] Kəndli-Herisçi. Sadiq bəy Sadiqinin həyat və yaradıcılığı haqqında bəzi qeydlər // Azərbaycan ədəbiyyatı məsələləri. Bakı, 1964, s. 233.

***Müqəddimədə*** Sadiqi farsca və türkcə şeir yazan şairləri toplayan Caminin "Baharistan", Əlişir Nəvainin "Məcalisün- nəfais", Dövlətşah Səmərqəndinin "Təzkirətüş-şüəra" və Sam mirzənin "Töhfeyi-Sami"sindən söz açır: "Lihəzə xub-alamlıq fars nuktəpərdazları və mərğub-kəlamlıq türk süxənsazları bu cəmaət pərişanlığı cəmiyyəti içün və bu taifə cəmiyyəti pür-nişanlığı içün şayəstə məclislər və bayəstə məhfillər arastə və pirastə qılıbdurlar. Əvvəla Şeyxül-İslami Əbdürrəhman Caminінq "Baharistan"ınınq bir rövzəsidur və yinə Əmiri-Kəbir Əlişirinq "Məcalisün-nəfais"idür və yenə Təzkireyi-Dövlətşahdur və yenə şahzadeyi-aləm və aləmiyanınq "Töhfeyi-Sami"sidür"[207].

Bunun ardından müəllif təzkirəçilik silsiləsinin pozulmaması üçün bu əsəri yazdığını bildirir: "Bu silsilə sər halqayi-intizamı bir-biridin üzülməsün diyü və bu təzkirələr sər-riştəsi pozulmasun diyü"[208]. Sadiqi təzkirəsini Əlişir Nəvainin "Məcalisün-nəfais" adlı təzkirəsindəki üsula və tərtibə uyğun olaraq səkkiz məclisə ayırdığını və təzkirəsinin adını "Məcməül-xəvas" qoyduğunu da müqəddimədə qeyd edir. Müqəddimənin sonunda təzkirəsini dövrün hökmdarı Şah Abbasa ithafən yazdığını bildirir və ona dua edir.

"Məcməül-xəvas"ın strukturu aşağıdakı kimidir:

*Birinci məcmə* şairlik istedadı olan müasir paşahlar (12 şair);

*İkinci məcmə* şahzadələr (8 şair);

*Üçüncü məcmə* səltənət sütunu olan türklər (11 şair);

*Dördüncü məcmədə* səltənət sütunu olan taziklər (33 şair);

*Beşinci məcmədə* səltənət sütunu olan türklərin və taziklərin böyük övladları (15 şair);

*Altıncı məcmə* peyğəmbər nəslindən olan şairlər (39 şair);

---

[206] İsmayıl Hikmət. Azərbaycan ədəbiyyatı tarixi.II c. Bakı, s.89; Muradova M. Sadiq bəy Sadiqinin həyat və yaradıcılığı. Bakı, 1999, s. 42.

[207] Təzkireyi-Məcməül-xəvas be zəbani-türkiyi-çəğatayi. Təlif-i Sadiqiyi-Kitabdar və tərcümeyi-an be zəbani-farsi be xameyi-Əbdürrəsul Xəyyampur. Təbriz, 1327, s.3.

[208] yenə orada s.3.

*Yeddinci məcmə* türk, fars və ərəb dillərində söz demək qüdrətinə malik olub, ərəb və əcəmdə şöhrət tapmış 28 türk şairi;

*Səkkizinci məcmə* əcəmin müasir fəsahət və bəlağət sahiblərindən olan 222 şair.

Təzkirənin Əbdürrəsul Xəyyampur tərəfindən hazırlanmış mətnində 333 şair haqqında məlumat verilmişdir. Külliyyatda isə bu rəqəm 369-a çatır.

Xatimədə Sadiq bəy Əfşar öz şeirlərindən bir neçə beyti nümunə olaraq vermişdir.

Təzkirənin xatiməsində özünün də əsərdə zikr etdiyi şairlərdən kənarda qalmamasının məqsədəuyğun olmadığını bildirən Sadiqi şeirlərinin "ərbabi nəzmə" çatması üçün bu hissədə bəzi beytlərini vermişdir. Sadiqi Nəvainin "Məcalisün-nəfais"inə maraq göstərmiş və ona müvafiq olaraq səkkiz bölmədən ibarət təzkirə yazmış və "Məcməül-xəvas" adlandırmışdır[209]. Ancaq Nəvaidən fərqli olaraq, Sadiqi təzkirəsində seyidlərdən və türk şairlərindən ayrıca bəhs etmişdir. Təzkirədə şairlər təxəllüslərinə görə deyil, adları əsasında sıralanmışdır. Digər təzkirələrdə olduğu kimi, burada da lətifələrə, rəvayətlərə rast gəlmək mümkündür. Ancaq şairlərin doğum və ölüm tarixləri əsasən verilməmişdir. Sadiqi bu kitabda türk dili və ədəbiyyatını bütünlükdə ələ almış, mövcud üç ədəbi şivəsinin şairlərini tanıtmış və əsərlərindən örnəklər vermişdir[210]. Bəzi tədqiqatçılar təzkirənin azərbaycanca, bəziləri özbək-cığatay ləhcəsində, bəziləri isə cığatay-azərbaycan ədəbi dilində yazıldığını irəli sürürlər. Prof. F.Köprülü  Sadiq bəy Sadiqidən bəhs edərkən yazır: "Türkcə şeirlərindən başqa cığatay ləhcəsi ilə şüəra təzkirəsi yazması, azərbaycanlı şairlərlə bərabər, tanınmış Osmanlı və cığatay şairlərindən də bəhs etməsi, türkçənin müxtəlif ədəbi ləhcələrini çox yaxşı bildiyinə və geniş mənası ilə türk mədəniyyətinə qiymət verdiyinə dəlalət edir"[211].

---

[209] Muradova M. Sadıq bəy Sadiqinin həyat və yaradıcılığı. Bakı, 1999, s.42.
[210] Heyət C. Azərbaycan ədəbiyyatına bir baxış. Bakı, 1993, s.62.
[211] Köprülü F.Edebiyat araştırmaları. 2.c. İstanbul, 1989, s. 50.

XVI-XVII əsrin əvvəllərində yaşayıb-yaratmış şairlərin həyat və yaradıcılığından bəhs edən bu təzkirə Şah Təhmasib, Sultan Məhəmməd Xudabəndə, Şah İsmayıl Xətai, Bəhram mirzə, Əlqas mirzə, Sam mirzə, Sultan İbrahim mirzə, Sultan Həsən mirzə, Sultan Mustafa mirzə, Füzuli, Şərif Təbrizi, Kəlbəli, Nəcati Rumi, Baqi Çələbi, Qəzali Təbrizi, Rami Ordubadi və başqaları haqqında məlumat verməsi baxımından dəyərlidir.

Məsələn, bir azərbaycanlı şairin həyat və yaradıcılığı Sadiqinin qələmi ilə bu şəkildə təsvir olunmuşdur: "Pirqulu bəy – Yusif bəy Ustaclunun qohumlarındadır. Mərhum şahın zamanında Sultan Hüseyn mirzənin lələsi idi. Varlı adamdır. Şeir də yazır. Divan bağlamağa müvəffəq olub. Bu beyt onundur:

Xətti-əksi görünür dideyi-giryan içrə,
Mur xeyli güzəri düşdi məgər qan içrə.

"Məcməül-xəvas"ı ədəbi əlaqələr tarixi baxımından qiymətləndirən f.e.d. C.Nağıyeva təzkirədə Şahinin Şah İsmayıla, Susəninin Nəvaiyə cavablarını bu cəhətdən əhəmiyyətli olduğunu yazır[212]. Bundan əlavə, Sadiqi əsərində Orta Asiya şairləri ilə bərabər, Anadolu şairlərinə də yer ayırmışdır. Təzkirəçi əsərin birinci məcməsində Mühibbi təxəllüsü ilə şeir yazan Sultan Süleyman, türk şairlərindən bəhs olunan yeddinci məcməsində dövrünün "sultanüş-şüəra"sı sayılan Necati bəy və Baqi haqqında məlumat vermişdir.

Sadiqi əsərində şairlərə tənqidi münasibətini də bildirmişdir. Məsələn, Məhəmməd bəy Məzaqidən bəhs edən təzkirəçi yazır: "...Hakimliyinin əvvəllərində dörd-beş yüz qızılbaş mücahidini qonşu ölkə ilə müharibədə qırğına verdi, təkcə özü sağ qaldı. Həqiqətən də o "şücaət və səxavət" sahibindən doğru bir söz eşitmədim. "Yalançının yaddaşı olmaz" məsəli doğrudur". Sadiq bəy Əhməd bəy Müşşərrəfin yaxşı şeir təbi olduğunu, lakin az məşğul olduğunu, istəsə yaxşı şeir deyə biləcəyini qeyd edir. Mir Hüzuri

[212] Nağıyeva C. Azərbaycanda Nəvai. Bakı, 2001, s. 156.

Qumi, Mir Əşki, Mir Əbu Turab, Mir Münha, Mir Cəzmi, Mövlana Vəli, Mövlana Heyrəti təxəllüslü şairlərdən bəhs edən Sadiqi onların yaradıcılığı və xarakterləri haqqında tənqidi münasibətini bildirmişdir.

Sadiqi özündən əvvəlki bir çox təzkirəçilərdən fərqli olaraq, dövrünün sənətkarlarının yaradıcılığı haqqında ümumi fikir və mülahizələr irəli sürməklə kifayətlənmir. O, həm də haqqında bəhs açdığı sənətkarların ədəbi irsinin uğurlu və qüsurlu tərəflərini qiymətləndirməyə, onların fərdi cizgilərini verməyə çalışmışdır. Bu cəhətdən şairin müasirləri olan ayrı-ayrı sənətkarların yaradıcılığı, xüsusilə onların lirik şeirlərinin ictimai mənasını başa düşmək üçün əhəmiyyəti çoxdur[213].

AMEA Əlyazmalar İnstitutunda Sadiqi Əfşarın "Külliyyat"ının Təbriz nüsxəsinin fotosurəti mühafizə olunur[214]. Külliyyata daxil olan əsərlərdən biri də "Məcməül-xəvas" təzkirəsidir. Təzkirənin külliyyata *"Bəqiyyeyi-təzkireyi-şüəra"* adı ilə daxil edilmiş qismində, altıncı məcmənin sonunda, Mir Sədrəddin Məhəmmədin həyat və yaradıcılığının təsvirindən sonra və Mövlana Təbi Yəzdinin bioqrafiyasından öncə, "Məcməül-xəvas"a aidiyyatı olmayan 138 türk-Osmanlı şairi haqqında qısa məlumat və əsərlərindən nümunələri əhatə edən anonim bir təzkirə yer almışdır. Təzkirə indiyə kimi təhlil və tədqiq olunmamışdır. Bu səbəbdən əsərə dair tədqiqatlarımızı burada verməyi məqsədəuyğun hesab edirik.

Bu əsər haqqında ilk məlumatı hələ 1961-ci ildə ***Hacı Hüseynağa Naxçıvani***[215] vermişdir. Daha sonra filol. e. n. ***Məntiqə Muradova*** bu təzkirədən bəhs etmiş, "türkoloqların bu qiymətli əsərdən istifadə etmədiklərini" qeyd etmişdir və orada əksini tapmış bir neçə şairin adını sadalamışdır[216]. Qəribədir ki, "Məcməül-

---

[213] Azərbaycan ədəbiyyatı tarixi. III c., Bakı, 2009, s. 563-564.

[214] Sadiq bəy Sadiqi. Külliyyat. Əlyazmalar İnstitutu, FS-27.

[215] Hacı Hüseynağa Naxçıvani. Məhəmməd Naxçıvani və şərhi-bəzi əz kütübi-xətti və asari-vey // Nəşriyyeyi-məxsusiyi-kitabxaneyi-milliyi-Təbriz. H.1341, N 2, s. 490.

[216] Muradova M. Sadıq bəy Sadiqinin həyat və yaradıcılığı. Bakı: Elm, 1999, s. 51.

xəvas"ın 2008-ci ildə işıq üzü görmüş Azərbaycan dilindəki nəşrində naşir bu haqda məlumatı ilk dəfə məhz özünün təqdim etdiyini yazır və anonim təzkirədəki şairlərin sadəcə siyahısını təqdim edir: *"Külliyyatı görmədən fikir yürütmüş və ya yürüdülmüş fikri təkrarlamış tədqiqatçıları pərişan edə biləcək bir məqam da budur ki, təzkirənin altıncı məcməsinin sonunda – peyğəmbərlər nəslindən olan şairlər fəslində bu fəslə aidiyyatı olmayan 138 orta əsr türk-Osmanlı şairinin adı sadalanır..."*[217]. Halbuki Osmanlı şairlərindən bəhs edən həmin təzkirənin mövcudluğu yarım əsrdir ki, elmi ictimaiyyətə bəllidir. Bu əsər 2012-ci ildə "Anonim Osmanlı təzkirəsi" adı ilə nəşr olunmuşdur[218]. Kitabda təzkirənin transfoneliterasiya olunmuş mətni yer almaqdadır. Burada da müxtəlif xarakterli toponim, şəxs adı və ümumiyyətlə oxuma xətalarına rast gəlirik.

Bu əsərin Osmanlı ədəbiyyatı tədqiqatçıları və təzkirəşünaslar tərəfindən ciddi müqayisə və təhlil əsasında öyrənilməsi, bu yolla onun elmi dəyərinin ortaya çıxarılması zəruridir.

Tədqiqatçılar "Bəqiyyeyi-təzkireyi-şüəra" daxilində yer almış anonim təzkirənin Sadiqiyə aid olub-olmaması mövzusunun müqayisəli tədqiqata ehtiyacı olduğunu bildirirdilər[219]. Tərəfimizdən aparılan araşdırmalar nəticəsində deyə bilərik ki, Osmanlı şairlərindən bəhs edən bu təzkirə Sadiq bəy Əfşarın qələminin məhsulu deyildir. Biz bu əsəri Osmanlı təzkirələri və Əhdi Bağdadi təzkirəsi ilə də bir-bir müqayisə etdik və onun bu təzkirələrin heç biri ilə tamamilə üst-üstə düşmədiyi məlumumuz oldu. Bundan əlavə, təzkirədə elə şairlərin adlarına rast gəlirik ki, onların vəfat və doğum tarixləri bu əsərin Sadıq bəyə aid edilməsinin mümkünsüz olduğunu isbatlayır.

Sadiq bəy Sadiqi Əfşarın Təbriz əlyazma külliyyatına əlavə olunmuş türk-Osmanlı şairlərin siyahısı tərtib edilərkən ciddi yan-

---

[217] Sadiq bəy Əfşar. Məcməül-xəvas. Bakı: Elm, 2008, s. 9.
[218] Anonim Osmanlı təzkirəsi / Çapa hazırlayan Ə.Bağırov. Bakı: Elm və təhsil, 2012, 100 s.
[219] Sadiq bəy Əfşar. Məcməül-xəvas. Bakı: Elm, 2008, s. 9.

lışlara yol verilmişdir[220]. Bu qüsurları görmək üçün siyahıya nəzər salmamız kifayətdir:

| yanlış | doğru | mənbə |
|---|---|---|
| Ahi Qaraqəryəli, | Qarafəryəli | Səhi, Lətifi |
| Əhli Qəltəli | Qalatalı | Əhdi, Aşiq Çələbi, Qınalızadə, Bəyani |
| Behişti Çurlu | Çorlu | Lətifi, Əhdi, Qınalızadə |
| Bəğayi Əzniki | Bəqai İzniki | Əhdi, Qınalızadə, Rza |
| Bürqi Əndəruni | Bərqi Əndəruni | Qınalızadə |
| Hüsami Tərəli | Tirəli | F.Kılıç[221] |
| Xəlili Amədli | Amidi | Səhi, Lətifi, Aşiq Çələbi, Bəyani |
| Səmai Gəmiçəri | Yeniçəri | Əhdi, Aşiq Çələbi, Riyazi |
| Rumi Bağdadi | Ruhi Bağdadi | Əhdi |
| Şəme Paşa | Şəmsi Paşa | Aşiq Çələbi, Qınalızadə, Bəyani |
| Süni Gülbüvili | Gelibolulu | Səhi, Lətifi, Bəyani, Aşiq Çələbi |
| Səbri Qəltəli | Qalatalı | Qınalızadə |
| Safi Bəzəməli | Berqamalı | Faizi |
| Tüfeyli Amədi | Amidi | Əhdi |
| Əmidi | Ümidi | Faizi |
| Ələvi | Ülvi | Aşiq Çələbi |
| Əzmi Kəduzi | Geduzi | Qınalızadə |
| Əbdi Tərqani | Tokati | F.Kılıç |
| Aşiqi Üskülü | Üsküplü | Faizi |
| Füruği Rəduscikli | Rodoscuklu | Faizi, Riyazi |
| Qələndər Tövqatlı | Tokati | F.Kılıç |
| Vüsuli Busənəli | Bosnəvi | Faizi |
| Haşimi İskəndəri | Üsküdari | Faizi, Riyazi |

Mətnşünaslıq nəzəriyyəsinə nəzər salsaq görərik ki, hər hansı bir ixtisasa dair mənbələrin məhz həmin sahənin mütəxəssisi tərəfindən nəşrə hazırlanması tövsiyə olunur. Bəzən təzkirələrdə katib xətalarına rast gəlinir. Əsəri nəşrə hazırlayan mətnşünas mütləq bunları nəzərə almalı, müqayisəli tədqiqat aparmalı, katib səhvini

---

[220] Sadiq bəy Əfşar. Məcməül-xəvas. Bakı: Elm, 2008, s. 359-360.
[221] Kılıç F. XVII yüzyıl tezkirelerinde şair ve eser üzerine değerlendirmeler. Ankara: Akçağ, 1998.

təshih etməli, əsəri müəllif iradəsinə uyğun, dürüst şəkildə elmi auditoriyaya təqdim etməyi bacarmalıdır. Bu yanlışlıqların bəziləri katib qüsurlarından irəli gəlsə də, bir sıra səhvlər məhz oxunuş xətasından qaynaqlanmışdır. İstanbulun tanınmış məkanlarından olan Qalata bölgəsinin adını Qəltə, Türkiyənin məşhur şəhəri İznikin adını Əznik, Diyarbəkrin tarixi adı olan Amid (Hamid) ifadəsini Aməd, Avropanın tanınmış ölkələrindən olan Bosna (Bosniya) diyarının adını "Busənə" kimi oxumaq, qədim Troya şəhərinin yerləşdiyi və 1915-ci il Çanaqqala zəfərinin yaşandığını bölgə olması səbəbindən bütün dünyada dillər əzbəri olan Gelibolu yarımadasının adını Gülbüvili şəklində təqdim etmək, "Korloğlu" dastanında dönə-dönə xatırlanması üzündən Azərbaycanda yaxşı tanınan Tokat (Toqat) şəhərinin adını Tövqat kimi transfoneliterasiya etmək məhz mətni nəşrə hazırlayan ədəbiyyatşünasın xətalarıdır.

Təzkirə struktur baxımından da müəyyən qədər Osmanlı təzkirələrinə yaxındır. Belə ki, əsərdə şairlər əlifba prinsipi əsasında təqdim olunmuşdur. Amma Azərbaycan təzkirəçilərinin əsərlərinin böyük bir qismi şairlərin çıxdıqları təbəqələrə görə "təbəqə" üsulu ilə və ya coğrafi prinsip əsasında tərtib olunmuşdur[222]. Lakin əsərin dili Osmanlı təzkirələri ilə eyni deyil.

Anonim müəllif tərəfindən qələmə alınmış bu təzkirə antologiya xarakterlidir. Çünki burada şairlər haqqında məlumat çox qısadır. Təzkirəçi şairin təxəllüsünü qeyd edir, adını vermir. Bundan sonra isə hansı şəhərdən olduğu göstərilmiş, sənəti, ixtisası qeyd olunmuşdur. Məsələn, Agahi – Vardardandır, qüzzatdandır; Əhli – qalatalıdır, qazidir; İshaq Əfəndi – üsküplüdür, üləmadandır, Şamda qazı olmuşdur; Cəmali – istanbulludur, nişançı olmuşdur; Hökmi – Rumidür, divan katiblərindəndir və s.

XVII əsr Osmanlı təzkirələri XVI əsrdə bu janrda tərtiblənmiş əsərlərdən müəyyən cəhətlərinə görə fərqlənmişdir. Belə ki, XVI əsr təzkirəçiləri öz dövrlərindən əvvəl yaşayan şairləri əsərlərində xatırlamışdılar. Bu səbəbdən təzkirələrdəki bio-biblioqrafik məlumat da çox geniş olurdu və bu təzkirələrin həcminə də təsir

---

[222] Musalı V. XV-XVII əsrlər türk təzkirəçiliyi. Bakı: 2007, s. 29.

etmişdir. XVII əsr təzkirəçiləri isə daha çox öz dövrlərində yaşayıb-yaradan şairlərdən bəhs edir və bioqrafik informasiyanı çox qısa verirdilər. Əvəzində isə şeirlərdən nümunələr artırılırdı. Beləliklə, qeyd olunan bu dəyişikliklər nəticəsində XVII əsrdən etibarən Osmanlı təzkirəçiliyi tarixində antologiya xarakterli təzkirələr tərtiblənməyə başladı. Faizi təzkirəsi də antologiya xarakterlidir. Bu əsərdə XV əsrin ortalarından yazıldığı 1621-ci ilə qədər yaşamış 14-ü qadın olmaqla 515 nəfər şair əlifba sırası ilə verilmişdir[223]. Şairlərin həyatı haqqında məlumat bir-iki qısa cümlədən ibarətdir. Faizi təzkirəsinə daxil etdiyi şairlərin vəfat tarixini verməyə səy göstərmişdir. Anonim təzkirədə bəhs olunan şairlərdən 112-sinin adına Faizi təzkirəsində də rast gəlirik. Amma şair bioqrafiyaları fərqlidir və şeirlərdən nümunələr isə heç də tam üst-üstə düşməməkdədir.

Bu təzkirədə iki maddeyi-tarix istisna olmaqla şairlərin vəfat tarixlərini, həmçinin şairlərin əsərləri haqqında dəyərləndirmələri də görmürük.

Təzkirədən şairlərin vəzifə, peşə və məslələri haqqında da məlumat alırıq. Onların arasında divan katibi, danişmənd, dəftərdar, yeniçəri, qazısgər, qazi, nədimi-padşah, mülazimi-padşah, mütəvəlli, müdərris, mülazim, nişançı, sipahi və s. rast gəlirik.

Şairlərin əsərlərindən nümunələr isə 2 – 10 beyt arasında dəyişir. Ən çox Baqi və Xəyalinin şeirlərindən nümunələr verilmişdir (10 beyt). Osmanlı təzkirələrində fars dilində şeir nümunələrinə təsadüf etsək də, bu təzkirədə farsça örnəklərlə rastlaşmadıq.

Araşdırdığımız bu əsərə ön söz və xatimə yazılmamışdır. Türk təzkirəçiliyinə nəzər saldıqda məlum olur ki, təzkirəçilər əsərlərinə ön sözlə başlayırlar. Burada təzkirəçi Allaha həmd, peyğəmbərə dua etdikdən sonra, sözün əhəmiyyətinə diqqət yetirir, şairlik haqqındakı fikirlərini, şairliyin uca mərtəbə olduğunu isbat etməyə çalışır. Bəzən təzkirəçilər ön sözdə əsərlərini hansı mənbələrdən istifadə edərək yazdıqlarını və oraya daxil etdikləri şairləri necə seçdiklərini də qeyd edirdilər. Təzkirəçilər onlara qədər yazıl-

[223] Musalı V. XV-XVII əsrlər türk təzkirəçiliyi. Bakı: 2007, s. 130.

mış təzkirələri də ön sözdə xatırlayırlar. Bu anonim mənbədə isə bu məlumatlardan heç birinə rast gəlmirik.

Ön sözdən sonra təzkirənin əsas hissəsi, yəni bio-biblioqrafik məlumatları əhatə edən mətn verilir. Burada şairin adı, ləqəbi, təxəllüsü, doğulduğu, yetişdiyi, vəfat etdiyi yer, təhsili, görünüşü, əsərləri, şairin əsərini kimə ithaf etməsi, həcmi, janrı və başqa məlumatlar verilir.

Təzkirələrin sonunda isə əsərin yekun bölməsi olan “xatimə” verilir. Xatimədə təzkirəçi əsərini yazarkən qarşılaşdığı çətinliklərdən bəhs edir və əsərinin uğur qazanması, bəyənilməsi üçün Allaha yalvarır. Anonim müəllif əsərinə xatimə də yazmamışdır.

Tədqiqat obyektinə çevirdiyimiz bu təzkirə əsasən XVI-XVII əsr şairlərini əhatə etməkdədir. Burada haqqında məlumat verilmiş Fəthi təxəllüslü şairin vəfat tarixi 1107/1695-ci ildir[224]. Digər şairlərin vəfat tarixləri isə daha əvvəllərə təsadüf edir. Bir çox Osmanlı təzkirələrindən fərqli olaraq, burada qadın şairlər xatırlanmamışlar.

Təzkirədə haqlarında məlumat verilən şairlərdən 33 nəfərinin doğulduğu şəhər göstərilməmişdir. Şairlərdən 19-u istanbullu, 14-ü vardarlı, 12-si ədirnəli, 9-u bursalı, 6-sı amidli, 4 sarıxanlı, 3-ü üsküplü, 2-si bağdadlı, 2-si aydınlı, 2-si gedizli, 2-si qaramanlı, 1-i manisalı, 1-i berqamalı, 1-i rodoslu, 1-i trabzonlu, 1-i balıkəsirlidir. Təzkirədə adlarına rast gəldiyimiz şairlərdən 23-ü ***Rumi*** kimi təqdim olunmuşdur. Şairlərin təqdim olunma şəkli də Osmanlı təzkirələrindən fərqlidir. Heç bir Osmanlı təzkirəçisi şairi təqdim edərkən ***“Rumidür”*** ifadəsindən istifadə etməmişdir. Osmanlı təzkirələrində isə bu şairlərin doğum yeri olaraq Rum toponiminə rast gəlmədik. Çünki zatən hamının “Rumi” olduğu Rum torpağında öz əsərini qələmə alan Osmanlı təzkirəçisinin şairləri “Rumi” nisbəsi ilə fərqləndirməsi məqsədəuyğun deyildi. Ona görə də Osmanlı təzkirəçiləri heç bir zaman şairlərin fərqləndirici əlaməti kimi onun Rumi olduğunu vurğulamamış, şairin doğulduğu, yaşadığı konkret

---

[224] İpekten H., İsen M., Toparlı R., Okçu N. Tezkirelere göre divan edebiyatı isimler sözlüğü. - Ankara, 1988, s. 142.

bölgəni ön plana çıxarmışlar. "Sadiqi külliyyatı"ndakı anonim təzkirədə isə bir çox şairlərin Rumi kimi təqdim olunması, həmin təzkirənin Rumdan (Anadoludan) kənarda yazıldığı ehtimalını yaradır. Amma anonim müəllif Osmanlı ədəbiyyatının bilicisi olmuş, digər təzkirələrlə tanış olub onlardan bəhrələnsə də, bir çox hallarda tamamilə orijinal məlumatlar və nümunələr təqdim etmişdir.

Araşdırdığımız bu anonim təzkirədə maraqlı məqamlar vardır ki, elmi auditoriya üçün önəm kəsb edəcəyini nəzərə alaraq onları ilk dəfə müqayisəli şəkildə verməyi məqsədəuyğun hesab edirik.

Osmanlı şairlərini əhatə edən bu təzkirədəki məlumat və nümunələri dörd başlıq altında sistemləşdirmişik:

1. *Digər Osmanlı təzkirələri ilə üst-üstə düşən şair bioqrafiyaları və örnək beytlər;*
2. *Bioqrafiyaların və nümunələrin qismən uyğun olduğu maddələr;*
3. *Digər təzkirələrdən məlum olan, ancaq anonim təzkirədə orijinal beytləri təqdim olunan şairlər;*
4. *Başqa təzkirələrdə xatırlanmayan şairlər*.

Bu şəkildə sistemləşdirdiyimiz məlumatlardan nümunələrə nəzər salaq.

Tədqiqata cəlb etdiyimiz bu əsərdə elə şairlər də vardır ki, onlar haqqındakı məlumat və nümunələr müqayisə etdiyimiz təzkirələrlə üst-üstə düşür. Məsələn, Behiştinin nümunə kimi verilən 4 beytinə Əhdi Bağdadi təzkirəsində[225] də rast gəlirik:

Sarardup şirə döndürdi qəmün mən zərdsimayı,
Rəqibi-gavi göstər gəl bəri seyr et təmaşayı.

Bəzmə gəl bu gecə, ey aləmi-hüsnün mahi,
Yoxsa yerdən gögədək incinürüz vallahi.

[225] Ahdi ve Gülşen-i şuarası (İnceleme-metin) / hazır.: S. Solmaz. Ankara: 2005, s. 226.

Səgi-kuyunladur bənüm cəngüm,
Bilməzəm taşlarun niyə fırlar.

Tənə durna diyü məclisdə sürur itsən sən,
Başlar, ey ruhi-rəvan titrəməgə dir-dir tən.

İkinci və üçüncü beytlər Qınalızadə Həsən Çələbinin təzkirəsində də vardır[226].

Əhməd paşa haqqında məlumat verən naməlum müəllif onun "müsahibi-padşah" olduğunu yazır və üç beytini örnək olaraq verir. Beytlərdən biri Səhi[227], Qınalızadə[228] və Bəyani[229] təzkirələrində verilmişdir:

Çini-zülfün miskə bənzətdim xətasın bilmədim,
Key pərişan söylədim bu yüz qərasın bilmədim.

İkinci beyt isə heç bir Osmanlı təzkirəsində öz əksini tapmamışdır:

Sərvi-qədin dügməsidir şaxi-güli-gülzardə.
Əşkimin pərvərdəsidir lalə gər kühsardə.

Üçüncü beyt Ənvəri təxəllüslü şairin Əhməd paşanın "Kərəm" qəsidəsinə yazdığı təxmisdir. Təzkirəçi bu beyti yanlış olaraq Əhməd paşanın şeiri kimi təqdim etmişdir:

İki dəstim dolu dəstimi sındırma bənim,
Tutalum iki əlüm qanda imiş, qanı kərəm?

---

[226] Kınalızade Hasan Çelebi. Tezkiretü'ş-Şu'arâ / haz.: A.Eyduran. (e-kitap), Ankara: s. 187.
[227] Sehi Bey. Tezkire "Heşt-bihişt" / haz.: M. İsen. İstanbul: 1980, s. 55.
[228] Kınalızade Hasan Çelebi. Tezkiretü'ş-Şu'arâ / haz.: A.Eyduran. (e-kitap), Ankara: s. 113.
[229] Beyani. Tezkiretü'ş-şu'arâ. / haz.: A.Eyduran. (e-kitap), Ankara: 2008, s. 16.

Əhdi Bağdadi "Gülşəni-şüəra"nın Ənvəri maddəsində eyniylə bu təxmisi verir və bununla bağlı əhvalatı nəql edir: "İttifaqən bir gün iki dəsti şərab ilə ol rind xaneyi-xaraba gedərkən subaşıya rast gəlür. Ənvayi-itab u ikaba müstəhaq olduqda həman bədihə bu beyti okıyı virür. Bu əşari-abdarun yüzi suyına xilas bulur. Məzkur beytin bir mısrai Əhməd paşanun "Kərəm" qəsidəsindəndür. Təzmini-xas vaqi olmışdur"[230]. Qınalızadə də təzkirəsində "mərhum Əhməd paşanun bu misrasını xub təzmin etdi"yini bildirir, Lətifi isə Ənvərinin bu təxmisinin birinci misrasını fərqli şəkildə təqdim edir:

İki dəsti mey əlümdə sığma dəstümi urup,
Tutalum iki əlüm qanda imiş, qanı kərəm[231].

Əslində Əhməd Paşaya aid (təxmis olunan) beytə Qınalızadə və Bəyani təzkirəsində rast gəlirik və aşağıdakı kimidir[232]:

Qul günah etsə nola əfvi-şahənşah qanı,
Tutalum iki əlüm qanda imiş, qanı kərəm.

Üsküplü İshaq Çələbi (?-944/1537 və ya 948/1541) haqqındakı məlumat da çox qısadır. Sadəcə Şamda qazı və üləmadan olduğu qeyd edilmişdir. Bu təzkirədə İshaq Əfəndinin Şama qazı olması münasibəti ilə qələmə aldığı tarixi beytə rast gəlirik. Qeyd edək ki, bu beyti Lətifi, Aşiq Çələbi, Qınalızadə[233], Bəyaninin[234] əsərlərində də görürük:

---

[230] Ahdi ve Gülşen-i şuarası (İnceleme-metin) / haz.: S. Solmaz. Ankara: 2005, s. 221.
[231] Latifi. Tezkiretü'ş-Şu'arâ ve Tabsıratü'n-Nuzamâ / haz.: R. Canım. Ankara: 2002, s. 181.
[232] Kınalızade Hasan Çelebi. Tezkiretü'ş-Şu'arâ / haz.: A.Eyduran. (e-kitap), Ankara: s. 112; Beyani - Tezkiretü'ş-şu'arâ. / haz.: A.Eyduran. (e-kitap), Ankara: 2008, s. 16.
[233] Kınalızade Hasan Çelebi. Tezkiretü'ş-Şu'arâ / haz.: A.Eyduran. (e-kitap), Ankara, s. 129.
[234] Beyani - Tezkiretü'ş-şu'arâ. / haz.: A.Eyduran. (e-kitap), Ankara, 2008, s. 18.

Şəhri-zilhiccədə əzmüm səfəri-Şam oldı
Başladum yazmaga tarixini axşam oldı (h.942).

İshaq Çələbinin təzkirədə təqdim olunan ikinci beytini isə digər Osmanlı təzkirələrində tapa bilmədik.

Sirişki-didə demişlər bəzmlə həmdəm ola,
Yetimdir hələ gəlsün öləncə gözləyəlim.

Əmri təxəllüslü XVI əsr şairinin təzkirədə dörd beyti yazılmışdır. Bu beytlərdən biri Əhdi təzkirəsində vardır[235].

Gördüm ey dil minnət istər verməyə dünya murad,
Ana minnət etmədən qurtuldum, oldum namurad.

Digər üç beytə isə Osmanlı təzkirələrində rast gəlmədik.

Xallı Həsən kimi tanınan Ahi məxləsli şairi anonim müəllif Qarafəryəli kimi təqdim edir. Qarafəryə Aliakmon çayının şimal sahilinə yaxın, Selanikin cənub-qərbində yerləşir və Osmanlı dönəmində Selanik sancağının bir qəzası olmuşdur[236]. Digər təzkirəçilər isə Ahinin Niğboluda anadan olduğunu, Qarafəryədə müdərrislik etdiyini yazırlar. Bu şairin təzkirədəki şeirlərini Osmanlı təzkirəçilərinin əsərlərində görmədik.

Dillərin kəssin bənim dərdi-dilimdən xamələr,
Bən qara yazıya hərf etməsinlər namələr.
Dərdilə yaxsın bəni bu qanlı-qanlı dağlər,
Qarşumə qucsun səni altun niklü camələr.

[235] Ahdi ve Gülşen-i şuarası (İnceleme-metin) / hazır.: S. Solmaz. Ankara: 2005, s. 195.
[236] Kılıç F. XVII yüzyıl tezkirelerinde şair ve eser üzerine değerlendirmeler. Ankara: Akçağ, 1998, s. 65.

Darül-hədis mədrəsəsində mütəvəlli olan Bali təxəllüslü şairdən bəhs edən anonim müəllif, yanlış olaraq Rumelində Gevgeli Kösteriye şəhərindən olan digər bir Bali təxəllüslü şairin şeirlərini nümunə vermişdir[237]. Bunu təzkirələr üzərində apardığımız müqayisəli tədqiqatlar üzə çıxardı.

Bağın güli və sünbüli, sərv ü bənövşəsi,
Yari gəlür, diyü kodılar gözci nərgisi.

Aldı xəbər səbadan və döndi, göz eylədi,
Yəni gəlir o gözləri ahu kəsün səsi.

Müştaq imiş bənövşə ki, payinə yüz sürə,
Miskinün uymuş çəmən içində bikəsi.

Bu təzkirədəki şairlər Qafzadə Faizinin "Zübdətül-əşar"ı ilə müəyyən qədər üst-üstə düşür. Anacaq şairlərin həyatı, yaradıcılığı və təqdim olunan nümunələrdə fərqliliklər var.

Məsələn, Safi təxəllüslü XVII əsr şairi haqqında məlumatı yalnız Faizi təzkirəsindən alırıq. Faizi yazır: "Qaraca Əhmədzadə qazı Əhməd Safi Bergamavi"[238]. Burada şairin bir beyti örnək olaraq verilmişdir:

Didim əglənməzmi heç yolunda canlar verdigüm,
Naz ilə güldü, dedi varın verən yad olmasun.

Anonim təzkirədə də çox qısa bilgi verilmişdir: "Safi – qazıdır". Təzkirədə yer alan beyt isə yuxarıdakı beytlə eyni deyil.

---

[237] Kınalızade Hasan Çelebi. Tezkiretü'ş-Şu'arâ / haz.: A.Eyduran. (e-kitap), Ankara, s. 172.

[238] İpekten H., İsen M., Toparlı R., Okçu N. Tezkirelere göre divan edebiyatı isimler sözlüğü. - Ankara: 1988, s. 410.

İstəməm zərrəcə damanına toz qonduğunu,
Paklikə səni sevərsəm əfəndiligə bən.

Tədqiq etdiyimiz bu təzkirədə Bərqi adlı istanbullu şairin əndərundan və sipahi şairlərdən olduğu qeyd olunmuşdur. Şairin üç beyti nümunə olaraq verilir:

Padşahım, bənim əqranım olan bəndələrin,
Kimi bəglərbəgi oldu, kimi əlan bəgdir.

Qəleyi-təndə çalır noubətini nalələrim,
Çağırır bürci-bədəndən könül Allah yekdir.

Gözüm yaşı gibi onlar çəməndə cüstücu eylər,
Kənar etmək dilər var isə ol sərvi-xuramanı.

Maraqlıdır ki, Bərqi barədə Osmanlı təzkirəçilərindən yalnız Qınalızadə Həsən Çələbi məlumat verir: “Vücudi-pür-ləmü-bərqi şəhri-İstanbuldan lame ü bariq olduqdan sonra zümreyi-sipahi-zəfər-pənahına layiq olmışdur”[239]. Bərqinin şeirlərindən örnəklər isə yuxarıdakı beytlərdən fərqlidir:

Saqi bahar əyyamıdur gülzara əzm et sübhdəm,
Zövq ü səfa həngamıdur eyşi-müdam et dəm-bə-dəm.

Eylər səfada dəm-bə-dəm qismət bana dərdü ələm,
Əl-hükmülillah, ey sənəm, çün böylədür cəffül-qələm.

Zülfün bana sünbül yetər, rəngin yanağun gül yetər,
Naləm sana bülbül yetər, ey sərv-qamət gönçə-fəm.

---

[239] Kınalızade Hasan Çelebi. Tezkiretü’ş-Şu’arâ / haz.: A.Eyduran. (e-kitap), Ankara: s. 173.

Bir dəm içində qərbivü şərqi,
Seyr edər yıldırım gibi Bərqi .

XVI əsrdə yaşayıb-yaratmış Azərbaycan şairi Bəsiri gəncliyində Ağqoyunlu Uğurlu Məhəmməd və Sultan Yaqubun yanında olmuş, onlara qəsidələr təqdim etmişdir. H.892/1487-ci ildə Heratda Əlişir Nəvai, Cami, Mirzə Hüseyn Bayqara ilə görüşmüşdür. Nəvai, Bəsirinin adına müəmma yazaraq, onu yeni mühitdə tanıtmışdır[240]. Bəsiri Azərbaycan şairi olduğu halda, bu təzkirədə Rumi kimi təqdim olunmuşdur. Belə ki, bütün Osmanlı təzkirəçiləri Bəsirinin əcəmli olduğunu qeyd edirlər. Bəsirinin nümunə verilmiş bu beyti Səhi[241] və Aşiq Çələbi[242] təzkirələrində təqdim olunmuş beytlə eynidir:

Kiprigin sehr oxları, əbrulərindir yay ona,
Bir bənim kibi bəlakeş uğrar isə, vay ona.

Katib Mehmed (?-1008/1599) kimi tanınan Təliqizadə məşhur Molla Fənarinin ailəsindəndir. Şahnaməçi olmuşdur. "Rəvaniyyə", "Təbriziyyə" və "Şahnameyi-Humayun" adlı əsərlər qələmə almışdır. Anonim müəllif şairi Təliqi təxəllüsü ilə təqdim edir, Tirəli olduğunu qeyd edir. Ancaq Təliqizadə haqqında məlumat verən Osmanlı təzkirəçilərindən Riyazi, Qafzadə Faizi və Rza Zəhrimarzadə şairin Lazkiyədən olduğunu yazırlar[243]. Təzkirədəki örnək beyt də sözügedən əsərlərdə yoxdur.

Dilbərani-cəhani-siməndam,

---

240 Musalı V. Osmanlı təzkirələrində Azərbaycan şairləri. Bakı: 2009, s. 120.
241 Səhi Bəy. Həşt Behişt. İstanbul, 1980, s. 201.
242 Kılıç F. Meşairüş-şuara. İnceleme-tenkitli metin. Basılmamış Doktora Tezi. Gazi Üniversitesi, SBE. Ankara, 1994, s. 194.
243 İpekten H., İsen M., Toparlı R., Okçu N. Tezkirelere göre divan edebiyatı isimler sözlüğü. - Ankara, 1988, s. 280.

Bibəqadır, nitəkim mali-həram.

Anonim təzkirədə Cəzmi təxəllüslü dərviş şairin bir beyti verilmişdir.

Mey üçün rəhnə qomağ canıma minnətdir, ey sufi,
Gerü alsa əgər piri-muğan təsbihü səccadə.

Divan ədəbiyyatına nəzər salsaq görərik ki, Cəzmi təxəllüsü (?-1103/1694) ilə şeir deyən sadəcə bir şair var[244]. Müdərris və qazı olmuşdur. Haqqında məlumatı XVIII əsr təzkirəçilərindən – Salim, Səfayi təzkirələrindən almaq mümkündür[245]. Amma təqdim olunan beytə təzkirələrdə rast gəlmədik.

Təzkirədə Xəyali Vardarinin (?-964/1557) 10 beyti və vəfatına Ərşi tərəfindən söylənmiş tarixi misrası verilmişdir.

Sözü  dildə, Xəyali gözdə qaldı (h. 964).

Bu tarixi misra Qınalızadə Həsən Çələbi, Aşiq Çələbi, Bəyani təzkirəsində də vardır. Qınalızadə bu mövzuda yazır: "Vəfatına şüəra çok tarix dimişdür. Cümlədən Ərşi nam şairü müvərrix dimişdür"[246].

Osmanlı təzkirəçiləri bu misradan əlavə, şairin vəfatına yazılmış başqa beytləri də vermişlər. Məsələn, Günahi onun vəfatına

Aləmi-həsəddən Xəyali gitdi ah.

misrasını söyləmişdir.

---

[244] Yenə orada, s. 92.
[245] Mustafa Safayi Efendi. Tezkire-i Safayi / haz.: P. Çapan. Ankara, 2005, s. 148; Salim Efendi. Tezkiretüş-şüara. İnceleme-metin / haz.: A.İnce. Ankara, 2005, s. 270-271.
[246] Kınalızade Hasan Çelebi. Tezkiretü'ş-Şu'arâ / haz.: A.Eyduran. (e-kitap), Ankara: s. 295.

Şiri Əli Çələbinin söylədiyi maddeyi-tarix aşağıdakı şəkildədir:

Xəyali oldı hayfü'l-hükmü'lillah.

Osmanlı təzkirələrdə Xülusi təxəllüsü ilə yazan iki şairin adı çəkilir[247]. Bunlardan biri XVI əsr, digəri isə XVIII əsrdə yaşayıb-yaratmışdır. Anonim müəllif Xülusinin dərviş və namurad olduğunu qeyd edir. Nümunə olaraq 3 beytini verir:

Pak edə aləmi ta zülmət səbəbidən xavər,
Aldı carub şüaın əlinə vəqti-səhər.

Bamdan vəqti-səhər uçdi əsafiri-nücum,
Çıxdı şahini-üfüq çü nuk açıb zərrin pər.

Var isə könlünü almaq dilədi bir mahin,
Kim səhər vəqti üfüq göstərər ağzından zər[248].

İkinci beyt Əhdi Bağdadi təzkirəsindəki beytlə eynidir[249]. Deməli, bu XVI əsrdə yaşamış Xülusidir. Amma dərviş olması haqqında Əhdi heç bir bilgi vermir. Maraqlıdır, Xülusinin dərviş olmasını anonim müəllif hansı mənbəyə əsasən yazmışdır?

Manastırlı Səbayi haqqında yeganə məlumatı Əhdi verir. Amma Əhdinin verdiyi bilgi və beytlərlə bu təzkirədəkilər eyni deyil. Manastırlı Səbayinin dəftərdar olduğunu qeyd edən anonim müəllif, nümunə olaraq şeirlərindən bir beyti yazmışdır.

---

[247] İpekten H., İsen M., Toparlı R., Okçu N. Tezkirelere göre divan edebiyatı isimler sözlüğü. Ankara, 1988, s. 215.

[248] Sadiq bəy Sadiqi. Külliyyat. Təbriz nüsxəsinin fotosurəti. AMEA Əlyazmalar İnstitutu, FS– 412.
Külliyyatın AMEA Əlyazmalar İnstitutunda saxlanılan sürəti nömrələnməmişdir.

[249] Ahdi ve Gülşen-i şuarası (İnceleme-metin) / haz.: S. Solmaz. Ankara: 2005, s. 293.

Şəbi-möhnətdə olan macərayi-çeşmi-giryanı,
Sənə iki gözüm düşməzdimi kim, ağlayım bir gün.

XVI əsr şairlərindən olan Tüfeyli Diyarbəkirdə anadan olmuşdur. H.1000/1592-ci ildə Bağdad bəylərbəyisi Xızır paşa ilə Bağdada getmiş və orada şairlərlə münasibət yaratmışdır. Tüfeylidən sadəcə Əhdi bəhs etmiş və bir qəzəl, bir beytini örnək olaraq vermişdir[250]. Araşdırdığımız təzkirədə isə Tüfeylinin Amiddən olduğu yazılmış və bir beyti yer almışdır ki, bu beyt Əhdidə yoxdur.

Qəbqəbin çahi, əsirinə gəhi ərz et rüxin,
Xeyirdir, şahim, dirləmək sakini-rindanə şəm[251].

Əsl adı Əbdülkərim olub, Bülbülçüzadə kimi tanınan və şeirlərini Fəthi təxəllüsü ilə yazan XVII əsr şairi haqqında məlumatın yer aldığı bu təzkirədə onun istanbullu olduğu və müdərrislik etdiyi göstərilmişdir.

Fəramuş etməsin deyüb vəfavü əhdü peymanı,
Sərəngüşttə sordum o mahin rişteyi-canı.

Səfayi şairin h.1107/1695-ci ildə, Salim isə h. 1107/1695-ci ildə vəfat etdiyini yazırlar[252]. Lakin onlar şairin başqa şeirlərinə yer vermişlər.

Təzkirədə Qınalızadə təxəllüslü şairdən bəhs olunarkən onun istanbullu olduğu (əslində Qınalızadə istanbullu deyil) və qazılıq etdiyi qeyd olunmuş və iki beyti nümunə verilmişdir:

---

[250] Yenə orada, s. 402.
[251] Sadiq bəy Sadiqi. Külliyyat. Təbriz nüsxəsinin fotosurəti. AMEA Əlyazmalar İnstitutu, FS– 412.
[252] Mustafa Safai Efendi. Tezkire-i Safayi / hazır.: P. Çapan. Ankara: 2005, s. 461; Salim Efendi. Tezkiretüş-şüara. İnceleme-metin / hazır.: A.İnce. Ankara, 2005, s. 541.

Hər dilbər üçün sinədə bir yarəmi olsun?
Nitsün dili-sevdazədə, bin parəmi olsun?

Tişrə  çıxsın, mədəd, ol yarilə vardır sözümüz,
Halımıza ağlaşalım, çıxsın ol iki gözümüz.

Ancaq Bəyani təzkirəsində yuxarıda qeyd etdiyimiz ilk beytlər Hüdayi Oxçuzadəyə aid edilir[253]. Digər təzkirlərdə isə bu beytlərə rast gəlmədik.

Adına Səhi bəyin "Həşt-behişt"ində rast gəldiyimiz Sevdayi təxəllüslü şairin müdərris olduğu və Kırıkkilsə qazısı olarkən vəfat etdiyi qeyd olunmuşdur[254]. Tədqiq etdiyimiz bu təzkirədə isə Sevdayinin sadəcə Rumi olduğu yazılmışdır və örnək şeirlər Səhi təzkirəsindəki nümunələr deyil.

Osmanlı təzkirəçilərinin əsərlərində xatırlamadıqları bəzi şairləri bu əsərdə görürük. Bunlardan biri Hələbli Əhməd paşadır[255]. Anonim müəllif onun Hələb paşası olduğunu qeyd edir və bir beytini nümunə verir:

Uğramaz dairəmə, dəvətim əsla tutmaz,
Bənzər, ey dil, o pəri-peykəri əsma tutmaz.

Ayaz paşanın oğlu Fərhad bəy haqqında da verilən məlumatı başqa təzkirələrdə görmədik. Burada qısaca olaraq onun üməradan olduğu yazılmış və bir beyti verilmişdir[256]:

Asitanın məskən etməzsə, nigara, gül kibi,
Bağü-rağə meyl edərsə, bülbüli-şeyda quş əst.

---

[253] Beyani - Tezkiretü'ş-şu'arâ. / haz.: A.Eyduran. (e-kitap). Ankara, 2008, s. 56.
[254] Sehi Bey. Tezkire «Heşt-bihişt» / hazır.: M. İsen. İstanbul: 1980, s. 161.
[255] Sadiq bəy Sadiqi. Külliyyat. Təbriz nüsxəsinin fotosurəti. AMEA Əlyazmalar İnstitutu, FS– 412.
[256] Yenə orada.

Süleyman bəy Vardari, Sirəti kimi şairlər haqqında da ilk məlumat məhz bu təzkirədədir. Təzkirədə bəhs olunan XVI əsr şairi Həlimi, Hüsami və Hilminin də şeirlərinə digər təzkirələrdə rast gəlmədik.

Araşdırdığımız bu təzkirədə şairlərin şeirlərindən 288 beyt və iki maddeyi-tarix nümunə verimişdir. Bu beytlərdən 69-u müqayisə apardığımız təzkirələrdəki beytlərlə üst-üstə düşür.

Belə ki, bu əsərdə bəhs olunan şairlərdən 17-si Səhi, 34-ü Lətifi, 69-u Aşiq Çələbi, 55-i Əhdi Bağdadi, 77-si Qınalızadə Həsən Çələbi, 56-sı Bəyani, 87-si Riyazi, 112-si Faizi təzkirəsində yer almışdır. Anonim müəllifin tərtib etdiyi bu əsər natamam olsa da, orijinaldır və Osmanlı ədəbiyyatı tarixinin mənbələrindəndir.

***“Məcməül-xəvas”ın əlyazmaları***

*Avstriya K/X. 626=pt. 270.*

*Yapı Kredi Sermet Çifter Araştırma K/X. 81*.

*Rusiya Federasiyası EA, Şərq Əlyazmaları İnstitutu (Sankt-Peterburq) B 1187.*

*İstanbul Universitet K/X. T 4085.*

*İstanbul Universitet K/X. T 4097/42.*

*Nurosmaniyə K/X. 3201.*

*Nurosmaniyə K/X. 3202/1.*

*Nurosmaniyə K/X. 34 Nk 3721/1.*

*Nurosmaniyə K/X. 34 Nk 3720.*

*Paris Milli K/X. Supp. Turc 1002.*

*Təbriz K/X. 197/1.*

*Tehran Universiteti K/X. 465/2.*

*Sipərsalar K/X. 513/5.*

*Astani-Qüdsi-Rizəvi K/X. 4077.*

*Məlik Milli K/X. 4077.*

*Təbriz Dövlət K/X. 3616*

*Şəhid Mütəhhəri Ali Mədrəsəsi K/X. 2729.*

*Şeyxülislam Arif Hikmət məktəbi, Mədinə 334.*

# NAZİM TƏBRİZİ

Azərbaycan təzkirəçiliyinin XVII əsr mərhələsində indiyə kimi yalnız Sadiq bəy Əfşarın "Məcməül-xəvas" adlı təzkirəsinin qələmə alındığı qeyd edilirdi [257]. Halbuki Nazim Təbrizinin "Nəzmi-güzidə" adlı əsərinin də h.1036/1626-cı ildə tamamlandığı məlumdur. Beləliklə, XVII əsrdə azərbaycanlı müəlliflər Sadiq bəy Əfşar və Nazim Təbrizi tərəfindən iki təzkirə tərtiblənmişdir.

Nazim Təbrizi haqqında Nəsrabadi və Məhəmmədəli Tərbiyət təzkirəsində məlumat verilmişdir. M.Tərbiyət "Danişməndani-Azərbaycan" təzkirəsində yazır: "Nazim Xacə Məhəmməd Sadıq – Təbrizin söz ustalarındandır. O, mirvari satan Məhəmməd Rza bəyin qardaşı, İsfahanın Abbasabad məhəlləsində yaşayan və orada oxuyub boya-başa çatan təbrizlilərdən idi. Xacə Məhəmməd Sadıq Məkkə ziyarətinə gedib, orada guşənişin olmuşdur. O, Məkkədə ibadət etməklə və ariflərlə həmsöhbət olmaqla ömrünü keçirmişdir. Xacə Məhəmməd h. q. 1036 (1626)-cı ildə şairlərin tərcümeyi-halı haqqında "Nəzmi-güzidə" adlı qısa bir təzkirə yazmışdır. O, bu təzkirədə şeir növlərindən ancaq qəzəlləri və rübailəri vermişdir. Nəsrabadinin qeyd etdiyinə görə, onun təzkirəsindən (h. q. 1081/1670) bir neçə il əvvəl vəfat etmişdir. Onun "Firuz və Şahbaz" məsnəvisi məşhurdur. Mən (M.Tərbiyət – V.M.) onun altı min beytdən ibarət divanını görmüşəm. Aşağıdakı rübai ondandır:

Məstlik həmişə olmasa, xumarlıq yaxşıdır,
Sağlamlığın tam olmasa, bimarlıq yaxşıdır.

Nə vaxtadək başqasına bağlanmış olursan,
Vüsal əgər belədirsə, ayrılıq yaxşıdır"[258].

---

[257] Muradova M. Sadiq bəy Sadiqinin həyat və yaradıcılığı. -Bakı: Elm, 1999, 139 s; Sadiq bəy Əfşar. Məcməül-xəvas. Bakı: Elm, 2008, 412 s.

[258] Tərbiyət Məhəmmədəli. Danişməndani–Azərbaycan: Azərbaycanın görkəmli elm, sənət adamları. Bakı: Azərnəşr, 1987, s. 241-242.

XVII əsr müəllifi Arif təxəllüslü Məhəmməd Şirazinin "Lətaifül-xəyal" təzkirəsinə görə, Nazim Təbrizi Şah Abbas zamanında yaşamış, Hindistan səfərindən qayıdarkən dənizdə qərq olmuşdur.

Ə.G.Məani də Nazim Təbrizi haqqında məlumat verərkən M.Tərbiyətə istinad etmişdir. Bundan əlavə, o, təzkirənin strukturu və əsərin əlyazma nüsxələri haqqında qısa məlumat vermişdir[259].

"Nəzmi-güzidə" adlı təzkirənin iki naqis əlyazma nüsxəsi zamanımıza çatmışdır. Əsərin birinci nüsxəsi İran Məlik Milli Kitabxanasında saxlanılır. Bu nüsxə məcmuəyə daxildir. Ölçüsü 14x24,8 sm-dir. Səmərqənd kağızına nəstəliq xətti ilə köçürülmüşdür və inabi rəngli dəri cildə tutulmuşdur. Ə.G.Məani bir neçə şair istisna olmaqla, bu nüsxədə təzkirəçinin müasiri olmuş şairlərə dair parçaların mövcud olmadığını yazır[260].

Nüsxələrdən ikincisi İran İslami Şura Məclisi Kitabxanasında 480 şifrəsi altında mühafizə olunur. Əlyazmada təzkirəçinin müasirləri olan şairləri əhatə edən hissə yoxdur[261]. Təzkirənin İran İslami Şura Məclisi kitabxanasında saxlanan nüsxəsi tərəfimizdən əldə edilmişdir. Təzkirə daxil olduğu əlyazma məcmuəsinin 2-104-cü səhifələrində yer alır. Məcmuənin ümumi həcmi isə 219 səhifədir. Beləliklə, sözügedən təzkirə istifadə etdiyimiz nüsxənin 52 vərəqini əhatə edir. Nəstəliq xətti ilə yazılmışdır. İnabi rəngli dəri cildə tutulmuşdur. Ölçüsü haşiyə ilə birlikdə 29,2x18,5 sm, haşiyəsiz isə 22,2x10 sm-dir.

Təzkirə xronoloji prinsip əsasında hazırlanmışdır. Belə ki, əsər iki babdan ibarətdir və hər bab iki fəslə ayrılmışdır.

İlk babın ilk fəsli ***"Qədim və orta dövr fəsahətlilərinin qəzəllərinin müntəxəbatı və onların gözəl mahiyyətə malik əhvalının bir qismi"*** haqqındadır. Həmin babın ikinci fəsli ***"Son dövr bəla-***

---

[259] Məani Ə.G. Tarixi-təzkirəhayi-farsi. I c. s. 381-388.
[260] Yenə orada, s. 386.
[261] Nazim Təbrizi. Nəzmi-güzidə. İran İslami Şura Məclisi kitabxanası 480.

***ğətlilərinin qəzəllərinin müntəxəbatı və onların gözəl mahiyyətə malik əhvalının bir qismi”*** adlanır.

İkinci babın birinci fəsli ***“Qədim və orta dövr fəsahətlilərinin rübailərinin müntəxəbatı və onların gözəl mahiyyətə malik əhvalının bir qismi”*** məsələsinə həsr edilmişdir. İkinci babın ikinci fəsli isə ***“Son dövr bəlağətlilərinin rübailərinin müntəxəbatı və onların gözəl mahiyyətə malik əhvalının bir qismi”*** sərlövhəsi altında təqdim olunmuşdur.

Əsərdə həm şairlər haqqındakı bio-biblioqrafik məlumat, həm də şeir nümunələri farsca təqdim olunmuşdur.

Nazim Təbrizi öz təzkirəsini “Fatehlərin başçısı Şah Abbas” adlandırdığı Səfəvi hökmdarı I Şah Abbasın göstərişi ilə yazdığını bildirir. Təzkirənin əvvəlində onun təlif səbəbi haqqında oxuyuruq: “Nadir fikirlər mədəni və cavahir şeirlər xəzinəsi olan bu məcmuə çox şərəfli, müqəddəs və mübarək şahənşah cənablarının qəzavü-qədər kimi cərəyan edən fərmanına əsasən yazılmış və sahmana salınmışdır”[262]. Müəllifin yazdığına görə, h.1027/1617-ci ildə İsfahan şəhərində Şah Abbas sarayda hazır olan fitrət sahiblərinə əmr edir ki, yüksək səviyyəli şeir ustadlarının qiymətli şeirlərindən ibarət məcmuə tərtib etsinlər. Şahın rəğbətini qazanmağı ümid edən Nazim Təbrizi bu həvəslə keçmiş və yeni şairlərin şeirlərini vərəq-vərəq, beyt-beyt nəzərdən keçirərək, bu təzkirəni yazmağa başlayır.

Nəhayət, h. 1036/1626-cı ildə o, Məkkə şəhərində olarkən öz təzkirəsini tamamlamağa nail olur və ona “Nəzmi-güzidə” adını qoyur. Bu ifadə həm də təzkirənin bitdiyi 1036-cı ilin əbcəd hesabı ilə tarixini bildirir. Sadiq bəy Əfşarın “Məcməül-xəvas”ı “Nəzmi-güzidə”dən öncə yazılsa da, Nazim Təbrizi əsərinin ön sözündə bu əsər haqqında heç bir məlumat verməmişdir.

Nazim öz təzkirəsində məhz qəzəllərə və rübailərə yer verməsinin səbəbini belə açıqlayır: “Allahın kölgəsi olan əlahəzrət hökmdarın (Şah Abbasın) könlü aşiqanə şeirlərə daha çox meyil etdiyi üçün qəzəl və rübaidən başqa digər bir şeir bu məcmuədə

[262] Nazim Təbrizi. Nəzmi-güzidə. İran İslami Şura Məclisi kitabxanası 480, s. 7.

qeyd edilməmişdir”[263]. Amma Ə.G.Məani təzkirədə bəzi hallarda qəsidələrin qəzəl kimi təqdim edildiyini yazır[264].

Azərbaycanlı şairlərdən Əsir Umani Həmədani, Seyid Zülfüqar Şirvani, Fələki Şirvani, Əvhədi Marağayi, Eynülqüzzat Həmədani, Müciəddin Beyləqani və başqaları bu təzkirədə yad edilmişlər.

Nazim Təbrizi, Fələki Şirvaninin yaradıcılığını yüksək qiymətləndirmişdir: “Fələki Şirvani kamil bir ustad və fazil bir söz sərrafı idi. Xaqani və Zəhirin müasirlərindəndir. Həmdulla Mustovfi onu Xaqaninin ustadı hesab edir. Amma əksər müəlliflər həmrəydirlər ki, onların hər ikisi Əbülüla Gəncəvinin şagirdləridirlər. Məşhurdur ki, cavanlıq əyyamında bir münəccim oğlanla dostlaşmış və o elm sahəsində çalışmışdır. Belə ki, o, həmin elmə (nücum elminə - V.M.) dair dürüst əsərlər qələmə almışdır. Elə bu səbəbdən özünə Fələki təxəllüsünü götürmüşdür. Onun əsli Şamaxıdandır və bu müxlis (Nazim Təbrizi – V.M.) onun iki min beytdən artıq divanını görmüşdür. Lakin deyirlər ki, onun tamam divanı yeddi min beytdir. O, 577-ci (1181) ildə Şamaxıda vəfat etmişdir”. Təzkirəçi Fələkinin 16 beytini nümunə kimi təqdim etmişdir[265].

Zülfüqar Şirvanidən bəhs edən təzkirəçi yazır: “Kamal sahibi olan bir seyid idi. Xaqaninin, Zəhirin və Mücirin müasirlərindəndir. Onun halının tərəqqisi Sultan Təkiş Xarəzmşah zamanında olmuşdur. Məsnui qəsidə yazmaq onun ixtiralarındandır. Salman Savəci və digərləri ondan öyrənmişlər. Qəzəlləri azdır. Ondan qəzəl tərzində bu iki beyti görmüşəm”[266].

Təzkirənin sözügedən nüsxəsində Əvhədi Marağayinin həyatı haqqında heç bir məlumat verilməsə də, “Əvhədi Marağinin seçmə rübailəri” başlığı altında onun 6 rübaisi təqdim edilmişdir[267].

---

[263] Nazim Təbrizi. Nəzmi-güzidə. İran İslami Şura Məclisi kitabxanası 480, s. 4.
[264] Məani Ə.G. Tarixi-təzkirəhayi-farsi. I c. s. 385.
[265] Nazim Təbrizi. Nəzmi-güzidə. İran İslami Şura Məclisi kitabxanası 480, s. 14.
[266] Yenə orada, s. 24.
[267] Yenə orada, s. 39.

Eynülqüzzatın həyatı haqqında əlyazmada məlumatla qarşılaşmasaq da, onun rübailərindən örnəklərin verildiyini görürük[268].

Əsir Umani haqqında təzkirədə bu məlumatı oxuyuruq: "Xoş təbli və fazil bir kişi idi. Onun divanı məşhurdur. Elmdə Xoca Nəsir Tusinin (Allah ona rəhmət eləsin) şagirdi olmuşdur. Əsli Həmədandandır. Ərəbcə çoxlu şeirləri vardır. Farsca şeirlərində müdriklik var. Qəzəlləri azdır. Bu nümunələr onun qəzəlləri cümləsindəndir". Bu sözlərdən sonra Nazim onun 24 beytini təqdim etmişdir[269]. Növbəti səhifələrdən birində isə təzkirəçi Əsir Umaninin 12 rübaisinə yer vermişdir[270].

Müciréddin Beyləqaninin də həyatı və fəaliyyəti haqqında nüsxədə heç bir məlumatla rastlaşmadıq. Lakin onun da rübailərindən 6-sı təzkirəyə daxil edilmişdir[271].

Əlyazma nüsxəsində Kəmaləddin İsmayıl, Şeyx Əttar Nişapuri, İsmət Buxari, "söz ustadlığı mülkünün xosrovu" ("xosrovi-mülki-süxənvəri") Əmir Xosrov Dehləvi, Kamal Xocəndi, Dai Şirazi, Məsud Səəd Salman, İmad Fəqih Kirmani, Əzrəqi Səmərqəndi, Şeyx Azəri, Əşrəf Səmərqəndi, Cəlal Əzüd, Suzəni Səmərqəndi, Salman Savəci, İmadi Şəhriyari, Əraqi Həmədani, Ənvəri, Əbu-Əli ibn Sina, Əsir Əxsikəti, Siracəddin Qumri Qəzvini, Rəziəddin Nişapuri, Ruzbehan Şirazi, Əvhədəddin Kirmani, Katibi Nişapuri, Əbülfərəc Runi və b. kimi Şərq ədəbiyyatının nümayəndələrinin, Azərbaycan, Mərkəzi Asiya, İran və Hindistan şairlərinin həyat və yaradıcılıqlarından bəhs edilmişdir.

Sadiqi təzkirəsindən fərqli olaraq, "Nəzmi-güzidə" fars dilində qələmə alınmışdır. Nazim təzkirəsinin "Məcməül-xəvas"dan digər bir fərqli cəhəti strukturundadır. Sadiq bəy Əfşar əsərini Əlişir Nəvai, Dövlətşah Səmərqəndi və Sam mirzənin təzkirəsinin davamı olaraq qələmə aldığını qeyd edir. Yəni Sadiqi özündən öncəki təzkirələrə ***zeyl*** olaraq öz əsərini qələmə almışdır. Nazim Təbrizi

[268] Yenə orada, s. 50.
[269] Yenə orada, s. 61.
[270] Yenə orada, s. 63.
[271] Yenə orada, s. 81.

isə "qədim dövr" şairlərindən başlayaraq öz müasirləri haqqında məlumatı və əsərlərindən nümunələri əhatə edən əsər ortaya qoymuşdur. Qeyd olunan bu təzkirələrin oxşar cəhəti I Şah Abbasa ithafən yazılmasıdır.

Apardığımız araşdırmalar nəticəsində deyə bilərik ki, Nazim Təbrizi 1626-cı ildə bitirdiyi təzkirəsi ilə XVII əsr Azərbaycan təzkirəçiliyini zənginləşdirmiş, Sadiq bəy Əfşardan sonra dəyərli bir əsər ortaya qoymuşdur. Təzkirə tərtib prinsipi, strukturu və təqdim olunan nümunələrin yalnız qəzəl və rübailəri əhatə etməsi baxımından orijinaldır. Əsər Herat və Osmanlı təzkirələri kontekstində dəyərləndirilən zaman qeyd olunan sahələrin təzkirələrindən yuxarıda göstərdiyimiz (tərtib prinsipi, struktur və s.) cəhətlərinə görə fərqləndiyi məlum olur.

***Əlyazmaları***

*İran Məlik Milli Kitabxanası.*
*İran İslami Şura Məclisi Kitabxanası 480.*



بسم الله الرحمن الرحیم

**Nazim Təbrizi. "Təzkireyi-Nazim"**
**İran İslami Şura Məclisi kitabxanası 480**

# XVIII ƏSR TƏZKİRƏÇİLİYİ

- Əliqulu xan Valeh
- Lütfəli bəy Azər
- İshaq bəy Üzri
- Sultan Məhəmməd mirzə Bahadır xan Səfəvi
- Əbu Talib xan Təbrizi

# ƏLİQULU XAN VALEH

XVIII əsrin ilk Azərbaycan təzkirəçisi Əliqulu xan Valehdir (h.1124/1712-h.1170/1756). Səfəvilər dövründə onun ulu babaları Dağıstanda müxtəlif dövlət vəzifələrində işləmiş və nüfuz sahibi olmuşlar. Valeh 1124/1712-ci ildə İsfahanda anadan olmuşdur. Atası Məhəmməd Əli xan İrəvanın bəylərbəyisi təyin olunmuş və onlar ailəlikcə Qafqaza köçmüşlər. Ancaq atası h.1127/1716-cı ildə vəfat etdiyindən Valeh qohumları ilə birlikdə İsfahana qayıtmış, orada təhsil almışdır. H. 1135/ 1722-ci ildə əfqanların İrana hücumundan və İsfahanın işğalından sonra Valehin yaxınları dövlət vəzifələrindən kənarlaşdırılmışlar. Nadir şahın hakimiyyəti zamanı (1736-1747) onun ailə vəziyyəti daha da pisləşmişdir. Bu səbəblərdən də o, Hindistana getməli olmuşdur. Hindistanda görkəmli ədib və alimlərlə görüşən Valeh böyük hörmət qazanmışdır. Böyük Moğol dövlətinin rəhbəri olan Məhəmməd şah Valehə müxtəlif dövlət vəzifələri və titullar vermişdir. Valeh h. 1170/1756-ci ildə vəfat etmişdir.

Gənc yaşlarından elmə və ədəbiyyata maraq göstərən Valeh "Divan" qələmə almış, türk və fars dillərində rübailər yazmışdır. Onun "Divan"ı h.1157/1744-cü ildə köçürülmüşdür.

N.Məhərrəmov təzkirəçinin Azərbaycan dilində yazdığı qəzəl və rübailərin bəzilərini ilk dəfə Bakıda nəşr etdirmişdir[272].

Məftun məni ol nərgisi-fəttan etti,
Könlümni cəfa oduna üryan etti.
Canımni sitəm oxlarına qıldı hədəf,
Ol oxlarına qəmzəni peykan etdi.

[272] Məhərrəmov N. Əliqulu xan Valeh. Şeirlər // Keçmişimizdən gələn səslər, IV buraxılış, Bakı, 1984, s. 143-152.

Valeh Hindistanda olarkən Aqra, Dehli, Cahanşahabad, Lahor və başqa şəhərləri gəzmiş, materiallar toplamış və h.1161/ 1747-ci ildə ***"Riyazüş-şüəra"*** adlı təzkirəsini tamamlamışdır.

Valeh təzkirəsini fars dilində qələmə almışdır. Əsər müqəddimə, iyirmi səkkiz rövzə və xatimədən ibarətdir. Təzkirəçinin həyatı haqqında ən dəqiq və ətraflı məlumatı "Riyazüş-şüəra"nın sonundan alırıq. Müqəddimə istisna olmaqla əsərin üslubu sadədir.

C.Qəhrəmanov Hindistanın Bankipor şəhərindəki kitabxanasında saxlanılan nüsxəsində 2540 şair haqqında məlumatın təxəllüslərinə görə əlifba sırası ilə verildiyini yazır[273]. Ə.G.Məani isə təzkirədə 2594 şairdən bəhs edildiyini qeyd edir[274]. A.Kozlovanın istifadə etdiyi Berlin nüsxəsində 2402 şair xatırlanmışdır[275].

Təzkirəçi əsərin müqəddiməsində göstərir ki, təzkirəni yazmaqda məqsədi az tanınan və ya unudulmuş şairlərin adını əbədiləşdirmək olmuşdur. Valeh müqəddimədə Caminin "Məhafatülüns" və Əlişir Nəvainin "Məcalisün-nəfais" təzkirələrini də xatırlayır.

Təzkirədə yüzdən artıq azərbaycanlı şair haqqında məlumat verilmişdir ki, onlardan təqribən 70 faizi az tanınan və unudulmuş şairlərdir. Burada Nizami, Xaqani, Əbülüla Gəncəvi, Nəsimi, Saib Təbrizi və başqa məşhurlarla yanaşı, Heydəri Təbrizi, Bəxşi Təbrizi, Cəfər Təbrizi, Həqiri Təbrizi, Məhvi Ərdəbili və başqa anılmamış şairlər də xatırlanmışdır. "Qədim dövr" şairlərindən bəhs edərkən Təqiəddin Məhəmməd Əvhədinin "Ərəfatül-aşiqin", Nəsrabadinin "Təzkireyi-Nəsrabadi", Həzinin "Təzkirətül-müasirin" təzkirələrindən istifadə etmişdir.

[273] Qəhrəmanov C. Valeh Dağıstani və onun "Riyazüş-şüəra" əsəri / "Ədəbiyyat və incəsənət» qəz., Bakı, 1982, 17 sentyabr.

[274] Məani Ə.G. Tarixi-təzkirəhayi-farsi. I c., s. 651.

[275] Козлова А. Новое об Али Кули Хане Валехе и его духовном наследии // КНКО, Вести, 2001, вып. 6-7, с. 5.

Valeh əsərini yazarkən Dövlətşahın, Nəvainin, Sam mirzənin təzkirələrindən istifadə etmiş və sözügedən mənbələrdəki məlumatları sadəcə köçürməmiş, oradakı yanlışlıqları düzəltmişdir[276].

Müasirlərindən bəhs edən hissə üçün materialı təzkirəçi şəxsən özü toplamışdır.

Təzkirənin Hindistan nüsxələrinin fotosurətləri Əlyazmalar İnstitutunda saxlanılır. Əlyazmalardan biri h. 1161/1748-ci ildə Gülşən Əli tərəfindən köçürülmüşdür. Həcmi 493 vərəqdir. Ikinci əlyazma da müəllifin yaşadığı dövrdə - h.1163/1750-ci ildə nəstəliq xətti ilə köçürülmüşdür. Prof. C.Qəhrəmanov bu nüsxənin Valehin özü tərəfindən köçürüldüyü qənaətindədir.

Təzkirə 1780-cı ildə Kamal Əli bin Sənaullah Hüseyn Nasiri tərəfindən Riçard Consonun xahişi ilə ixtisar edilmişdir. Buraya şairlər haqqında əlavələr edilmiş və əsər "Lübbi-lübab" adlandırılmışdır.

***Əlyazmaları***

*Tehran Milli Kitabxanası.*
*Tehran Universiteti Kitabxanası.*
*İran Məlik Milli Kitabxanası.*
*Asəfiyyə Kitabxanası 164.*
*Ustad Cəlaləddin Hümayinin şəxsi Kitabxanası.*
*Hindistan Bankipor Kitabxanası.*
*Pəncab Universiteti Kitabxanası.*
*Kəlküttə Milli Kitabxanası.*
*Bodlean Kitabxanası.*
*İndia Ofis Kitabxanası 3653.*
*Berlin Kitabxanası 656.*
*Berlin Kitabxanası 657.*

---

[276] Qəhrəmanov C. Valeh Dağıstani və onun "Riyazüş-şüəra" əsəri / "Ədəbiyyat və incəsənət" qəz., Bakı, 1982, 17 sentyabr.

# LÜTFƏLİ BƏY AZƏR

Azərbaycan təzkirəçisi və şairi Lütfəli bəy Azər 20 rəbiülaxır 1134/ 7 fevral 1722-ci ildə İsfahanda anadan olmuşdur. Lütfəli bəy Azərbaycanın türk qızılbaş tayfalarından olan şamlu oymağının bəydili qəbiləsinə mənsubdur.

Lütfəli bəyin anadan olduğu il əfqanlar İsfahanı ələ keçirmiş-dilər. Bu səbəbdən atası Ağa xan ailəsi ilə birlikdə Qumda yerləş-mək məcburiyyətində qalmışdı. Lütfəli bəy 14 yaşına qədər burada təhsil almışdır.

Şeir yazmağa çox böyük həvəsi olan Lütfəli bəy Mir Seyid Əli Müştaq və başqa şairlərdən bəhrələnmişdir. Şeirlərini əvvəlcə ***Valehi, Nükhət*** təxəllüsü ilə yazmış, daha sonra ***Azər*** təxəllüsünü götürmüşdür. Atasının vəfatından sonra Lütfəli bəy əmisi ilə həccə getmişdir. Oradan qayıdanda bir il Məşhəddə qalmış və h.1153-cü ilin şəvval ayında (1741-ci il fevral) Nadir şahın Quzey İrana səfə-rində iştirak etmişdir. Lütfəli bəy Nadir şahın mustovfisi olmuşdur. Səfərdən qayıdandan sonra İsfahanda qalmışdır. Nadir şahın ölü-mündən sonra Əli şah, İbrahim şah, III Şah İsmayıl Səfəvi və Şah Süleyman dövründə müxtəlif vəzifələrini tutmuşdur. Bunlardan sadəcə İbrahim mirzə dövründə divan dəftərxanasının müdiri (daruğayi-dəftəri-divan) vəzifəsində çalışdığı məlumdur. İranın qarışıqlıq vaxtında Lütfəli bəy inzivaya çəkilmişdir. O, Qumda təşkil olunan elmi məclislərdə iştirak edirdi. Lütfəli bəy Qumda vəfat etmişdir.

Lütfəli bəyin qəzəl, qəsidə, tərkibbənd, qitələrdən ibarət olan 7000 beytlik “Divan”ı h.1366-cı ildə Tehranda Həsən Sadat Nasiri tərəfindən nəşr olunmuşdur.

Lütfəli bəy Caminin “Yusif və Züleyxa”sını örnək götürərək, eyni adlı əsər qələmə almışdır.  Bundan əlavə, müəllif Sədinin “Gülüstan”ına bənzəyən “Gəncinətül-həqq” adlı əsəri də vardır. Lütfəli bəy çağdaşı olan şairlərin tərcümeyi-hallarını və əsərlərin-

dən nümunələri əhatə edən "Dəftəri-Nuhasman", "Saqinamə", "Müğənninamə" və "Məsnəviyi-Azər" adlı əsərlərin də müəllifidir.

Lütfəli bəy Azər ***"Atəşkədə"*** təzkirəsini h.1174/1761-ci ildə yazmağa başlamışdır. Əsərin tamamlanma tarixi məlum deyil. Prof. T.Yazıcı əsərdə bəhs olunan şairlərin vəfat tarixlərindən ən sonuncusunun h.1193/1779-cu ilə təsadüf etdiyini vurğulayaraq əsərin bu tarixdən sonra tamamlandığını yazır[277]. "Atəşkədə" təzkirəsi İran, Orta Asiya, Azərbaycan və Hindistanda yaşayan 842 şair haqqında məlumatı əhatə edir. M.Məmmədova bunlardan iki yüzə qədərinin azərbaycanlı olduğunu yazır.

Təzkirə *giriş* və *iki əsas məcmərədən* ibarətdir. Ön sözdə İranın əfqan istilasından, güney əyalətlərində sakitliyi təmin edən Kərim xan Zəndə qədər davam edən qarışıqlıq dövrü haqqında məlumat verilmişdir. Azər şairləri mənsub olduqları bölgəyə və şəhərə görə sıralamışdır.

"Atəşkədə" *"məcmərə"* adı verilən *iki fəslə* ayrılmışdır. M.Məmmədova "Atəşkədə"dən bəhs edərkən təzkirənin strukturu haqqında ətraflı məlumat vermişdir[278].

***Birinci "məcmərə"*** *şölə, üç əxgər və füruğ* başlıqlı *üç fəsldən* ibarətdir.

Birinci məcmərədə qədim şairlər haqqında məlumat verilir. Təzkirənin "şölə" adlı hissəsində şeir yazmış əmir və şahzadələrin tərcümeyi-halı yer almışdır.

Birinci məcmərə üç *"əxgər"*ə ayrılmışdır. Birinci əxgərin birinci "şərarə"si Azərbaycan şairlərinə həsr edilmişdir. İkinci şərarədə Xorasan şairlərindən, üçüncü şərarədə Təbəristan, Cürcan və s. ölkələrin şairlərindən bəhs olunmuşdur. Dördüncü şərarə *iki şüa*ya ayrılmışdır. *Birinci şüa* İraqi-Ərəb, *ikincisi* isə İraqi-Əcəm sahəsinin şairlərini əhatə edir. Beşinci şərarə Fars vilayətinin şairləri haqqındadır.

---

[277] Yazıcı T. Ateşkede. DVİA. IV c., İstanbul, 1991, s. 58.

[278] Məmmədova M. Lütfəli bəy Azər və Azərbaycan ədəbiyyatı. Bakı, 2001, s. 70.

Turanzəminə daxil olan ölkələrin şairlərindən bəhs olunan ikinci əxgər üç şərarəyə bölünmüşdür. Birinci şərarə "Xütteyi-Bəlx" və ona tabe olan sahəyə, ikinci şərarə Dehli və onun tabeliyində olan vilayətlərə, üçüncü şərarə Kəşmir şairlərinə həsr edilmişdir.

Təzkirənin "füruğ" adlanan hissəsində isə müxtəlif ölkələrin şairlərindən bəhs olunmuşdur. Təzkirənin bu hissəsində verilən məlumatları çox hissəsi Tağı Kaşinin "Xülasətül-əşar və zübdətül-əfkar" adlı əsərindən götürülmüşdür.

***İkinci "məcmərə"*** *iki "pərtöv"ə* ayrılmışdır.

Atəşkədənin ikinci məcmərəsi müəllifin çağdaşı olan şairləri əhatə edir və "pərtöv" adı verilən iki bölməyə ayrılmışdır. Birinci pərtövdə əfqanların İranı istilası və sonrakı hadisələr haqqında giriş və daha sonra çağdaşı olan şairlər haqqında məlumat verilmişdir.

İkinci pərtövdə təzkirəçi öz tərcümeyi-halını və şeirlərindən nümunələrə yer vermişdir.

Lütfəli bəy təzkirəsinin müqəddiməsində yazır: "Tarix kitablarına müraciət edib, şairlərin anadan olma tarixlərini və mənsub olduqları yeri təyin etdim. Hər hansı ölkənin və şəhərin şairi haqqında məlumatı həmin şair üçün ayrılmış səhifədə qələmə aldım. Əsəri əlifba sırası ilə yazdım. Əsərin adını "Atəşkədə" qoydum. Bundan əvvəlki təzkirələri paxıllıq atəşinə atdım"[279].

F.ü.f.d. M.Məmmədova təzkirənin "Atəşkədə" adını daşıması məsələsinə də aydınlıq gətirməyə çalışmışdır: *"Ehtimal etmək olar ki, Lütfəli bəyin özünə Azər təxəllüsü götürməsi və əsərinin adını "Atəşkədə" qoyması qədim azərbaycanlıların atəşpərəstliyi ilə əlaqədardır. Kahinlərin oturduqları məbəddə Atəşkədə, oda səcdə edənlərə isə azər deyirmişlər. Azər odlu şairlərin yanar qəlbindən*

[279] Məmmədova M. Lütfəli bəy Azər və Azərbaycan ədəbiyyatı. Bakı, 2001, s. 69.

*çıxmış şah beytlərini öz təzkirəsində hifz etdiyinə, qoruyub saxladığına görə əsərini "Atəşkədə" adlandırmışdır"*[280].

"Atəşkədə"nin mənbə və qaynaqlarına gəlincə, Lütfəli bəy təzkirəsində istifadə etdiyi əsərlərin adlarını yeri gəldikcə qeyd etmişdir. Əsərin əsas qaynağı isə Məhəmməd Övfinin "Lübabül-əlbab"ıdır. Ə.G.Məani isə Lütfəli bəy Azərin təzkirəsinin orijinal olmaması üzərində durur: "Baxmayaraq ki, Azər Bəydili belə iddia edir ki, şeirləri özü şəxsən şairlərin divanlarından seçmişdir, lakin əməldə görünür ki, o, keçmiş şairlər haqqında h. XI/XVII əsrin əvvəllərinədək "Xülasətül-əşar və zübdətül-əfkar" adlı böyük təzkirədən müxtəsər xülasəni bizə "Atəşkədə" adı ilə təqdim etmişdir"[281]. Prof. T.Yazıcı da Ə.G.Məaninin bu fikirlərini təkrarlamışdır[282]. M.Məmmədova isə Lütfəli bəyə qarşı irəli sürülən bu iddialara cavab vermişdir: "Azər özündən əvvəlki təzkirələrdən istifadə etmişdirsə, söz yox ki, həmin təzkirədən də bəzi qeydlər götürmüşdür. Lütfəli bəyin özü "Atəşkədə"nin müqəddiməsində göstərir ki, müxtəlif təzkirələrdən istifadə etmişdir. Bu kimi hallarda Azər həmin fikrin hansı mənbədən götürüldüyünü qeyd etməyi heç vaxt unutmamışdır"[283].

Atəşkədə Azərbaycanın tarixi coğrafiyasını öyrənmək baxımından da əhəmiyyətlidir. Təzkirədə Azərbaycanın Ərdəbil, Ordubad, Beyləqan, Təbriz, Xalxal, Şirvan, Gəncə, Marağa kimi tarixi şəhərləri və bölgələri haqqında məlumat yer almışdır.

Məsələn: "Azərbaycan – binasını Azər ibn Əmir ibn Əshəd ibn Sam qoymuşdur. Bəziləri söyləmişlər ki, Şapur Züləktab zamanında Azərbad adlı bir şəxs peyğəmbərlik iddiası etmiş, bir çoxları inanıb, onun dinini qəbul etmişlər. Şapur onu tutub, sinəsinə ərinmiş filiz tökdürmüş, lakin ona heç bir zərər dəyməmişdir. Ona

280 Məmmədova M. Lütfəli bəy Azər və Azərbaycan ədəbiyyatı. Bakı, 2001, s. 68.
281 Məani Ə.G. Tarixi-təzkirəhayi-farsi. II c., s. 14.
282 Yazıcı T. Ateşkede. DVİA. IV c., İstanbul, 1991, s. 58.
283 Məmmədova M. Lütfəli bəy Azər və Azərbaycan ədəbiyyatı. Bakı, 2001, s. 73.

görə də xalq ona daha artıq inanmışdır. Bu vilayətin abadlığı onun tərəfindən olmuşdur.

Əvvəllər sərhədləri İraqi-Əcəm, Muğan, Gürcüstan, Ərmən, Kürdüstan və Şirvana çatırdı. Amma indi bütün Şirvan, Muğan, Gürcüstan və Ərmən Azərbaycana daxildir. O behiştə bənzər diyarın hüsnünü yazmaqla başa gələn deyil. Ümid edirik ki, ruzigarın bəlasından hifz olunsun. Hər şəhərin şairlərinin əhvalı və sözləri tərtiblə yazılır".

Azərbaycan haqqındakı bu məlumatdan sonra təzkirəçi bu ölkənin şəhərlərindən qısaca bəhs etmiş və orada yetişmiş şairlərin tərcümeyi-halı və əsərlərindən nümunələr təqdim etmişdir. Təzkirədə yer almış şeir örnəkləri fars dilindədir.

Təzkirənin şah və şahzadələrdən bəhs edən bölümündə Əlqas mirzə Səfəvi, Bəhram mirzə Səfəvi, Cahi, Cəfər bəy, Şah İsmayıl Xətai, Dərdi Əfşar, Sami Səfəvi, Sadiqi, Şah Təhmasib, Adili Səfəvi, Şah Abbas, Şah Abbas Sani, Qismi Əfşar, Pur Həsən kimi azərbyacanlılardan bəhs olunmuşdur. Təzkirəçi daha sonra bölgələr üzrə Azərbaycan şairlərini sıralamışdır. *Ərdəbil* – Cami, Məhvi; *Ordubad* – Ziyai, Raqib; *Beyləqan* – Mücirəddin; *Təbriz* – Mirzə Əsədulla, Xacə Əmir bəy, Şah Qasım Ənvar, Əbdülbaqi, Bədii, Cəfəri, Cövhəri, Əzizi, Nəşə Təbrizi, Həqiri, Heydəri, Xari, Raqibi, Mirzai, Şərif, Molla Şəmsəddin, Şövqi, Səburi, Tövfi, Zühuri, İczi, Əssar, Ünvan, Fəsihi, Fövqi, Fərdi, Qətran, Kazima, Mahmud Şəbüstəri, Məsihi, Müşki, Məruf, Məlum, Məğribi, Müqimi, Mülhimi, Nisari, Vüqui, Hümai; *Xalxal* - Fənai; *Şirvan* – Həkim Xaqani, Seyid Zülfüqar, İzzəddin, Fələki; *Gəncə* - Əbülüla, Yusif Kosa; *Marağa* – Mövlana Əvhədi, Əbu Ömər Əbhəri, Ədhəm bəy, Qazı Əhməd Qəffari, Heyrəti, Xızıri, Dərviş Dəhəkgi, Şeyx Şəhabəddin Söhrəvərdi, Übeyd Zakani, Mirzə Müqim, Nərgisi, Vaiz, Xacə Nəsir, Şeyx Nizami, Məshəti, Əvhədi, Hatif, Üzri, Məsrur Bəydili, Baba Şəhidi, Saib[284].

[284] Təzkirədəki Azərbaycan şairləri haqqındakı məlumat üçün bax: Məmmədova M. Lütfəli bəy Azər və Azərbaycan ədəbiyyatı. Bakı, 2001, s. 78-115.

"Atəşkədə" bir sıra təzkirələrin qaynaqları sırasındadır. Bunların sırasında Məhəmmədhəsən xan Etimadüssəltənənin, Seyid Əzim Şirvaninin təzkirələrini nümunə göstərmək olar.

Sultan Məhəmməd Bahadır xan Səfəvi h. 1211-1216/1796-1801-ci illərdə tərtiblədiyi ***"Töhfətüş-şüəra"*** təzkirəsini "Atəşkədə"nin təsiri altında qələmə almışdır.

***Əlyazmaları***

*AMEA Əlyazmalar İnstitutu D – 20.*
*AMEA Əlyazmalar İnstitutu C – 103.*
*AMEA Əlyazmalar İnstitutu M – 238.*
*AMEA Əlyazmalar İnstitutu M – 240.*
*İndia Ofis K/X. 2929.*
*İndia Ofis K/X. 3445.*
*Berlin K/X. 658.*
*Berlin K/X. 213.*
*Berlin K/X. 115.*
*Kopenhagen K/X. Add. 19.*
*Tehran Universiteti Mərkəzi K/X 5122.*
*Tehran Universiteti Mərkəzi K/X 462.*
*Tehran Universiteti Mərkəzi K/X 4865.*
*Tehran Universiteti Mərkəzi K/X 38.*
*Tehran Universiteti Mərkəzi K/X 158.*
*Tehran Universiteti Mərkəzi K/X 5054.*
*Tehran Universiteti Mərkəzi K/X 133.*
*Tehran Universiteti Mərkəzi K/X 6328.*
*Tehran Universiteti Mərkəzi K/X 5272.*
*Tehran Universiteti Mərkəzi K/X 168.*
*Tehran Universiteti Mərkəzi K/X. 2169.*
*Ayətullah Mərəşi K/X. 2632*
*İran Milli K/X 100.*
*İran Milli K/X 1286.*
*İran Milli K/X 253.*

*Los-Ancels K/X M 445.*
*Çikaqo Universiteti A – 12074.*
*Kitabxaneyi-Vəziri, Yəzd 275.*
*İsfahan Universiteti Mərkəzi K/X. 474.*
*İsfahan Universiteti Mərkəzi K/X. 43.*
*Şəhid Mütəhhəri Ali Mədrəsəsi K/X. Tehran 2726.*
*Şəhid Mütəhhəri Ali Mədrəsəsi K/X. Tehran 2674.*
*Şəhid Mütəhhəri Ali Mədrəsəsi K/X. Tehran 2682.*
*Şəhid Mütəhhəri Ali Mədrəsəsi K/X. Tehran 7074.*
*Tacikistan Elmlər Akademiyası 53.*
*Tacikistan Elmlər Akademiyası 213.*
*Həzrət Ayətullahül-Üzma Borucerdi K/X. 176.*
*İran İslami Şura Məclisi K/X. 886.*
*İran İslami Şura Məclisi K/X. 322.*
*İran İslami Şura Məclisi K/X. 5702.*
*Mərkəzi-Ehyai-Mirasi-İslam, Qum 1747.*
*Mərkəzi-Ehyai-Mirasi-İslam, Qum 138.*
*Mərkəzi-Ehyai-Mirasi-İslam, Qum 1886.*
*Hüseyn Miftahın şəxsi kolleksiyası, Tehran 1387.*
*Hüseyn Miftahın şəxsi kolleksiyası, Tehran 1113.*
*Hüseyn Miftahın şəxsi kolleksiyası, Tehran 816.*
*Hüseyn Miftahın şəxsi kolleksiyası, Tehran 582.*
*Gülüstan K/X. 860.*
*Gülüstan K/X. 861.*
*Gülüstan K/X. 862.*
*Gülüstan K/X. 863.*
*Gülüstan K/X. 1757.*
*Gülüstan K/X. 622.*
*Gülüstan K/X. 891.*
*Məhəmməd Fərhad Mötəmid kolleksiyası.*
*Həsən Atifi K/X.*
*Nemətullahi xanəgahının K/X. 389*
*Hafiz Fərmanfərmaiyan K/X.*
*Şəhid Mütəhhəri Ali Mədrəsəsi K/X 7190.*


بسم الله الرحمن الرحيم

**Lütfəli Bəy Azər. "Atəşkədə"**
**AMEA Əlyazmalar İnstitutu C-103**

# İSHAQ BƏY ÜZRİ BƏYDİLİ

İshaq bəy Üzri Bəydili (?-h.1185/1771) "Təzkireyi-İshaq" əsərinin tərtibçisidir. O, Lütfəli bəy Azərin qardaşıdır. Haqqında məlumata "Atəşkədə" təzkirəsində rast gəlirik. Lütfəli bəy qardaşı haqqında yazır: "Şərəfli adı İshaq bəydir. Həqirin kiçik qardaşıdır. Həyalı və insaflı bir cavan idi. Könlü eşq, sevgi rümuzundan xəbərdar və təbi çiçəklənmişdi. Hərdən qəzəl və rübai yazardı. H. 1185-ci ildə ruhunun bülbülü behişt ağacına qondu"[285]. Daha sonra Səbahi təxəllüslü şairin Üzrinin vəfatına söylədiyi tarix qeyd olunmuşdur:

Səbahidən istədik ki, onun vəfat tarixini söyləsin,
Dedi: əbədi behiştdə İshaq bəy olsun.

İshaq bəyin "Təzkireyi-İshaq" adlı əsəri əslində şeirlər məcmuəsi və ya antologiyadır. Buna görə də, çox sayda nüsxələri olmasına baxmayaraq, əksər hallarda kataloqlarda cüng kimi qeydə alınmışdır. Bu məcmuə Lütfəli bəy Azərin təzkirəsindəki şeirlərdən seçmələri əhatə edir. Dibaçəsi yoxdur. Əsər dörd fəsildən ibarətdir:

I fəsil qəsidələri,
II fəsil qitələri,
III fəsil qəzəlləri,
IV fəsil isə rübailəri əhatə edir.

Tərəfimizdən təzkirənin İran Məclis Kitabxanasında (7261) saxlanılan nüsxəsi əldə edilmişdir.

M.Məmmədova Üzrinin 7200 beytdən və 200 vərəqdən ibarət olan "Divan"ının yeganə əlyazma nüsxəsinin İranda Məclis kitabxanasında saxlanıldığını qeyd edir. Əsər İshaq bəyin vəfatından

[285] Məmmədova M. Lütfəli bəy Azər və Azərbaycan ədəbiyyatı. Bakı, 2001, s. 113-114.

31 il sonra, 1802-ci ildə dövrün məşhur xəttatı Məhəmməd Möhsün Həmədani tərəfindən köçürülmüşdür[286].

### *Əlyazmaları*

*Nemətullahi xanəgahının k/x. 422.*
*Tehran Universiteti mərkəzi k/x 4764.*
*İslami Şura məclisi K/x 7261.*
*İran Milli K/x 1257.*
*Şəhid Mütəhərri Ali Mədrəsəsinin k/x. 2716.*
*Şəhid Mütəhərri Ali Mədrəsəsinin k/x. 2723.*

---

[286] Məmmədova M. Lütfəli bəy Azər və Azərbaycan ədəbiyyatı. Bakı, 2001, s. 22.



بسم الله الرحمن الرحیم

**İshaq Bəy Üzri. “Təzkireyi-İshaq”**
**İran Məclis Kitabxanası 7261**

# ƏBU TALİB XAN TƏBRİZİ

XVIII əsr Azərbaycan təzkirəçilərindən biri də Əbu Talib xan Təbrizidir. Onun həyat və yaradıcılığı haqqında məlumatı M.Tərbiyət təzkirəsindən alırıq. Əbu Talib xanın atası Hacı Məhəmmədbəy xan Təbrizi Nadir şah dövründə İsfahandan Hindistana getmiş və o, h.1165/1751-ci ildə Ləknəhur şəhərində anadan olmuş, orada boya-başa çatmışdır. "Töhfətül-aləm" əsərinin müəllifi Kəlküttədə onunla görüşüb, təbinin zənginliyini və sərbəst yaradıcılığını tərifləmişdir: "Əbu Talib yaradıcılığa və ədəbiyyatşünaslığa böyük həvəs bəsləyir və tarixçilikdə misli-bərabəri yox idi. O, güclü hafizə sahibi olaraq, Xaqani, Ənvari kimi şairlərin çətin şeirlərini əzbər bilir və izah edirdi".

Mirzə Əbu Talib h.1206/1791-ci ildə ***"Xülasətül-əfkar"*** adlı təzkirə təlif etmişdir. Əsərdə nəzm, nəsr, inşa, risalə, əruz, qafiyə, musiqi, əxlaq və s. haqqında məlumat verilmişdir[287].

H. 1208-ci ildə tarix və coğrafyadan bəhs edən "Lübbüs-siyər və cahannüma" adlı əsər qələmə almışdır. Bu əsərin III babı təzkirə xarakterli olub, şairlər və fazillər haqqındadır.

Əbu Talib xan h.1221/1806-cı ildə vəfat etmişdir.

---

[287] Məhəmmədəli Tərbiyət. Danişməndani-Azərbaycan. Bakı, 1987, s. 107.

# SULTAN MƏHƏMMƏD MİRZƏ BAHADIR XAN SƏFƏVİ

Səfəvi nəslindəndir. Təxminən h. 1187 / m. 1773-74-cü ildə anadan olmuşdur. Siyasi hadisələr səbəbi ilə h. 1205 / m. 1790-91-ci ildə İrandan Sində qaçmış, h. 1210 / m. 1795-96-cı ildəLəknəhurda məskunlaşmışdır. "Tülui" təxəllüsü ilə şeirlər yazmışdır. Əbülhəsən ibn İbrahim Qəzvini "Fəvaidi-Səfəviyyə" əsərində h. 1217/1802-03-cü ildə onun təxminən 30 yaşının olduğunu bildirmiş, 5 min beytdən ibarət poeziyasının (qəzəl, rübai və qitə) olduğunu, həmçinin "Töhfətüş-şüəra", "Töhfətül-əhbab", "Töhfətüs-səlatini-Səfəviyyə", "Əxlaqi-Məhəmmədi", "Töhfətül-üşşaq" kimi əsərlər yazdığını bildirmişdir[288].

Səfəvi şahzadəsi qədim və müasir şairlər haqqında ***"Töhfətüş-şüəra"*** təzkirəsini h. 1211-1216/1796-1801-ci illərdə Lütfəli bəy Azərin "Atəşkədə" təzkirəsinin təsiri altında qələmə almışdır. Təəssüf ki, bu təzkirə haqqında daha geniş məlumata malik deyilik.

---

[288] Məani Ə.G. Tarixi-təzkirəhayi-farsi. I c., s. 160-168.

# *XIX ƏSR TƏZKİRƏÇİLİYİ*

- Məhəmməd Fazil xan Gorusi
- Əbdürrəzzaq bəy Dünbüli Azərbaycani
- Bəhmən mirzə Qacar
- Hülaku mirzə Qacar
- Xudaverdi xan Qacar
- Məhəmməd Bağır xan Qacar
- Məhəmməd Həsən xan Etimadüssəltənə
- Məhəmməd Saleh Şamlu
- Mahmud mirzə Qacar
- Heydərqulu mirzə
- Məhəmmədqulu mirzə Qacar
- Seyfüddövlə Sultan Məhəmməd Tağı
- Məhəmməd Kazım Əsrar Əlişah Təbrizi
- Əli Rza mirzə Qacar
- Əbülqasım Möhtəşəm Şirvani
- Seyid Əzim Şirvani
- Ziyai
- Mir Möhsün Nəvvab

## ƏBDÜRRƏZZAQ BƏY DÜNBÜLİ AZƏRBAYCANİ

Adı Əbdürrəzzaq bəy, ədəbi təxəllüsü Məftundur. Təbriz bəylərbəyisi Nəcəfqulu xanın oğludur. O, atasından sonra istər-istəməz hökumət işini tərk edib, elm kəsb etmək, bu vilayətin alimləri ilə həmsöhbət olmaq və bilik əldə etməklə vaxtını keçirərək, elm və maarif sahəsində yüksək mərtəbəyə çatmışdır. Məftun ərəb və əcəm ədiblərinin və məşhur fəzilətli şəxslərin əsərlərini mütaliə edərək öyrənmiş və yüksək məfkurə sahibi olub, elm və ədəbiyyat sevən şəxslərin müraciət etdikləri bir şəxsiyyət olmuşdur. Deyilənlərə görə, o, Bəndə təxəllüslü Mirzə Rəzi ilə birlikdə "Zinətüt-təvarix" əsərini yazmışdır.

Əbdürrəzzaq bəy Dünbüli h.q.1176/1762-ci ildə Xoy şəhərində anadan olmuşdur. O, on yaşında ikən atası onu böyük oğlu Fəzləli bəyin əvəzinə Şiraz hökmdarı yanına girov göndərmişdir. əbdürrəzzaq bəy Şirazda on dörd il ev dustağı kimi qalmış, bu müddətdə elm və bilik öyrənməklə vaxtını keçirmişdir. əlimurad xan Kərim xan Zəndin qardaşı Sadıq xanın əleyhinə qoşun çəkib, doqquz ay vuruşduqdan sonra Şirazı almış və Şirazda Azərbaycandan girov saxlanmış adamları İsfahana göndərmişdir. H.q.1199/1785-ci ildə Əlimurad xan vəfat etdikdən sonra Ağaməhəmməd şah İsfahana gedib, Azərbaycandan girov alınmış adamlara, o cümlədən Məftuna Azərbaycana qayıtmaq icazəsi vermişdir[289].

Bir müddət Fətəli şahın böyük oğlu olan Azərbaycan hakimi Naibüs-səltənə Abbas mirzənin xidmətində çalışmışdır. Məftun h. 1241/1825-ci ildə Məkkəyə gedib qayıtmış və h. 1243/1827-ci ildə Təbrizdə vəfat etmişdir.

---

[289]Məhəmmədəli Tərbiyət. Danişməndani-Azərbaycan. Bakı, 1987, s. 204-208; Стори Ч.А. Персидская литература. Москва, 1972, ч. 3, с. 944-947; Hüseyn Naxçıvani. Əbderrəzzaq bəy Dünbüli mütəxəllis be Məftun // Nəşriyyeyi-Danişkədeyi-Ədəbiyyati-Təbriz. Sali-dovvom, şomareyi-əvvəl, 1328, s. 1-13; Quliyev A.A. Görkəmli Azərbaycan alimi Əbdürrəzzaq bəy Dümbüli // Azər. SSR EA Xəbərləri. Tarix, fəlsəfə və hüquq seriyası, 1966, N 3, s. 100-108.

Əbdürrəzzaq bəy fars və ərəb dillərində nəzm və nəsrlə əsərlər yaratmış, ərəb şairlərinin və rəvayətçilərinin yaradıcılıq incəliklərini öyrənmişdir. O, çox vaxt mütaliə və tədqiqatla məşğul olaraq, ömrünü kitablar və əsərlər yazmaqla başa çatdırmışdır. Tədqiqatçılar onun 16 əsərin müəllifi olduğunu bildirirlər[290].

Məftun təxəllüsü ilə tanınan Əbdürrəzzaq bəy Dünbüli üç təzkirə yazmışdır. Bunlar "Nigaristani-Dara", "Təcrübətül-əhrar və təsliyyətül əbrar" və "Hədayiqül-üdəba" adlı əsərlərdir.

Əbdürrəzzaq bəy Dünbülinin digər bir təzkirəsi h. 1228/1813-cü ildə qələmə aldığı ***"Təcrübətül-əhrar və təsliyyətül əbrar"*** adlı əsərdir. Təzkirə üç fəsildən ibarətdir.

***I qisim*** Dünbüli tayfası və onların 20 nəfər alimi və arifi haqqındadır;

***II qisim*** Zəndiyyə dövrünün 16 şairi haqqındadır;

***III qisim*** müəllifin həyat və yaradıcılığı və dövrün hadisələri haqqındadır.

Əbdürrəzzaq bəyin üçüncü təzkirəsi h.1230/1814-cü ildə yazdığı ***"Hədayiqül-üdəba"***dır. Burada əvvəlcə cahiliyyət dövründən etibarən ərəb şairlərindən bəhs olunmuş, daha sonra Rudəkidən başlayaraq farsca yazan şairlər haqqında məlumat verilmişdir. Bu təzkirəyə Xaqani, Nizami, Əbülüla Gəncəvi, Fələki Şirvani, Mücirəddin Beyləqani kimi Azərbaycan şairləri də daxil edilmişdir.

Əbdürrəzzaq bəy Dünbüli h. 1241/1825-ci ildə ***"Nigaristani-Dara"*** adlı təzkirəsini tərtibləmişdir. Bu təzkirə müəllifin müasiri olmuş şairlərdən bəhs edir və Azərbaycan hakimi Abbas mirzə Qacarın göstərişi əsasında yazılmışdır. Əsər bu bölümlərdən ibarətdir:

***I nigarxana*** zəmanə xaqanı Fəthəli şah Qacara həsr edilmişdir;

***II nigarxana*** Qacar şahzadələrinə və böyük əmirlərə həsr olunmuşdur. Burada əvvəlcə şahzadələr yaşlarına görə, daha sonra isə əmirlər tutduqları mənsəblərə görə sıralanmışdır.

---

[290] Yenə orada.

***III nigarxana*** şaha və şahzadələrə yaxın olan şairlərdən, həmçinin şeir yazan saray xidmətçilərindən ibarətdir.

***IV fəsil*** isə müxtəlif vilayətlərin şairlərinə həsr olunmuşdur.

Təzkirədə verilmiş şeir nümunələrinin çox hissəsi farsca olsa da, təzkirəçi xüsusi olaraq qeyd edir ki, o, şairlərin türkçə və ərəbcə yazdıqları şeirlərdən də nümunələr vermişdir. Əsərdə təxminən 200 şairdən bəhs olunmaqdadır.

İran alimi Ə.G.Məani tekstoloji müqayisələr nəticəsində sübut etmişdir ki, Əbdürrəzzaq bəy öz təzkirəsini qələmə alarkən bir sıra şairlərin tərcümeyi-hallarını digər bir Azərbaycan təzkirəçisi Məhəmməd Fazil xan Gorusinin "Əncüməni-Xaqan" təzkirəsindən köçürmüşdür. Bu fikri hər iki təzkirənin təxminən eyni struktura malik olması da təsdiq edir[291].

***Əlyazmaları***

***"Nigaristani-Dara"***
*İran Məlik Milli Kitabxanası 4311.*
*Ağayi Əbülfütuh Ələvinin kitabxanası.*
*Britaniya Muzeyi Kitabxanası 123.*

***"Təcrübətül-əhrar və təsliyyətül əbrar"***
*İran Məclis Kitabxanası.*
*Təbrizdə Cəfər Sultanül-Qürrayinin şəxsi kitabxanası.*

***"Hədayiqül-üdəba"***
*Rüknəddin Hümayun Fərruxun şəxsi kitabxanası.*

---

[291] Məani Ə.G. Tarixi-təzkirəhayi-farsi. II c., s. 393-401.

# MƏHƏMMƏD FAZİL XAN GORUSİ RAVİ

Adı Məhəmməd, ləqəbi Fazil xan, ədəbi təxəllüsü Ravidir. Müəllifin nisbəsindən belə görünə bilər ki, o, əzəli Azərbaycan torpaqlarından olan Zəngəzur mahalının Gorus bölgəsində doğulmuşdur. Lakin İran alimlərinin bildirdiyinə görə, Azərbaycan türklərinin məşhur Bayandurlar nəslindən olan Məhəmməd Fazil xan h. 1198-ci (m. 1783-84) ildə Həmədan vilayətinin Gorus məntəqəsində dünyaya gəlmişdir. Gənc yaşlarında ikən Gorus hakimi ilə münaqişəsi üzündən doğma vətənini tərk edib İranın Rey şəhərinə köçmək məcburiyyətində qalmış, daha sonra Tehrana gəlib, oraya yerləşmişdir. Bir müddət Mazandaranda yaşasa da, təkrar Tehrana dönmüşdür. Dövlət xidmətində çalışan bəzi tanışlarınınköməyi ilə Qacarların sarayında işə düzəlmiş, vəzifə pillələrində tərəqqi edərək, h. 1230 / m. 1814-15-ci ildə çavuşbaşı təyin edilmişdir. Rəsmi məclislərdə tez-tez iştirak edərmiş. Çox güclü hafizəyə malik imiş. Fars və ərəb dillərinə mükəmməl dərəcədə yiyələnmişdir. Həm nəzm, həm də nəsr sahəsində qələmini sınamışdır. Lakin ədəbiyyat tənqidçiləri onun nəsrinin nəzmindən daha üstün olduğunu vurğulayırlar. Mahmud mirzə Qacarın “Səfinətül-Mahmud” əsərində onun şeirlərindən 16 beyt örnək olaraq təqdim edilmişdir. İran şairlərindən Mirzə Abbas Nişati xan Həzarcəribinin Məhəmməd Fazil xanı həcv etdiyi bir şeiri məlumdur. Haqqında bəhs etdiyimiz azərbaycanlı təzkirəçi h. 1253-cü (1837-38) ildə vəfat etmişdir.

O, ***“Əncüməni-xaqan”*** adlı təzkirəsini h. 1234 / m. 1818-19-cu ildə fars dilində qələmə almışdır. Əsərdə müəllif öz müasirlərindən bəhs etmişdir. Təzkirə bir müqəddimədən, dörd əncümədən və bir xatimədən ibarətdir.

***Müqəddimədə*** əsərin təlif səbəbləri göstərilmişdir. Burada müəllif bildirir ki, bu əsrin və zəmanənin şairləri çoxdurlar, amma onların adları heç bir təzkirədə qeyd edilməyibdir. Məhz bu səbəbdən onun özü kimi bir “bəsirətli mütəxəssisin bu işə əl qoyması la-

zım gəlmişdir". O, qeyd edir ki, daha öncə gürcü mənşəli Əhməd bəy Əxtər və onun qardaşı Məhəmməd Bağır bəy Nişati bu işə təşəbbüs göstərərək, "Əncümənara" adlı təzkirə tərtib etsələr də, bu sahədə "əhliyyət və səlahiyyətləri olmadığından, işin öhdəsindən layiqincə gələ bilməmişlər".

***I əncümən*** "Ulu Qacar elinin əsil-nəsəbinin icmalı, fələk kimi iqtidarlı olan hökmdarın vaqiəsinin, onun mübarək cülusunun, məmləkətləri idarə etməsinin zikri və sahibqiranın uğurlu əsərlərindən və seçkin şeirlərindən örnəklər" adını daşıyır. Bu bölüm əsas etibarilə Fətəli şah Qacara ayrılmışdır.

***II əncümənin*** adı "Şahzadələrin əhvalı, əfkarı və Qacar sülaləsinin böyüklərindən bəzilərinin haqqında"dır. Burada 15 şair xatırlanmışdır.

***III əncümən*** şeir deyən saray xadimlərinə həsr edilmişdir və "Şahənşahlıq dərgahında şərəf tapanların həsəbi və nəsəbi haqqında" adlandırılmışdır. Bu əncümən 42 şairi əhatə edir.

***IV əncümən*** "Əyalət şairləri haqqında"dır və 118 şair barəsində məlumatları ehtiva edir.

Xatimədə isə "Müəllifin əhvalı və şeirləri" mövzusundan söz açılmışdır.

Qeyd etməliyik ki, əsərin ilk iki əncüməni tamamilə türk əsilli Qacar xanədanından olan şairlərə həsr edilmişdir. Bundan başqa, III əncümində Bəndə təxəllüslü Mirzə Məhəmməd Rəzi Təbrizi, Məftun Azərbaycani, Nəsrulla xan Qaragözlü, IV əncümində isə Lütfəli bəy Azər Bəydili, onun oğlu Hüseynəli bəy Şərər Bəydili, Kəlbi-Hüseyn bəy Aşüftə İrəvani, Mürtəzaqulu bəy Pərişan Qaragözlü, Mirzə Məsum Xavəri Kuzəkonani Təbrizi, Hacı Süleyman Səbahi Bəydili, İshaq bəy Üzri Bəydili, Mehdiqulu bəy Azərbaycani və başqa azərbaycanlı şairlərin həyat və yaradıcılığına yer verilmişdir.

### *Əlyazmaları*

*İran Əsəd kitabxanası 2075.*
*Lahor Pəncab Universitetinin kitabxanası.*
*İran Məclis kitabxanası 892, 224, 3809.*
*İran Məlik Milli kitabxanası 3795.*
*Səltənət kitabxanası 191, 193, 184.*
*İran Sipəhsalar kitabxanası 485.*
*İran Astani-Qüdsi Kitabxanası 4201.*
*Tehran Milli Kitabxanası 8, 126, 35, 71, 108, 1612.*
*Mehdi Bəyaninin şəxsi kitabxanası.*
*Əbdülhüseyn Bayatın şəxsi kitabxanası.*
*Ustad Bədiüzzaman Firuzanfərinin şəxsi kitabxanası.*
*Məhəmməd İsmayıl Rizvaninin şəxsi kitabxanası.*
*Cəfər Sultan əl-Qürrayinin şəxsi kitabxanası.*


کتاب انجمن خاقان

بسم الله الرحمن الرحیم

**Məhəmməd Fazil xan Gorusi. "Əncüməni-xaqan"**
**İran Məclis Kitabxanası**

# MAHMUD MİRZƏ QACAR

XIX əsrdə təzkirə qələmə almış azərbaycanlı müəlliflərdən biri də Fətəli şah Qacarın oğlu Mahmud mirzədir. O, 12 səfər 1214/16 iyul 1799-cu ildə anadan olmuşdur. Dörd yaşından başlayaraq sədri-əzəm Mirzə Məhəmməd Şəfinin təlim-tərbiyəsi altında böyümüşdür. H.1229/1814-cü ildə Nəhavənd hakimi təyin olunmuşdur. Məhəmməd şah Qacar zamanında həbsə alınmış və İran Azərbaycanına sürgün edilmişdir. Təxminən 1852-53-cü illərdə Təbrizdə vəfat etmişdir. 21 əsərin müəllifidir. Ən məşhur əsərləri: "Səfinətül-Mahmud", "Bəyanül-Mahmud", "Gülşəni-Mahmud", "Nüqli-məclis", "Təzkirətüs-səlatin", "Məqsudi-cahan", səkkiz min beytdən ibarət "Divan", "Tarixi-sahibqirani"[292].

O, h.1236/1820-ci ildə Qacarlar xanədanının şairlərinə həsr edilmiş ***"Gülşəni-Mahmud"*** adlı ailə təzkirəsini yazmışdır. Burada əvvəlcə Xaqan təxəllüslü Fətəli şahın, onun qızlarının (11 şairə) və oğullarının (45 şair, daha sonra 2-si də əlavə edilmişdir), Fətəli xanın qardaşı Hüseynqulu xanın övladlarının (5 şair) həyat və yaradıcılıqları haqqında məlumat verilmişdir. Müəllif əsərin sonunda özü haqqında bilgi verir[293].

Müəllif h.1240/1824-cü ildə ***"Bəyanül-Mahmud"*** adlı digər bir təzkirə yazmışdır. Əsər bir müqəddimə və iki "qismət"dən ibarətdir. Müqəddimədə müəllifdən, təzkirənin təlif səbəbindən və şahın mədhindən bəhs olunmuşdur. Birinci "qismət"də müasiri olan şairlərdən 300 nəfəri haqqında məlumat vermişdir. İlk növbədə Fə-

---

[292] Стори Ч.А. Персидская литература. Москва, 1972, ч. 2, с. 951.; Берже А.П. Фетх-Али-шах и его дети (исторический очерк) // «Русская старина», 1886, № 6, с. 556.

[293] Fətəli şahın 360 arvadının, 57 oğlunun, 44 qızının olduğu bəllidir. 1834-cü ildə vəfat edərkən onun bütün övladlarının və nəvə-nəticələrinin ümumi sayı 935 nəfər idi (А.П.Берже, göstərilən əsəri, s. 549-562). Bəzi şahzadələrin bu təzkirəyə daxil edilməməsinin səbəbi budur ki, təzkirənin yazıldığı ildə həmin şahzadələr azyaşlı olduqları və ya şair kimi tanınmadıqları üçün bu əsərə daxil edilməmişlər.

təli şahdan bəhs edilmiş, daha sonra isə əlifba sırası ilə Əhməd Əli mirzədən Yusif Gürcüyə qədər digər müasir şairlər zikr edilmişlər. Bəzilərinin sadəcə adı, təxəllüsü, doğulduğu və yaşadığı yerlər göstərildiyi halda, bəzilərin təxminən 20 sətir həcmində tərcümeyi-halı verilmişdir. İkinci "qismət"də isə həmin şairlərin şeirlərindən nümunələr (3500 beyt) öz əksini tapmış və qəzəllərə üstünlük verilmişdir[294].

Bu təzkirədəki azərbaycanlı şairlərdən Lütfəli bəy Azər, Ülfət Əfşar (Məhəmədqulu), Aşüftə İrəvani (Kəlbi-Hüseyn bəy), Beyza Qacar (Allahverdi mirzə), Bəzmi Bəydili (Məhəmməd Sadıq), Bərqi Xoyi (Abdulla), Cahanşah mirzə Qacar, Cüdayi Əfşar (Nəsrulla mirzə), Çeşmə İrəvani (Rzaqulu xan), Hacib Qacar (Allahyar xan), Xosrovi Qacar (Məhəmmədqulu mirzə), Xavər Qacar (Heydərqulu mirzə), Dövlət Qacar (Məhəmməd Əli mirzə), Darayi-Qacar (Abdulla mirzə), Ravi Gorusi (Məhəmməd Fazil xan), Sərvər Qacar (Təhmasib mirzə ibn Məhəmməd Əli mirzə), Şövkət Qacar (Məhəmməd Tağı mirzə), Şapur Qacar (Şeyxəli mirzə), Şərər Bəydili (Hüseynəli bəy), Şövkət Qacar (Məhəmməd Qasım xan), Səbahi Bəydili (Hacı Süleyman), Toğrul Qacar (İbrahim xan), Tuti Cavanşiri (Əbülfəth), Adil Qacar (Əlişah Zillüssultan), İzzət Qacar (Süleyman xan), Üzri Bəydili (İshaq bəy), Qabil İrəvani (Hüseynəli xan), Mahmud mirzə Qacar, Məsrur Bəydili (Məhəmməd xan), Minnət Əfşar (Məhəmməd Kərim xan), Məftun Dünbüli (Əbdürrəzzaq bəy), Mehdi bəy Şəqaqi Azərbaycani, Niyaz Səfəvi (Əhməd mirzə), Nəsrulla xan Qaragözlü Həmədani, Nişat Türkman (Mirzə Əbdürrəzzaq), Valayi-Qacar (Əlinağı mirzə), Valeh Dağıstani (Əliqulu xan), Hümayun mirzə Qacar və başqalarının adlarını çəkə bilərik.

Mahmud Mirzə Qacar h.1241/1825-ci ildə qadın şairlərdən bəhs edən ***"Nüqli-məclis"*** adlı təzkirə tərtib etmişdir. Bu təzkirə dörd fəsildən ibarətdir.

I fəsildə Fətəli şahın şair qızları;

II fəsildə şairlik edən digər saray qadınları;

---

[294] Məani Ə.G. Tarixi-təzkirəhayi-farsi. I c., s. 137-149.

III fəsildə İranın başqa bölgələrinin şairələri;
IV fəsildə isə keçmiş zaman şairələri xatırlanmışdır.

***Əlyazmaları***

***"Gülşəni-Mahmud"***
*Astani-Qüdsi-Rizəvi Kitabxanası.*
*Britaniya Muzeyi Kitabxanası.*
*Məlik Milli Kitabxanası.*
*Tehran Milli Kitabxanası.*
*Hacı Hüseynağa Naxçıvaninin Kitabxanası.*
*AMEA Əlyazmalar İnstitutu M-262.*

***"Bəyanül-Mahmud"***
*Astani Qüdsi Rizəvi Kitabxanası 119, 120.*
*Məlik Milli Kitabxanası 3665.*
*Britaniya Muzeyi Kitabxanası 3077.*

***"Nüqli-məclis"***
*Britaniya Muzeyi Kitabxanası.*
*Məlik Milli Kitabxanası.*
*Tehran Milli Kitabxanası.*
*Hacı Hüseynağa Naxçıvaninin kolleksiyası.*




**Mahmud mirzə Qacar. Gülşəni-Mahmud**
**AMEA Əlyazmalar İnstitutu M-262**

# SULTAN MƏHƏMMƏD TAĞI

Seyfüddövlə Sultan Məhəmməd Tağı, Fətəli şah Qacarın yeddinci oğludur. O, h. 1224/1809-cu ildə dünyaya gəlmişdir. Atası onun təlim-tərbiyəsi ilə bağlı işləri Əmiri-Kəbir Hacı Məhəmməd Hüseyn xan Qacara tapşırmışdı. Fətəli şahın dövründə bəzi vaxtlar sarayda yaşamış, səfərlərdə hökmdarı müşayiət etmişdir. H. 1240/1824-25-ci ildə Fətəli şah İsfahan vilayətindəki iğtişaşları yatırdıqdan sonra Seyfüddövləni idarəçilik işlərini həyata keçirmək üçün orada qoymuş, Yusif xan Sipəhsaları bütün iraqlı nökərlər, bəzi mazandaranlı və astarabadlı canbazlarla birlikdə onun sərəncamına vermiş və bəxtiyari tayfasını ona tabe etmişdir. İsfahanda olduğu müddətdə quruculuq işləri aparmış, bağlar, imarətlər, təkyələr, hamamlar tikdirmişdir. Atasının ömrünün sonlarında o, Borucerd hakimi idi. Məhəmməd şahın hakimiyyətinin əvvəllərində onu Tehrana gətirmişdilər və oradan Azərbaycana göndərmişdilər[295].

Seyfüddövlə ***"Bəzmi-xaqan"*** ("Təzkirətüs-səlatin") başlıqlı təzkirəsini h. 1245/1829-cu ildə İsfahanda olarkən bir dostunun xahişindən sonra qələmə almışdır.

Təzkirə bir bəzm və beş əncüməndən ibrətdir. Təzkirənin "bəzm" adlanan bölümü 20 məclisə ayrılmışdır. Bu, əslində Şərəfəddin Rami (öl. h.795/1392-93) adlı şairin məhbubun vəsfinə həsr etdiyi "Ənisül-üşşaq" əsərinin eynidir. Fəqət bu əsəri təzkirəsinə daxil edən Seyfüddövlə özünü onun müəllifi kimi təqdim etmişdir.

60 nəfərin həyat və yaradıcılığını əhatə edən ***I əncümən*** "Əvvəlki sultanların və əski sultanzadələrin şeirlərindən bəziləri və onların əhvalının keyfiyyətindən bir qismi" adlanır. Burada ilk olaraq Səfəvi nəslinin mənsublarına (I Şah İsmayıl Xətai, I Şah Təhmasib, II Şah İsmayıl Adili, I Şah Abbas Mazi, II Şah Abbas Sani, Əlqas mirzə, Bəhram mirzə, İbrahim mirzə Cahi, Sam mirzə Sami,

---

[295] А.П.Берже. Фетх-Али-шах и его дети (исторический очерк) // "Русская старина", 1886, № 6, с. 555; Məani Ə.G. Tarixi-təzkirəhayi-farsi, I c., s. 97-98.

Sultan Məhəmməd mirzə, Sultan Mustafa mirzə, Müzəffər Hüseyn mirzə) yer verilmişdir. Daha sonra müxtəlif Gilan, Cığatay, Hind, Özbək, Osmanlı, Xarəzm, Səlcuq, Mazandaran və s. hökmdar şairlərindən bəhs edilmişdir. Burada həmçinin Azərbaycanın digər hökmdar şairlərinə (Sultan Üveys Cəlairi, Sultan Əhməd Cəlairi, Sultan Yaqub Ağqoyunlu) də yer ayrılmışdır.

***II əncümən*** "Əsrin padşahının (Fətəli şahın – V.M.) şeirlərinin zikri və onun halının və ləyaqətlərinin şərhindən bir müxtəsər" sərlövhəsi ilə başlamaqdadır.

***III əncümən*** "Şahzadələrin şeirləri və həyatları haqqında"dır. Burada Qacarlar xanədanından olan 23 şahzadə şairdən bəhs olunur.

***IV əncümən*** "Əmirzadələrin və ya onların nəvələrinin şeirləri və həyatları haqqında"dır. Bu əncümən Qacar şahzadələrinin övladlarına və onların nəslindən olan 10 şairə həsr edilmişdir.

***V əncümən*** isə "Müəllifin həyatının və şeirlərinin şərhi" adını daşıyır.

Təzkirənin Məclis nüsxəsinin surətini əldə etmişik. Təzkirə 183 səhifəlik əlyazma məcmuəsi daxilində yer almışdır və onun ilk 63 səhifəsini əhatə etməkdədir.

Bəzi azərbaycanlı şairlərin tərcümeyi-hallarından nümunələri təqdim edirik: "Xətai – məşhur adı I Şah İsmayıl Səfəvidir. Onun nəsəb-nəcabətinin şərhini yazmağa zərurət yoxdur. Tarix kitablarında onun haqqında yazılıbdır. Bu fərd onun düşüncəsinin nəticələrindəndir ki, burada qeyd edilir"[296]; "Cahi – ismi Sultan İbrahim mirzədir. Bəhram mirzə Səfəvinin oğludur. Nəzm, şeir və xətt fənnində atasını üstələmişdir. Divanı dörd min beytdir. Həmçinin türkcə qəzəllər və qəsidələr demişdir"[297]; "Sami – ismi Sam mirzədir. Şah İsmayıl Səfəvinin oğludur. Öz müasirlərinin şeirləri barəsində "Töhfeyi-Sami" adlı təzkirə yazmışdır. Bu şeir və rübai ondandır ki, öz şeirlər müntəxəbatında yazmışdır"[298] və s.

---

[296] Seyfüddövlə. "Bəzmi-xaqan". İran Məclis Kitabxanası 894, s. 30.
[297] Yenə orada, s. 31.
[298] Yenə orada, s. 31.

## ***Əlyazmaları***

*İran İslami Şura Məclisi Kitabxanası 894.*
*İran Milli Kitabxanası 1678.*
*Tehran Mərkəzi Kitabxanası 4605.*
*Sipəhsalar Kitabxanası 1121.*



**Seyfüddövlə Sultan Məhəmməd Tağı. “Bəzmi-xaqan”**
**İran Məclis Kitabxanası 894**

## BƏHMƏN MİRZƏ QACAR

Fətəli şah Qacarın nəvəsi, Naibüs-səltənə Abbas mirzənin dördüncü oğlu Bəhmən mirzənin h. 1225 / 1810-cu ildə anadan olduğu güman edilir. Bir müddət Ərdəbildə yaşamış, oranın hakimi olmuşdur. H. 1250/1834-cü ildə Məhəmməd şah tərəfindən Borucerd hakimi təyin olunmuş, h. 1257/1841-ci ildən 1263/1847-ci ilə kimi Cənubi Azərbaycanda hakimlik etmişdir. Lakin sədri-əzəm Hacı Mirzə Ağasının qərəzkarlığı nəticəsində onunla qardaşı Məhəmməd şah arasında narazılıq yaranmış, o hakimlikdən uzaqlaşdırılaraq Tehrana çağırılmış və burada təqiblərdən yaxa qurtarmaq üçün rus səfirliyinə sığınmaq məcburiyyətində qalmışdır. Ona Rusiya ərazisində yaşamağa icazə verildikdən sonra, 1848-ci ilin mayında Bakıya gəlmiş və buradan Tiflisə yollanmışdır. Rusiya təbəəliyini qəbul edən şahzadə 1851-ci ilin sonlarından etibarən Şuşa şəhərində yaşamış və hər il rus hökumətindən 9600 rubl məbləğində təqaüd almışdır. O, 11 fevral 1884-cü ildə Şuşada vəfat etmişdir.

Bəhmən mirzədən bəhs edən müəlliflər onun iki əsərini xatırlayırlar. Bunlardan birincisi "Təzkireyi-Məhəmmədşahi", ikincisi isə "Şükürnameyi-şahənşahi"dir[299].

Bəhmən mirzə Ərdəbil hakimi olarkən qardaşı Məhəmməd şahın xahişi ilə h. 1247/1831-ci ildə "Təzkireyi-Məhəmmədşahi" əsərini yazmışdır. Həmin zaman onun böyük qardaşı şahzadə Məhəmməd hələ şah deyildi. Təzkirə ***üç riştədən*** ibarət olub, əlifba prinsipi ilə hazırlanmışdır.

***Birinci hissə*** keçmiş dövr şairlərinə ayrılmışdır. Burada əlifba sırası ilə h. XII əsrin sonlarına qədər yaşamış 133 şairdən bəhs olunmuşdur. Bu riştə Əsədi ilə başlayıb, Yetimi ilə sona çatır.

***İkinci hissə*** xaqana (Fətəli şaha), şahzadələrə və adlı-sanlı əmirlərə həsr edilmişdir. Burada yaş həddi əsas götürülərək, 13

---

[299] Bax: Qacar B.M.Şükürnameyi-şahənşahi / Elmi red. S.Rəhimova.- B.: Şuşa, 1999.- 64 s.

şair haqqında məlumat verilmişdir. Bu riştənin ilk şairi Xaqan, son şairi isə Hacibdir.

***Üçüncü hissədə*** təzkirəçinin 56 nəfər müasiri əlifba sırası ilə xatırlanmışdır. Bu riştə Atabəyi-əzəm Mirzə Əbülqasım Qaimməqam ilə başlayır və Valeh ilə sona çatır[300].

İlk riştədəki azərbaycanlı şairlərdən Əbülüla Gəncəvi, Əvhədi Marağayi, Yolqulu bəy Ənisi, Lütfəli bəy Azər, Bəhram mirzə Səfəvi, Qasım bəy Haləti Türkman, Həsən xan Şamlu, Həqiri Təbrizi, Heydəri Təbrizi, Şah İsmayıl Xətai, Rağib Ərdəbili, Şərif Təbrizi, Səburi Təbrizi, Hacı Süleyman Səbahi Bəydili, Şah Təhmasib Səfəvi, Məhəmməd Əssar Təbrizi, Fəsihi Təbrizi, Həsən bəy Müqimi Türkman, Məruf Təbrizi, Hüseyn bəy Məlum Təbrizi, Şeyx Mahmud Şəbüstəri, Mehdi bəy Şəqaqi, Məhsəti Gəncəvi, Nizami Gəncəvinin adlarını çəkə bilərik.

İkinci riştədə adları çəkilən dövlət adamlarının əksəri Qacar xanədanından olan Azərbaycan türkləridirlər.

Üçüncü riştədə azərbaycanlı şairlər arasında Əşrəf Azərbaycani, Hüseynqulu xan Əfəndi Zəncani, Mirzə Məhəmməd Hüseyn Əsir Təbrizi, Mirzə Məhəmməd Rza Bəndə Təbrizi, Məhəmməd Əmin xan Bidil Bayat, Mirzə Tağı Salyani, Mirzə Xürrəm Azərbaycani, Fazil xan Ravi Gorusi, Mirzə Rza Təbrizi, Nəcəfqulu xan Təbrizi və s. Adlarına rast gəlirik.

Təzkirədə yer almış şairlərimizdən bəzilərinin tərcümeyi-hallarından nümunələrə nəzər salaq: “Əbülüla Gəncəvi – bilikli bir fazil və fərasətli bir müdrikdir. Ondan bir divan görülməmişdir”[301]; “Həqiri Təbrizi – o diyarın şairlərindəndir və bu dübeyt ondan yadigardır”[302]; “Səburi Təbrizi – cavahirat satmaqla məşğul olardı. Bu bir neçə beyt ondandır”[303]; “Şah Təhmasib Səfəvi – özündə gözəl xüsusiyyətləri cəmləşdirmişdi və bəyənilən kamala sahib idi.

---

[300] Bəhmən mirzə Qacar. Təzkireyi Məhəmmədşahi. Əlyazmalar İnstitutu, M-24.

[301] Bəhmən mirzə. Təzkireyi-Məhəmmədşahi. İran Məclis kitabxanası, s. 51.

[302] Yenə orada, s. 84.

[303] Yenə orada, s. 152.

Onun əhvalının təfsilatı tarix əsərlərində qeyd edilmişdir. Onun gövhər saçan kəlamından bu qitə və rübai qələmə alındı”[304]; “Müqimi – ismi Həsən bəydir və türkman tayfasından olmuşdur”; “Məruf – Təbriz əhlindəndir. Rəmmallıq peşəsinə də malik olmuşdur”[305]; “Məlum Təbrizi – adı Hüseyn bəydir. Əhvalı naməlumdur. Ondan bu fərd yazıldı”[306] və s.

F.e.n. T.Nurəliyeva Bəhmən mirzənin kolleksiyasından bəhs edərkən təzkirəsinin AMEA Əlyazmalar İnstitutundakı nüsxəsi haqqında məlumat verir və əhəmiyyətini vurğulayır: “…Əlyazma yalnız məşhur şair və ədiblər haqqında qısa məlumat vermək baxımından deyil, eyni zamanda Azərbaycan paleoqrafiyasının, rəssamlıq sənətinin, onun tarixinin öyrənilməsində böyük əhəmiyyət kəsb edir” [307].

Tədqiqatımız zamanı təzkirənin İran Məclis Kitabxanasında mühafizə olunan 903 saylı nüsxəni əldə etmişik.

Sonradan, h.1256/1840-41-ci ildə Bəhmən mirzə öz təzkirəsini dörd cild halına salaraq, daha da təkmilləşdirmiş, buraya bir çox şeir nümunələri əlavə etmişdir və əsəri ***“Təkmileyi-təzkireyi-Məhəmmədşahi”*** adlandırmışdır. O, bu işi Həmədanda başa çatdırmışdır. Həmin təkmilləşdirilmiş nüsxə Ustad Mahmud Fərrux Xorasaninin şəxsi kitabxanasına məxsus (N 67) olmuşdur.

***Əlyazmaları***

*İran Məclis Kitabxanası 902, 903.*
*İran Məlik Milli Kitabxanası 4317.*
*Tehran Universiteti Kitabxnaı 10-b.*
*İran Astani-Qüdsi-Rizəvi Kitabxanası.*
*AMEA Əlyazmalar İnstitutu M - 24.*
*AMEA Əlyazmalar İnstitutu C-1079.*

---

[304] Yenə orada, s. 158.
[305] Yenə orada, s. 357.
[306] Yenə orada, s. 357.
[307] Nurəliyeva T. Azərbaycan ədəbiyyatının tədqiqində əlyazma kolleksiyalarının əhəmiyyəti. Bakı, 1998, s. 80.



**Bəhmən mirzə. "Təzkireyi-Məhəmmədşahi"**
**İran Məclis Kitabxanası 903**



**Bəhmən mirzə. "Təzkireyi-Məhəmmədşahi"**
**AMEA Əlyazmalar İnstitutu C- 1079**

## MƏHƏMMƏD SALEH ŞAMLU

Məhəmməd Saleh Şamlu Azərbaycanın qızılbaş tayfalarından olan şamlu oymağına mənsub olsa da, Xorasanda anadan olmuşdur. H. 1252/1836-cı ildə öz müasirləri olmuş 177 şair haqqında Hindistanın Sind vilayətinin Heydərabad şəhərində "Məhəküşşüəra" adlı təzkirə qələmə almışdır. Təzkirənin yarımçıq qalmış dibaçəsində müəllif təlif səbəbi haqqında yazır ki, öz müasiri olan istedadlı şairlərin həyat və yaradıcılıqlarının səbatsız zəmanənin keşməkeşi içində itib-batmaması və unudulmaması üçün bu təzkirəni tərtib etmişdir.

Burada əvvəlcə Xaqan təxəllüslü Fətəli şah və onun oğulları, Qacarlar səltənətinin əmirləri xatırlanmış, daha sonra təzkirəçinin müasiri olan şairlərə yer verilmişdir. Lakin müəllif şairlərə qeyri-bərabər şəkildə yer vermiş, ayrıseçkilik etmişdir. Məsələn, müəllif özü kimi Hindistanda yaşayan Neyyəri Şirazi ilə dost olduğu üçün onun az qala bütün divanını öz təzkirəsinə daxil etmişdir. Əsərin sonunda müəllif özü haqqında məlumat verməyi planlaşdırsa da, buna macalı olmamış və əsər yarımçıq qalmışdır. Ə.G.Məani bu təzkirənin bir o qədər də əhəmiyyətli məlumatları əhatə etmədiyini yazır[308].

Əlyazma nüsxəsi Məlik Milli kitabxanasında 4096 şifrəsi ilə mühafizə olunur və ehtimal ki, bu, müəllifin öz əlyazmasıdır.

---

[308] Məani Ə.G. Tarixi-təzkirəhayi-farsi. II c., s. 169-171.

## HÜLAKU MİRZƏ QACAR

Fətəli şahın nəvəsi, Şücaüssəltənə Həsənəli mirzənin (h.1204-1283/m.1790-1866) böyük oğlu Hülaku mirzə Qacar poeziyada əvvəlcə "Eşq" və daha sonra "Xərab" təxəllüsü ilə tanınmışdır. Onun atası müxtəlif vaxtlarda Xorasanda, Yəzddə, Kirmanda hakimlik etmiş, digər dövlət vəzifələrini yerinə yetirmiş, əfqanlarla, türkmənlərlə, özbəklərlə və Xorasanın üsyankar xanları ilə mübarizə aparmışdır. Bütün bu fəaliyyəti ərzində böyük oğlu Hülaku mirzə onu müşayiət etmişdir. H. 1250/1834-cü ildə Fətəli şah vəfat etdikdən sonra bəzi şahzadələr hakimiyyət sevdasına düşdülər və iğtişaşlar törətdilər. Həmin vaxt Hülaku mirzənin atası Həsənəli mirzə Kirman hakimi idi. O, qiyam qaldıraraq İsfahana hücum etmiş, oğlu Hülaku mirzə isə Yəzd şəhərini ələ keçirmişdi. Lakin tezliklə Məhəmməd şah taxt-tacda yerini möhkəmlədərək, bu qiyamları yatırmağa nail oldu. Həsənəli mirzə dustaq edildi və gözləri kor edildikdən sonra Ərdəbil qalasında həbsə salındı. O, Nasirəddin şahın hakimiyyətinin əvvəlində azadlığa buraxılaraq Tehrana gəldi və h. 1270/1853-cü ildə vəfat etdi. Həsənəli mirzə "Şikəstə" təxəllüsü ilə şeirlər yazardı. Onun divanı Astani-Qüdsi-Rizəvi kitabxanasında 4680 şifrəsi ilə mühafizə edilir.

Atasının məğlubiyyətindən və Məhəmməd şahın rəsmən taxtda əyləşməsindən sonra Yəzddən Kirmana qayıdan Hülaku mirzə Həcc ziyarəti bəhanəsi ilə aradan çıxmağı qərara alır. O, ömrünün axırına kimi ərəb ölkələrini, Osmanlı dövlətinin ərazisini, Firəng (Avropa) diyarını gəzib-dolaşmaqla günlərini keçirir. H.1283 /1866-cı ildə Kazimeyndə öldüyü ehtimal edilir. Şikəstə xəttini gözəl yazdığı, naqqaşlıq və şairlik məharətinin olduğu bildirilir[309]. O, ədəbiyyatı və xəttatlıq sənətini ustadı Mirzə Əbdülvəhhab Mö-

---

[309] Məani Ə.G. Tarixi-təzkirehaye-farsi. I c, s. 482.

təmədüddövlə Nişat İsfahanidən (öl. h. 1244 / m. 1828-29) öyrənmişdi[310].

Hülaku mirzə h.1255-56/1839-40-cı illərdə ***“Xərabat”*** adlı ümumi xarakterli təzkirə qələmə almışdır. Burada fars, türk, ərəb, hind, özbək, əfqan və b. xalqlardan olan qədim və yeni şairlərin tərcümeyi-halları yer almışdır. Əsərdə əlifba ardıcıllığı ilə 172 nəfər keçmiş dövr şairləri və 337 nəfər müasir şair haqqında məlumat verilmişdir. Mühacirət həyatı yaşayan şahzadə təzkirənin hər səhifəsini müxtəlif şəhər, liman, ziyarətgah, ada və ya dənizlərdə yazmalı olur.

Təzkirənin dibaçəsində müəllif qürbət ellərdə könlünü məşğul etmək üçün keçmiş və müasir şairlərin bəyəndiyi şeirlərini toplayıb, onlar haqqında bir əsər yazmağı qərara aldığını bildirir. Dibaçənin sonunda o, əvvəllər “Eşq” təxəllüsü ilə yazdığını və dərbədər olub mühacir həyatına düşdüyü üçün təxəllüsünü “Xərab” ilə əvəz etdiyini göstərir.

Bu əsərdə Əvhədi Marağayi, Azər Bəydili, Saib Təbrizi, Üzri Bəydili, Qazızadə Ərdəbili, Şeyx Mahmud Şəbüstəri, Nəşə Təbrizi (Əbdürrəzzaq), Nəsrulla mirzə Əfşar, Nəsim Qacar, Hümam Təbrizi, Yəqini Xalxali kimi şairlərimiz keçmiş dövr şairləri sırasında, Aşüftə İrəvani (Hüseyn bəy), Əfsər Qacar (Məhəmməd Rza mirzə), Aşub İrəvani (Mirzə İsmayıl), İnsaf Qacar (Məlik İrəc mirzə), Bəndə Təbrizi (Mirzə Rəzi), Beyza Qacar (Allahverdi mirzə), Beyza Qacar (İmamqulu mirzə ibn Dövlətşah), Hisari Bəydili (Məhəmməd Sadıq xan), Hüseyn İrəvani (Məhəmməd Hüseyn), Hacib Qacar (Allahyar xan), Həşəmət Qacar (Hümayun mirzə), Xərab Qacar (Hülaku mirzə), Xaqan (Fətəli şah), Xosrovi (Məhəmmədqulu mirzə Mülkara), Xavər Qacar (Heydərqulu mirzə), Darayi-Qacar (Abdulla mirzə), Ravi Gorusi (Məhəmməd Fazil xan), Şapur Qacar (Şeyxəli mirzə), Şərər Bəydili (Hüseynəli bəy), Şikəstə Qacar (Həsənəli mirzə), Tuti Cavanşiri (Əbülfəth bəy), Adil Qacar (Əlişah Zillüssultan), İzzət Qacar (Süleyman xan), Fənayi Xoyi (Mirzə Əbdürrəsul), Qabil Qacar (Həsənəli xan İrəvani), Mirzə

[310] Həsənzadə T. Qacarlar dövrünün titulları. Bakı, 2011, s. 200.

Məhəmməd Kuzəkonani Təbrizi, Mehdi bəy Şəqaqi, Mərrix Qacar (Məhəmməd Bağır xan), Mənsur Sərabi (Mirzə Rza), Məsrur Qacar (Hüseynqulu xan), Məsrur Bəydili (Vəli Məhəmməd xan), Minayi-Əfşar Urumi (Fəridun), Mahmud mirzə Qacar, Münsif Qacar (Məhəmməd Zaman xan), Məzhər Qacar (Mehdiqulu bəy), Nəsrulla mirzə Qacar, Nəsrulla xan Qaragözlü, Nüsrət Talışi (Sultan Hüseyn bəy), Naqis Təbrizi (Mirzə Mehdi), Hümayun mirzə Qacar kimi şairlərimiz isə müasir şairlər arasında yer almışdır. Müəllif farsca yazan şairlərlə yanaşı, türkcə və ərəbcə yazan şairlərə də yer vermişdir. Belə ki, keçmiş şairlər fəslində türkcə yazan şairlərdən Zehni Osmanlı, Ruhi Osmanlı, Qalib Əfəndi Osmanlı, məşhur şairimiz Füzulinin oğlu Fəzləli və Əmir Əlişir Nəvai, müasir şairlər fəslində isə İbrahim Əfəndi, Bağdad vəziri Əlirza paşa, Pərtöv paşa, Raşid Əfəndi, Kamal Əfəndi Osmanlı və Nədim Bağdadi (Mahmud bəy) xatırlanmışlar[311].

Sonradan Hülaku mirzə "Xərabat" təzkirəsinin müasir şairlər hissəsindən ibarət ***"Xərab"*** adlı başqa bir təzkirə də tərtib etmişdir. Onun əlyazma nüsxəsi Paris Milli Kitabxanasında 1160 şifrəsi ilə qorunur və Dr. Xəyyampur tərəfindən nəşr edilmişdir.

T.Həsənzadənin verdiyi məlumata görə, əvvəllər Eşq təxəllüsü ilə şeirlər yazmış Hülaku mirzənin öz təxəllüsünü dəyişməsi onun İrandan Beynülnəhreynə (İraqa) mühacirət etdiyi zaman baş vermişdir. Belə ki, o, Kərbəlada Şeyxiyyə təriqətinin banisi Şeyx Əhməd Ehsaninin şagirdi Hacı Seyid Kazım Rəşti ilə görüşmüş, seyid ona təxəllüsünü dəyişməyi məsləhət bilmiş və ona Xərab təxəllüsünü vermişdir[312].

[311] Məani Ə.G. Tarixi-təzkirəhayi-farsi. I c., s. 482-512.
[312] Həsənzadə T. Qacarlar dövrünün titulları. Bakı, 2011, s. 200.

***Əlyazmaları***

***"Xərabat"***
*İran İslami Şura Məclisinin kitabxanası 13888.*
*İran İslami Şura Məclisinin kitabxanası 922.*

***"Xərab"***
*Tehran Universiteti Mərkəzi kitabxanası 508.*
*İran Məlik Milli kitabxanası 246.*
*Ə.G.Məaninin şəxsi kitabxanası.*
*Paris Milli kitabxanası 1160.*

# XUDAVERDİ XAN QACAR

İran İslami Şura Məclisinin kitabxanasından Qacarlar nəslinin digər bir nümayəndəsinin tərtib etdiyi ***"Təzkireyi- mədayihi-Elxaniyyə"*** adlı daha bir təzkirə nüsxəsini aşkarlamışıq. Qeyd edək ki, farsca təzkirələrə dair iki cildlik əsər yazmış Ə.G.Məani bu təzkirə haqqında məlumat verməmişdir. Sözügedən əsərin müəllifi Ədəb poetik təxəllüsü ilə tanınan Xudaverdi ibn Məhəmməd İbrahim xan Qacardır[313]. Onun atası Məhəmməd İbrahim xan, Fətəli şahın əmisi olan Məhəmməd Həsən xanın nəvəsi və Mehdiqulu xanın oğludur[314].

"Təzkireyi-mədayihi-Elxaniyyə" Qacarlar dövrünün ortalarında yaşayıb-yaratmış 37 şairin qısa şərhi-hallarını, əsərlərindən və şeirlərindən nümunələri əhatə edir. Bu şairlərdən bəzilərinin adlarına həmin dövrün digər məşhur təzkirələrində, məsələn, Rzaqulu xan Hidayətin "Məcməül-füsəha"sında rast gəlmirik. Bu əsər ilk növbədə şairlərin təzkirəçinin oğlu olan və Kamal təxəllüsü ilə şeirlər yazan Allahqulu mirzə Elxaninin mədhində dedikləri şeirləri toplamaq məqsədi ilə yazılmış və əsərin adı da bu səbəbdən "Təzkireyi-mədaihi-Elxaniyyə" qoyulmuşdur. Təzkirədə ən çox Məşriq və Rizvan təxəllüslü şairlərin şeirlərindən örnəklər verilmişdir. Dibaçədə qeyd edildiyi kimi, əsər 28 zilhiccə 1256-cı ildə (20.02.1841) yazılmağa başlanmışdır[315]. İstifadə etdiyimiz nüsxə 149 səhifədən ibarətdir və 1298-ci ilin zilhiccə ayında (25.10-22.11.1881) köçürülüb tamamlanmışdır. Burada təxminən üç min beyt yer almışdır.

Təzkirədə Ədəb (Xudaverdi Qacar), Rizvan (Sam mirzə Qacar), Süleyman xan Qacar, Əli Rza mirzə Qacar, Münşi Mirzə

---

313 Ədəb Qacar. Təzkireyi-mədaihi-Elxaniyyə. Məclis k/x, No. 8588.
314 Bax: Берже А.П. Фетх-Али-шах и его дети (исторический очерк) // "Русская старина", 1886, № 6, с.559.
315 Təzkireyi-mədayihi-Elxaniyyə, s.1.

Abdulla Xələc və b. kimi Azərbaycan türk əsilli şairlər də yer almışdır. Təzkirənin tərtibində vahid bir prinsip gözlənilməmişdir.




**“Təzkireyi-mədayihi-Elxaniyyə”**
**İran Məclis Kitabxanası**

# MƏHƏMMƏD BAĞIR XAN QACAR

Məhəmməd Bağır xan Qacar Fətəli şah Qacarın qardaşı Hüseynqulu xanın oğludur. Mərrix təxəllüsü ilə şeirlər yazmışdır. H.XIII/m.XIX əsrin birinci yarısına aid ***"Fələkül-Mərrix"*** adlı təzkirəsi vardır[316]. Ağa Seyid Məhəmməd Mühit Təbatəbayi "Ərməğan" jurnalının 12 buraxılış ilinin 8-ci sayında çap olunmuş şair Seyid Hüseyn Məcmər Zəvareyi haqqında məqaləsində Məhəmməd Bağır xan Qacarın "Fələkül-Mərrix" təzkirəsinə istinad edərək bu məlumatı vermişdir: "Məhəmməd Bağır xan Mərrix "Fələkül-Mərrix" təzkirəsində belə nəql edir: "Şairlikdə o mərtəbəyə çatmışdı ki, fəsahətdə Məliküşşüəradan başqa digər bəlağət sahiblərindən önə çıxmışdı. Lakin təbinin tərəqqisi vaxtında o biri dünyaya köçdü". Ə.G.Məani çox axtarsa da, bu əsəri tapa bilmədiyini qeyd edir.

Hülaku mirzə Qacar "Xərabat" təzkirəsində Məhəmməd Bağır xan haqqında belə yazır: "Mərrix Qacar – şərəfli ismi Sərkar Məhəmməd Bağır xandır. O, Həzrət Sahibqiranın (Fətəli şahın – V.M.) atabir, anabir doğma qardaşının oğludur. Çox zərif və yaxşı xislətlidir. Ləyaqətli adamdır və divan sahibidir".

Məhəmməd Bağır xan Qacarın həyat və yaradıcılığı haqqında sadəcə bu məlumatları əldə edə bilmişik.

---

[316] Məani Ə.G. Tarixi-təzkirəhayi-farsi. II c., s. 26-27.

## MƏHƏMMƏD HƏSƏN XAN ETİMAÜSSƏLTƏNƏ

Marağalı Məhəmməd Həsən xan Etimadüssəltənə 1843-cü ildə Tehranda anadan olmuşdur. Ana tərəfdən Ağa Məhəmməd şah Qacarın qardaşı Mustafaqulu xanın nəvəsidir. Atası Əli xan Müqəddəmdir. Doqquz yaşında ikən piyada qoşunlar komandanı Əziz xanın yanında qulluq etməyə başlamışdır. 1863-1867-ci illərdə Parisdə İranın səlahiyyətli səfirinin müavini olmuşdur. Tehrana qayıtdıqdan sonra Nəsrəddin şahın şəxsi mütərcimi və köməkçisi təyin edilmişdir. 1871-ci ildə Nəsrəddin şah Tehranda aparılan bir sıra islahatlarla əlaqədar bütün tərcümə işlərini və kitab nəşrini bir yerdə mərkəzləşdirmək barədə sərəncam vermişdir. Şah eyni vaxtda Məhəmmədhəsən xana Səniüddövlə titulu verərək, nəşriyyat və tərcümə idarəsinin rəisi təyin etmişdir. Məhəmməd Həsən xan 1896-cı ildə düşmənləri tərəfindən zəhərlənərək öldürülmüşdür[317].

Onun "Xeyrati-hesan" adlı əsəri XIX əsrin məşhur türk ədibi Məhəmməd Zehni Əfəndinin "Məşahirün-nisa" əsərinin türk dilindən farscaya tərcüməsidir. "Xeyrati-hesan" 1886-1888-ci illərdə üç cilddə nəşr olunmuşdur. Əsər əlifba prinsipi əsasında tərtib olunmuşdur. Birinci cild "əlif" hərfindən "re" hərfinə qədər, ikinci cild "ze" hərfindən "fe" hərfinə qədər, üçüncü cild isə "fe" hərfindən "vav" hərfinə qədər əhatə edir.

Məhəmməd Həsən xan Lütfəli bəy Azərin "Atəşkədə", Mahmud mirzə Qacarın "Nüqli-məclis" əsərlərindən buraya əlavələr edərək, azərbaycanlı qadınlar haqqında da məlumat vermişdir. Azərbaycanlı qadınlar arasında Ağabacı xanım, Pərixan xanım, Bağdad xatun və b. adlarına rast gəlmək olar.

Müəllif əsər boyu istinad etdiyi mənbələrin adını qeyd etməkdən çəkinməmişdir. Məsələn, Fətəli şahın qızı Teyyibədən

[317] Həsənzadə T. Marağalı Məhəmmədhəsən xan Etimadüssəltənənin əsərlərində Azərbaycan tarixi məsələləri. Bakı: Tural-Ə, 2001, 26-27.

bəhs edərkən yazır: "Nüqli-məclis" təzkirəsinin müəllifi mərhum Mahmud mirzə yazır..."[318]

Müəllif əsərin birinci cildi çap olunduqdan sonra onun bir nüsxəsini Məhəmməd Zehni Əfəndiyə göndərmiş və öz tərcümeyi-halını yazmağı xahiş etmişdir. Zehni əfəndi bu xahişə əməl edərək, ona bir məktub göndərmişdir. Həmin məktub "Xeyrati-hesan"ın ikinci cildində türk və fars dillərində nəşr edilmişdir[319].

Ə.G.Məani Etimadüssəltənin əsərinin Mirzə Məhəmməd Məlikülküttab Şirazi tərəfindən oğurlanması və "Təzkirətül-xəvatin" adı ilə Bombeydə çap olunması məsələsi üzərində də durmuşdur[320].

T.e.d. T. Həsənzadə "Xeyrati-hesan"dakı 159 nəfər azərbaycanlı-türk qadın şairləri haqqında məlumatı fars dilindən tərcümə edərək nəşr etdirmişdir[321].

"Xeyrati-hesan"da yer almış Ağabacı adlı şairənin bioqrafiyasına nəzər salaq: "Mərhum Fətəli şah Xaqanın möhtərəm zövcələrindən olub, mərhum şuşalı İbrahim xan Cavanşirin qızıdır. Xaqanın hərəmxanasında son dərəcə hörmət və izzətə malik idi. Bu qadın Həzərəti-Xaqanın hərəmxanasına zəngin, zinətli və alicənab bir qadın kimi daxil olduğundan hamı ona kamali-ədəblə yanaşırdılar. O, Qarabağdan özü ilə bərabər 200-dən artıq xadimə və nökər gətirmişdi ki, onların da hamısı məşhur, igid və cəsur adamlar idilər...

Qum və buraya tabe olan yerlərin gəliri, soyurqal kimi, Qumda iqamət edən Ağabacıya çatırdı. Özünün övladı olmadığından şahzadələrdən Keykavus mirzə ona oğulluğa və

---

318 Marağalı Məhəmmədhəsən xan Etimadüssəltənə. Xeyrati-hesan (Gözəllər sərvəti) / fars dilindən tərcümə edən, ön sözün müəllifi T.Həsənzadə. Bakı: Nurlan, 2003, s. 78.

319 Yenə orada, s. 5.

320 Məani Ə.G. Tarixi-təzkirehayi-farsi. c. I, s. 611.

321 Marağalı Məhəmmədhəsən xan Etimadüssəltənə. Xeyrati-hesan (Gözəllər sərvəti). Bakı, 2003, 103 s.

Mürəssə xanım qızlığa verildilər...Ağabacı ağıllı və şair təbiətli idi, nəzm və nəsrdə məharətli idi[322].

[322] Yenə orada, s. 10.

# HEYDƏRQULU MİRZƏ

Heydərqulu mirzə Fətəli şah Qacarın 15-ci oğludur. Atasının zamanında Gülpayəgan hakimi olmuş, daha sonra isə hakimlikdən azad edilmiş və Tehrana çağırılmışdır[323]. Divanının əlyazma nüsxəsi Astani-Qüdsi-Rizəvi kitabxanasında 414 şifrəsi ilə saxlanır.

Onun ***"Təzkireyi-Xavər"*** əsəri təzkirə adını daşısa da, əslində qədim və yeni şairlərin şeirlərindən ibarət müntəxəbatıdır. Üç "bəxş"dən ibarətdir:

I qəsidələr;

II qəzəllər;

III rübailər.

Buradakı şeirlər qafiyə və rədifə görə əlifba ardıcıllığı ilə sıralanmışlar. Bu məcmuə şairlərin bir-birlərini yamsılamaq və təqlid etmək üçün söylədikləri şeirlərdən ibarətdir. Əlyazması Məlik kitabxanasında 4300 şifrəsi ilə mühafizə olunur[324].

---

[323] Берже А.П. Фетх-Али-шах и его дети (исторический очерк) // «Русская старина», 1886, № 6, с.556.
[324] Məani Ə.G. Tarixi-təzkirəhayi-farsi. I c., s. 219-220.

## MƏHƏMMƏDQULU MİRZƏ QACAR

Fətəli şahın üçüncü oğlu Məhəmmədqulu Mirzə Qacar 22 ramazan 1203/1788-89-cu ildə anadan olmuş, bir məlumata görə, 1260/1844-cü ildə, digər bir məlumata görə isə, h. 1289 / m. 1872-ci ildə vəfat etmişdir. Poetik təxəllüsü Xosrovi, ləqəbi Mülkaradır. Atasının hakimiyyəti dövründə Mazandaranda hakimlik etmiş, Fətəli şahın ölümündən sonra isə Həmədana sürgün edilərək orada yaşamışdır. Poetik təxəllüsü “Xosrovi”, ləqəbi isə “Mülkara”dır.

Məhəmmədqulu mirzə ***“Təzkireyi-Xosrovi”*** ümumi xarakterli əsər qələmə almışdır. Burada həm qədim, həm də yeni dövrün şairləri haqqında məlumat öz əksini tapmışdır.

Qardaşı Mahmud mirzə “Gülşəni-Mahmud” əsərində onun dörd min beytlik divanından və təzkirəsindən bəhs etmiş, onun təzkirəsinin Lütfəli bəy Azərin “Atəşkədə”sindən üstün olduğunu iddia etmişdir[325].

[325] Берже А.П. Фетх-Али-шах и его дети (исторический очерк) // «Русская старина», 1886, № 6, с.554; Məani Ə.G. Tarixi-təzkirəhayi-farsi. Ic., s. 221-223; Həsənzadə T. Qacarlar dövrünün titulları. Bakı, 2011, s. 223-225.

# SEYİD ƏZİM ŞİRVANİ

XIX əsr Azərbaycan ədəbiyyatında klassik poeziya ənənələrini davam etdirən ən qüdrətli sənətkarlardan biri Seyid Əzim Şirvanidir. Milli poeziyamızın inkişaf tarixində o, lirik, cəmiyyətin sosial bəlalarını cəsarətlə tənqid edən satirik, əxlaqi-tərbiyəvi mənzum hekayələr və təmsillər müəllifi və təzkirəçi kimi məşhurlaşmışdır.

Seyid Əzim Şirvani 1835-ci ildə Şamaxıda ruhani ailəsində anadan olmuşdur. Yeddi yaşında atasını itirdikdən sonra ana babası ilə Dağıstana gedir. 1853-cü ildə isə anası ilə birlikdə Şamaxıya qayıdır. Ali ruhani təhsilini Nəcəf (1856), Bağdad və Şam şəhərlərində almışdır. Uzun müddət vətəndən uzaqlarda yaşayan Seyid Əzim XIX əsrin əllinci illərinin sonlarında Şamaxıya qayıtmış və məktəbdarlıq işinə başlamışdır. 1869-cu ildə Şamaxıda yeni üsullu məktəb açıb, pedaqoji fəaliyyətə başlamışdır. Seyid Əzim Şirvani 1888-ci ildə Şamaxıda dünyasını dəyişmişdir.

Bədii yaradıcılığa XIX əsrin 50-ci illərində başlayan S.Ə.Şirvaninin zəngin ədəbi irsi qalmışdır. Buraya lirik şeirlər, satiralar, əxlaqi-didaktik əsərlər, bədii nəsr nümunələri və təzkirəsi daxildir. Onun əxlaqi-didaktik əsərləri 1877-ci ildə tamamladığı “Rəbiül-ətfal”kitabında toplanmışdır.

S.Ə.Şirvani “Əkinçi”, “Ziya”, “Kəşkül” qəzetlərində tez-tez çıxış etmişdir. “Beytüs-səfa” ədəbi məclisinin təşkilatçısı və rəhbəri olmuşdur.

S.Ə.Şirvani Yaxın Şərqin Bağdad, Qahirə, İsfahan, Məkkə, Təbriz, Ərdəbil kimi böyük şəhərlərində olan şair bu yerlərin ədəbi-mədəni həyatı ilə maraqlanır, o dövrün bir sıra tanınmış alim və şairləri ilə görüşüb, onların məclislərində iştirak etmişdir[326].

Şair ilk şeirlərini Məhəmməd Füzulinin ədəbi təsiri ilə yazmışdır. Onun poetik irsinin çox hissəsi lirik əsərlərdən ibarətdir.

[326] Azərbaycan ədəbiyyatı tarixi. IV c., Bakı, 2011, s. 543.

Azərbaycan və fars dillərində yazılmış bu əsərlərin mövzuları müxtəlifdir. O, həm də satirik şair kimi məşhurlaşmışdır.

Seyid Əzim Şirvaninin ən önəmli əsərlərindən biri "Təzkirə"sidir. S.Rüstəmov təzkirənin uzun illər ərzində tərtib olunduğunu, müqəddimədəki "1300"-cü il tarixinin (1882-1883) isə təzkirənin tamamlandığı tarix olduğunu, işin başlanğıcının şairin gənclik illərinə təsadüf etdiyini qeyd edir[327]. Tədqiqatçı Seyid Əzimin təzkirənin tərtibi ilə 25-30 yaşlarından məşğul olduğunu yazır.

Ö.Bayram isə əsərin 1875-ci ildə yazılmağa başlanıldığını və təqribən 1885-ci ildə tamamlandığını yazır: "Seyyid Azim Şirvânî, tezkireyi yazmaya başladığı zaman kaç yaşında olduğunu "Tâ bu günlerde kim sâl-i 'ömrüm ķırha yetdi ve gülistân-ı hatırımdan tab u teravet gitdi" sözleriyle ifade eder"[328].

Seyid Əzim təzkirəsinin dibaçəsində "Təzkirənin tərtib edildiyi il" başlığı altında əsərin tamamlanma tarixi verilmişdir:

Min üç yüzdə sali-hicrətdən,
Bunu cəm eylədim qənimətdən...
Gərçi hər şüğlə pay peydadır,
Buna "tarixi-şüğl" bipadır.
Şüğldən saqit eyləsən lami,
Oldu tarixi-salın əyyami[329].

"Təzkirə" dibaçə, təvəqqeyi-müəllif, müqəddimə və dörd fəsildən ibarətdir. Əsərin dibaçəsini aşağıdakı misralarla başlayır:

Bu təzkirə kim, məcməi-şeiri-şüəradır,
Hər səfhəsi gülzar kimi ruhfəzadır.
Qoymaz yerə əldən onu şövq əhli görəndə,
Kim, canə fərəh, çeşmə ziya, qəlbə şəfadır[330] .

---

[327] Seyid Əzim Şirvani. Təzkirə. Bakı, 1974, s. 460.
[328] Bayram Ö. Azerbaycan sahası tezkireleri ve Seyid Azim Şirvaninin tezkiresi. Gazi Üniversitesi, yayımlanmamış doktora tezi. Ankara, 2005, s. 7.
[329] Seyid Əzim Şirvani. Təzkirə. Bakı, 1974, s. 11.

Seyid Əzim təzkirəsinin yazılma səbəbini də izah edir: "Və çün məcmui-əşari-tərəbişarı zəbt etmək və təmamiyi-əbyati-şəfisbatə rəbt yetirmək qüvveyi-hafizəyə mütəəssir və mütəxəyyilə taqətinə mütəəzzir idi, iradəm bu oldu ki, bir məcmuə əbyati-şüəradan və bir müxtəsər məqalati-ürəfadən tərkib qılam ki, həm mütaliəsinə əhli-zövq mail və həm zikri-xeyrdən ötrü bəndeyi-həqirə yadigar hasil ola"[331].

Nə gözəldir oxuyub əşarı,
Zövqi-ürfanə xəbərdar olasan.
Hər güruhun görəsən şeri-tərin,
Dəhrdə vaqifi-əsrar olasan.

Təzkirəçi əsərinin strukturunu belə açıqlayır: "Bu məcmuə dörd fəsil üzrə, hər fəsil üç bürc otuz dərəcə üzrə bəyan olunmuşdur.

Fəsli-əvvəl: Şüərayi-Qafqaz bəyanındadır.
Fəsli-dövvüm: Şüərayi-Azərbaycan bəyanındadır.
Fəsli-səyyüm: Şüərayi-Rum bəyanındadır.
Fəsli-çəharüm: Şüərayi-Türküstan bəyanındadır" [332].

S.Rüstəmov Seyid Əzimin təzkirəsində qeyd etdiyi struktura əməl etmədiyini yazır: "Təzkirənin müqəddiməsindən anlaşılır ki, müəllif birinci növbədə Qafqaz şairləri, ikinci Azərbaycan şairləri, üçüncü Türküstan şairləri, dördüncü Rum şairlərini təsnif etməli idi...Bu fəsillərin içində, bölgülərin əksinə Kirman, Xorasan, Hind, İsfahan, Nişapur və Şiraz şairlərinin əsərlərinə də rast gəlirik. Şirvan şairlərinin bəzisi kitabın əvvəlində, bəzisi ortasında, bəzisi isə

---

[330] Yenə orada, s. 7.
[331] Yenə orada, s. 8.
[332] Seyid Əzim Şirvani. Seçilmiş əsərləri. III c., Bakı: 1974, s. 448.

sonunda verilmişdir. Rum şairlərinə aid olan bölmə əvvəlki bölmələrə nisbətən daha səliqəlidir"[333].

Müəllif təzkirəsinin müqəddiməsində və ya sonrakı fəsillərində əsərin adı ilə bağlı heç bir fikir açıqlamamışdır. Təzkirə 270-ə yaxın şairin həyat və yaradıcılığını əhatə edir.

Seyid Əzim Şirvani təzkirəsinin müqəddiməsində şair və şeirə münasibət haqqında məlumat vermişdir. Təzkirəçi fikirlərini ayə və hədislərlə isbatlamağa çalışmışdır.

Seyid Əzim təzkirəsini Nəsrəddin şaha ithaf etdiyini ön sözdə qeyd edir: "Çünki bu məcmueyi-ziba və müxtərieyi-şiyvayə sultani-adil və bazil, kəhfül-füqəra və məlazül-ğübəra və müinüzzüəfa, nasiri-dini-xuda, əs-sultan ibn-əs-sultan vəl-xaqan ibn-əl-xaqan, şahənşahi-müəzzəm, maliki-riqabi-üməm, Nəsrəddin ğazi (lazalə nüsrətəhu və dəvamə-dövlətəhu) və sultani-adilin və bazilin əhdi-məymun və zəmani-hümayununda şuru olmuşdur…

Fəlihaza, o zillüllahın mədhü səna və dualarına ixlas və iradət ilə iqdam olundu"[334]. Dibaçədə daha sonra "Müəllifin nəsəbnaməsi və təzkirənin tərtib edildiyi il" başlığı altında təzkirəçi özü və təzkirəsinin yazılma tarixi haqqında məlumat verir.

Təzkirənin müqəddiməsi klassik təzkirələrin ön sözünü xatırladır. Burada şeir haqqında məlumat verilmiş, ilk şeir söyləyənin Həzrəti Adəm olduğu qeyd edilmişdir. Əsərin müqəddiməsində çox sayda "Quran" ayələrinə rast gəlmək mümkündür.

Seyid Əzim Şirvani təzkirəsini tərtib edərkən, ondan əvvəl yazılmış təzkirələrdən, tarix kitablarından və təsəvvüfi əsərlərdən faydalanmışdır. Ö.Bayram təzkirənin mənbələrini yazılı və şifahi qaynaqlar olmaqla iki qismə ayırmışdır. Bunların arasında Dövlətşah Səmərqəndinin "Təzkirətüş-şüəra"sının və Lütfəli bəy Azərin "Atəşkədə"sinin adlarını çəkmək olar. Əsər boyu bu təzkirələrə istinad edilmişdir.

---

[333] Seyid Əzim Şirvani. Seçilmiş əsərləri. III c., Bakı: 1974, s. 456.
[334] Yenə orada, s. 8-9.

Təzkirənin tərtib işinə Seyid Əzim gənclik illərində - Şərqə səyahət etdiyi zamanlarda başlamış, oradakı şeirlərin bir qismini müəlliflərinin özlərindən almışdır[335].

Seyid Əzim şairlərin təvəllüd və vəfat tarixlərini verməyə çalışmışdır. Müəllif təzkirədə adları çəkilən şairlərin hamısının həyat və yaradıcılığı haqqında məlumat verməmiş, şeirlərindən nümunə verməklə kifayətlənmişdir. Təzkirədə yer alan şeirlərdən nümunələrə gəlincə, bunların sayı 2 ilə 120 beyt arasında dəyişməkdədir.

Təzkirədə şairlər bir-biri ilə müqayisə edilmiş, kimin daha qabiliyyətli olduğu vurğulanmışdır. Ö.Bayram bu təzkirədəki şairlərarası müqayisə və eyniləşdirmədən bəhs edərkən önəmli və iddialı müqayisələrin aparıldığını qeyd edir: "Seyyid Azim Şirvânî tezkiresinde, şâir ve eser ile ilgili yaptığı değerlendirmelerde en başarılı sayılabileceği kısımlardan biri şâirler arası mukayese konusudur. Tezkirede pek çok şâir, değişik yönleriyle diğer şâirlerle karşılaştırılır. Üstün olan veya geride olan söylenir. Bazen de bir şâirin diğerinden geri kalmadığı vurgulanır"[336].

Ö.Bayram təzkirə üzərində apardığı araşdırmaların nəticəsi olaraq yazır: *"Seyyid Azim Şirvânî de şiir eleştirisi konusunda isabetli fikirler ortaya koyabilen bir tezkire yazarıdır. Seyyid Azim'in şiirin niteliği ile ilgili değerlendirmeleri, Anadolu sahası tezkireleri ile mukayese edildiğinde sayıca az olsa da yaptığı değerlendirmeler ve şâirlerin birbirleriyle mukayesesi, onun bu konuda yetkin bir kişi olduğunu göstermektedir"*[337].

Seyid Əzim Şirvaninin təzkirəsi AMEA Əlyazmalar İnstitutunda mühafizə olunmaqdadır. Təzkirə Əlyazmalar İnstitutunun fonduna daxil olarkən son dərəcə pərakəndə şəkildə olmuşdur. Təzkirəni nəşrə hazırlayan mərhum S.Rüstəmov qeyd edir ki, təzkirənin pərakəndə vərəqləri f.e.d. S.Hüseynov tərəfindən tutuşdurularaq nömrələnmiş, bəzi vərəqlər tapılmadığı üçün əlyazmanı ol-

---

[335] Azərbaycan ədəbiyyatı tarixi. IV c., Bakı, 2011, s. 569.

[336] Bayram Ö. Azerbaycan sahası tezkireleri ve Seyid Azim Şirvaninin tezkiresi. Gazi Üniversitesi, yayımlanmamış doktora tezi. Ankara, 2005, LXXXVI.

[337] Yenə orada, s. LXXXII

duğu kimi bərpa etmək mümkün olmamışdır. Yəni təzkirəni şairin müqəddimədə göstərdiyi quruluşda bərpa etmək üçün əsəri yenidən tərtibə salmaq lazım gəlmişdir[338].

Seyid əzim Şirvaninin qələmə aldığı bu təzkirə daha geniş coğrafiyanın şairlərini əhatə etməsi baxımından Şərq ədəbiyyatının mühüm qaynaqlarından hesab olunur.

## *Əlyazmaları*

*AMEA Əlyazmalar İnstitutu Arx.5, Q - 3 (29)*



**Seyid Əzim Şirvani**

[338] Seyid Əzim Şirvani. Seçilmiş əsərləri. III c., Bakı: 1974, s. 452.

# MƏHƏMMƏD KAZIM ƏSRAR ƏLİŞAH TƏBRİZİ

Məhəmməd Kazım Əsrar Əlişah Təbrizi XIX əsr Azərbaycan təzkirəçilərindəndir. "Behcətüş-şüəra"* adlı təzkirənin müəllifidir. Bu təzkirəçi haqqında məlumatı "Danişməndani-Azərbaycan" təzkirəsindən alırıq. Əsrar təxəllüslü Əlişah Təbrizi Şah Nemətulla təriqətinə bağlı olan dərvişlərdəndir. O, h.1265/1848-ci ildə anadan olmuşdur. İyirmi beş min beytdən ibarət divanı vardır[339]. M.Tərbiyət Əsrarın iki kitab təlif etdiyini, orada h. XIII / m. XIX əsr Azərbaycan söz ustalarının və növhə yazan şairlərin şeirlərini, eləcə də divanlarında daha çox türk dilində və nadir hallarda fars dilində şeir, qəzəl və rübailər olan şairlərin tərcümeyi-halını topladığını qeyd edir.

"Behcətüş-şüəra" təzkirəsi haqqında daha ətraflı məlumat Ə.G.Məaninin "Farsca təzkirələrin tarixi" əsərində verilmişdir. "Behcətüş-şüəra" h. 1294-99 / m. 1877-82-ci illərdə yazılmışdır. ***Əlifba sırası*** ilə 86 azərbaycanlı şairdən bəhs edir. Nəsri farsca olmasına baxmayaraq, poeziya nümunələrinin çox hissəsi ***türkcə***, yalnız cüzi bir qismi farscadır. Burada bəhs olunan Azərbaycan şairləri öz hazırcavablıqları və şux təbli olmaları ilə tanınan şairlərdirlər. Bu təzkirənin hazırlanmasından sonra müəllif oradakı şeirlərdən nümunələr seçərək, bunları ***"Hədiqətüş-şüəra"*** adlandırdığı bir müntəxəbatda toplamışdır. R.Y.Təbrizi təzkirənin əlyazmasının Təbriz Milli Kitabxanasında mühafizə olunduğunu yazır[340].

***"Behcətüş-şüəra"***nın bir nüsxəsi Ə.G.Məaninin dostu Cəfər Sultan əl-Qürrayinin şəxsi kolleksiyasına məxsus olmuşdur. Əl-

---

*Təzkirənin adı "Danişməndani-Azərbaycan" təzkirəsinin Azərbaycan dilinə tərcüməsində (1987-ci il nəşri) yanlış olaraq "Ləhcətüş-şüəra" şəklində təqdim olunmuşdur (Bax: s. 133).

[339] Məhəmmədəli Tərbiyət. Danişməndani-Azərbaycan. Bakı, 1987, s. 132.

[340] Təbrizi R.Y. XIX əsrdə Cənubi Azərbaycanda ictimai-ədəbi həyat və Əsrar Əlişah Təbrizi // Humanitar elmlərin öyrənilməsinin müasir problemləri, 2011/1, s. 122-125.

yazma h.1299/1881-ci ildə Tehranda köçürülüb tamamlanmışdır. Katibi Həsən Hüseynidir. Əlyazmanın həcmi 101 vərəqdən ibarət olub, qəhvəyi rəngli dəri cildə salınmışdır. Təzkirənin sonunda şairlərin fehristi təqdim edilmişdir.

Müəllif təzkirənin təlif səbəbini bu şəkildə açıqlayır: "Amma məxfi və örtülü qalmasın ki, bu mübarək vərəqləri yazan şəxs, yəni məskəni Təbriz, vətəni Qarcahan olan Əsrar deyir ki, duaçınız bir neçə il bundan əvvəl dostlardan birinin evində bir məcmuə gördüm. Rəhmətlik Məhəmməd şahın hakimiyyəti zamanında Mirzə Məhəmməd Əli Nədim tərəfindən qələmə alınmış bu kitabın adı "Yəxçaliyyə" idi. Diqqətli nəzərlə mülahizə etdikdən sonra deyə bilərik ki, həqiqətən də, o məcmuə "Atəşkədeyi-Azər"dən daha şirin bir kitabdır. Biz həmin fərəh bəxş edən məclisdə bu məcmuədən bir neçə nəfər şairin əhvalatını əylənmək üçün oxuduq. Bu söhbət əsnasında şairlərin kamalı və onların kəlamının məlahəti haqqında söz düşdükdə farsdillilərdən bir şəxs rişxənd etmək məqsədi ilə dedi:

- Nə olaydı ki, bu pak torpaqda yaşayan türklərin şairlərinin əhvalatı və şeirləri haqqında da bir məcmuə yazılaydı, ta biz bu uca silsilənin ali kamalatından xəbər tutaydıq.

O əzizin bədxahlığından və tənəsindən duaçınızın acığı tutdu... Alicənab böyüklərdən himmət istəyib, Azərbaycan şairlərinin əhvalı və onların şeirlərinin müntəxəbatı haqqında bu mübarək məcmuəni cəm edərək, ona "Behcətüş-şüəra və sərvəri-nüdəma" adını qoydum".

Təzkirədə yer almış şairlərimiz:

1) Atəşi Marağayi; 2) İrşad (Kərbəlayi Əli); 3) İsmayıl; 4) Əfsər Ordubadi (Mirzə Abdulla); 5) Əimmi; 6) Əşkriz (Kərbəlayi Hüseyn); 7) Bağır Dəllək; 8) Bülbül (Kərbəlayi Tağı Dəllək); 9) Pərvanə (Axund Molla Tağı); 10) Binəva; 11) Pürğəm (Mirzə Əhməd); 12) Talandi Mərəndi; 13) Topçu; 14) Saqib Əhəri; 15) Cudi (Axund Molla Səttar Rövzəxan); 16) Cərtab (Sadiq); 17) Həlim Xalxali (Qafar); 18) Həsən Sərabi; 19) Həqir Mərəndi (Hacı Mirzə Əbdülqafar Mahutfüruş); 20) Xəlifə Sərabi (Məhəmməd); 21) Xa-

dim Əttar; 22) Xəyyam Sani; 23) Dilsuz Təbrizi (Kərbəlayi Məhəmməd Əmin); 24) Dərviş Bülbül; 25) Dilriş (Kərbəlayi Əsgər Corabçı); 26) Dilgir (Kərbəlayi Məhəmməd Əttar); 27) Zikri (Kərbəlayi Nəcəf Bazarçı); 28) Raci (Hacı Əbülhəsən); 29) Rəbii (Mirzə Əbdüləli Miyaneyi); 30) Rağib Əhəri (Mirzə Musa); 31) Rza Sərraf; 32) Zahidi (Kərbəlayi Novruz Səbzifüruş); 33) Sərməst (Ağa Mirzə Bağır Küfri); 34) Səmturi (Sənturi); 35) Seyid Naqqaş; 36) Sultan; 37) Saqi Qissəxan; 38) Sərvəri (Kərbəlayi Şükrulla); 39) Şükri (Kərbəlayi Kərim); 40) Sai (Mirzə Əbülqasim); 41) Şahid Kuduşçi (Kərbəlayi Hüseyn); 42) Şükuhi (Kərbəlayi Mehdi); 43) Şeyda (Lütfulla); 44) Şakir Təbrizi; 45) Şeyx Əli Əkbər; 46) Şaiq Zakir; 47) Şahbaz Təbrizi; 48) Sabiri; 49) Səburi (Ağa Mirabbas); 50) Səfa (Seyid Hüseyn); 51) Ziya (Kərbəlayi Ağa Ərəqçinfüruş); 52) Tuğra (Məşhədi Hüseyn); 53) Tülui (Mirzə Əbdürrəsul); 54) Talib Məhzun (Əbu-Talib); 55) Zühuri (Əli Əttar); 56) Əbqəri (Kərbəlayi Rəhim Əmirxizi); 57) Aciz Mərəndi (Hacı Mirzə Yusif); 58) Qəmdil; 59) Qəşi Çayçı; 60) Fədui (Molla Mehrəli); 61) Fənai Xoyi (Mirzə Əbdürrəsul); 62) Fariğ; 63) Faxir (Məşhədi Əhmədağa Bəzzaz); 64) Faiz; 65) Qüdsi (Molla Məhəmməd Tağı Məktəbdar); 66) Qəsir; 67) Qumri (Mirzə Məhəmməd Tağı); 68) Gülşən (Hüseynağa Urumi); 69) Gənci Xoyi (Mirzə Məhəmməd Sadiq); 70) Kaşif; 71) Ləli (Ağaəli İrəvani Təbrizi); 72) Latif (Məşhədi Əsgər); 73) Müztər (Ağa Miryəhya); 74) Mir Xoyi; 75) Mubəd (Kərbəlayi İsmayıl Ərəqçinfüruş); 76) Məhcur (Kərbəlayi Əbdüləli); 77) Məcmər (Mirzə Məhəmməd Əli); 78) Molla Kərim; 79) Mirzə Cabbar; 80) Məzlum; 81) Nəbati; 82) Naci; 83) Natiq; 84) Huşin; 85) Vaqif (Məhəmməd Əli); 86) Yusif Paludəpəz.

***“Hədiqətüş-şüəra”***nın isə əlyazma nüsxəsi Təbrizdə Hacı Hüseyn Naxçıvaninin şəxsi kitabxanasına aid olmuşdur. İran alimi A.İ.Aştiyani “Yadigar” jurnalında (c. V, no. 8-9, s.141-142) yazdığı bir məqalədə bu əsəri yanlışlıqla Hacı Kazım Kurəpəz adlı bir müəllifə aid etmişdir[341].

---

341 Məani Ə.G. Tarixi-təzkirəhayi-farsi. C. I, s. 438.

Bu təzkirənin digər bir nüsxəsi Təbriz Milli Kitabxanasındadır[342].

[342] Təbrizi R.Y. XIX əsrdə Cənubi Azərbaycanda ictimai-ədəbi həyat və Əsrar Əlişah Təbrizi // Humanitar elmlərin öyrənilməsinin müasir problemləri, 2011/1, s. 122-125.

# ƏLİ RZA MİRZƏ QACAR

Şöhrə təxəllüsü ilə tanınan Əli Rza mirzə Qacar h. XIII əsrin ortalarında / XIX əsrin 30-cu illərində "Bosatinül-xaqaniyyə" adlı təzkirə tərtib etmişdir. Bəzi məlumatlara görə, Fətəli şahın 20-ci oğludur, digər bir məlumata görə isə 21-ci oğludur. H. 1218-ci ilin zilqədə ayının 6-da (17.02.1804) anadan olmuşdur. Əsas etibarilə Tehrandakı şah sarayında yaşamış, bir müddət isə doğma qardaşı Məhəmməd Rza mirzənin hüzurunda Gilanda qalmışdır. Nəsrəddin şahın hakimiyyəti dövründə Məlairə səfər etmiş və orada dünyasını dəyişmişdir[343]. Təzkirəçilər onun eyş-işrətə və əyləncələrə çox vaxt ayırdığını vurğulamışlar. Şöhrənin 1700 beytdən ibarət "Divan"ına qəsidələri, qəzəlləri, rübailəri, qitələri və məsnəviləri daxildir. Müəllifin həyat yoldaşı Dildarxan Luristaninin xətti ilə köçürülmüş bu "Divan"ın əlyazma nüsxəsi İran İslami Şura Məclisinin kitabxanasında 1006 şifrəsi ilə mühafizə olunur.

***"Bosatinül-xaqaniyyə"*** təzkirəsi əlifba prinsipi əsasında hazırlanmışdır. ***Beş "bostan"***dan ibarət olan təzkirənin hər "bostan"ı əslində müstəqil bir təzkirədir. Hər cildin əvvəlində müqəddimə və məqsədin bəyanı, daha sonra isə şairlərin tərcümeyi-halları, əlifba sırası ilə şairlərin fehristi, axırda isə onların hər birinin şeirlərindən nümunələr təqdim olunmuşdur.

***I bostan*** - "Bostanül-üşşaq" qəzəlxanlar haqqındadır. H.1248 /1832-33-cü ildə yazıldığına dair qeydə malikdir. 404 şairi əhatə etməkdədir. Dörd qisimdən ibarətdir: dibaçə, tərcümeyi-hallar, şair adlarının fihristi və şeirlər. Tərcümeyi-hallar və fehrist şair adlarının ilk hərfləri, şeir nümunələri isə qafiyələrin son hərfləri əsasında əlifba sırası ilə düzülmüşdür. Müəllif bəzi yanlışlıqlara yol vermişdir. Belə ki, təzkirədə Lütfəli bəy Azər Bəydili Şamlu, Azər Bəydili və Azər Şamlu adı altında iki ayrı-ayrı şair kimi təqdim

---

[343] Берже А.П. Фетх-Али-шах и его дети (исторический очерк) // «Русская старина», 1886, № 6, с. 556; Məani Ə.G. Tarixi-təzkirəhayi-farsi. I c., s. 122-123.

olunmuşdur. Əhməd bəy Əxtər Gürcü də səhvən iki müxtəlif yerdə ayrı-ayrı adlarla verilmişdir. Sultan Yaqub Ağqoyunlunun saray şairi Baba Şəhidi Quminin adı yanlışlıqla Şəhidi Qəzvini kimi yazılmış, Molla Məhəmməd Sufi Mazandarani isə Məhəmməd Sufi İsfahani kimi qeyd edilmişdir və s. Lakin təzkirəçi şəxsən tanıdığı şairlər haqqında qiymətli məlumatlar vermiş, digər təzkirələrdə yer almayan şairləri xatırlatmışdır.

***II bostan*** - "Bostanül-bədayə" qitə deyənlər haqqındadır;

***III bostan*** - "Bostanül-fəzail" qəsidə deyənlər haqqındadır. Dörd il ərzində yazılmış və 1251/1835-ci ildə başa çatdırılmışdır. 130 şairdən bəhs edir.

***IV bostan*** - "Bostanül-məarif" məsnəvi deyənlər haqqındadır;

***V bostan*** - "Bostanüs-sənaye" rübai deyənlər haqqındadır. H. 1250/1834-cü il hüdudunda qələmə alınmışdır.

İkinci və dördüncü bostanlar dövrümüzə qədər gəlib çatmamışdır[344].

"Bostanül-üşşaq"da İmamverdi mirzə Qacar, Əfsər Qacar (Məhəmməd Rza mirzə), Əhməd Əli mirzə Qacar, İnsaf Qacar (Məlik İrəc mirzə), Ümid Qacar (Əsədulla mirzə ibn Məhəmməd Vəli mirzə), Ayaz Talışi, Lütfəli bəy Azər, Aşüftə İrəvani (Kərbəlayi Hüseyn bəy), Ədəb Qacar (Xudaverdi xan ibn Məhəmməd İbrahim xan), Ülfət Əfşar (Məhəmmədqulu), Əvhədi Marağayi, Pərvanə Qacar (Məhəmməd mirzə ibn Məhəmməd Vəli mirzə), Bidil Qacar (Abbasqulu), Bərqi Xoyi (Abdulla), Bəzmi Bəydili (Mirzə Sadıq), Təsir Təbrizi, Təmkin Şirvani, Tağı Səfəvi, Cahanşah mirzə Qacar, Çeşmə İrəvani (Rzaqulu xan), Hüseynəli mirzə Qacar, Haləti Türkman Razi (Qasım bəy), Xosrov Qacar (Məhəmmədqulu mirzə Mülkara), Xosrovi Qacar (Məhəmməd Vəli mirzə), Xavər Qacar (Heydərqulu mirzə), Xocəstə Qacar (Çingiz mirzə ibn Məhəmməd Vəli mirzə), Dövlət Qacar (Məhəmməd Əli mirzə), Darayi-Qacar (Abdulla mirzə), Davər Qacar (Rzaqulu mirzə ibn Əfsər Qacar), Davər Qacar (Musa xan), Dürdi Türkman (Məhəm-

[344] Məani Ə.G. Tarixi-təzkirəhayi-farsi. I c., s. 120.

məd Əmin bəy), Rüsvay Qacar (Möhsün mirzə ibn Abdulla mirzə), Ravi Gorusi (Məhəmməd Fazil xan), Sərvər Qacar (Təhmasib mirzə), Şikəstə Qacar (Həsənəli mirzə Şücaüssəltənə), Şövkət Qacar (Məhəmməd Tağı mirzə), Şapur Qacar (Şeyxəli mirzə), Şöhrə Qacar (Əli Rza mirzə), Şükuh Qacar (Nəsrulla mirzə ibn Məhəmməd Vəli mirzə), Şövkət Qacar (Məhəmməd Qasım xan), Şah Abbas Sani, Şərər Bəydili (Hüseynəli bəy), Səbahi Bəydili (Hacı Süleyman), Saib Təbrizi, Səfayi Təbrizi (Əli Nağı), Səburi Təbrizi, Toğrul Qacar (İbrahim xan), Tövfi Təbrizi (Məhəmməd Əli), Təbib İrəvani (Mirzə Məhəmməd), Adil Qacar (Əlişah Zillüssultan), İzzət Qacar (Hacı Süleyman xan), Üzri Bəydili (İshaq bəy), Qalib Səfəvi (Mirzə Əli Əkbər), Fövq Təbrizi (Mirzə Məhəmməd), Qasım Ənvar Təbrizi (Müinəddin Əli), Qabil İrəvani (Hüseynəli xan), Qəsəmi Əfşar (Qasım bəy), Mahmud mirzə Qacar, Məsud ibn Mahmud mirzə, Məftun Dünbüli (Əbdürrəzzaq bəy), Minnət Əfşar (Kərim xan), Mehdiqlu Şəqaqi Azərbaycani, Münsif Qacar (Məhəmməd Zaman xan), Niyaz Səfəvi (Əhməd mirzə), Nüsrət Lənkərani (Sultan Hüseyn bəy), Nizami Gəncəvi, Nəsrulla Qaragözlü Həmədani, Valayi-Qacar (Əli Nağı mirzə), Hümayun mirzə Qacar və b. Azərbaycan şairlərindən bəhs olunmuşdur.

"Bostanül-fəzail"dəki azərbaycanlı şairlər: Əfsər Qacar, İnsaf Qacar, Əvhədi Maraği, Bəndə (Məhəmməd Rza ibn Mirzə Məhəmməd Şəfi Təbrizi), Həkim Qətran Təbrizi, Xaqani Şirvani, Davər Qacar (Musa xan), Seyid Zülfüqar Şirvani, Ravi Gorusi, Şikəstə Qacar, Şükuh Qacar, Şöhrə Qacar, Saib Təbrizi, Səbahi Bəydili, Ənqa Qacar (Məhəmməd Hüseyn mirzə), Fəsihi Təbrizi, Mahmud mirzə Qacar, Mücir Beyləqani, Münsif Qacar, Məsud mirzə Qacar, Nizami Gəncəvi.

***Əlyazmaları***

***"Bostanül-üşşaq"***
*Astani Qüdsi Rizəvi 2400.*
*Tehran Milli kitabxanası.*

*Ustad Səid Nəfisinin şəxsi kitabxanası.*

***"Bostanül-fəzail"***
*Ağa Əbdülhüseyn Bayatın şəxsi kitabxanası.*

***"Bostanüs-sənaye"***
*Tehran Milli Kitabxanası 59.*

# MİRZƏ İSA XƏYALİ ZİYAİ

Mirzə İsa Xəyali Ziyai XIX əsrin ikinci yarısında klassik şeir üslubunda yazan Azərbaycan şairlərindəndir. "Fövcül-füsəha" ədəbi məclisinin fəal üzvlərindən olan Mirzə İsa Xəyali öz əsərlərində dövrün bəzi ictimai problemlərini açmışdır. N.Qarayev onun əsərlərini bəzi dil-üslub xüsusiyyətlərinə görə diqqətəlayiq hesab edir.

Əlyazmalar İnstitutunda mühafizə olunan cüng-məcmuədə şairin qısa tərcümeyi-halı yazılmışdır. Xəyali əsərlərində də, öz həyatı və məşğuliyyəti haqqında məlumat verir. N.Qarayev Əlyazmalar İnstitutunda saxlanılan materiallar əsasında təzkirəçinin həyat və fəaliyyətini ilk dəfə olaraq araşdırmışdır[345]. Bu araşdırmalardan savayı Xəyali haqqında başqa tədqiqatlara rast gəlmədik.

Mirzə İsa Xəyali 1850-ci ildə Ərdəbil şəhərində sərraf ailəsində anadan olmuşdur. İlk təhsilini Ərdəbildə almış, ərəb, fars dillərini, eləcə də klassik Şərq poeziyasını mükəmməl öyrənmişdir.

Atası vəfat etdikdən sonra ondan qalan irsi bölüşdürərkən Mirzə İsa ilə qardaşları arasında narazılıq baş vermişdir. Bu səbəbdən o, 1871-ci ildə Lənkərana köçmüş, burada müdərrislik etmiş, bəzzaz dükanında satıcı olmuşdur. Onun "Elədi" rədifli şeirində Lənkərandakı həyatı öz əksini tapmışdır:

Ərdəbil tək vətəni saldı gözümdən gətirib,
Xaki-Talışda ip-örkənlə giriftar elədi.

Gah öz verdiyi tənxahı əlimdən çıxarıb,
Qövmü qardaşlarımı düşməni-xunxar elədi.

Gah mindirdi at üstə, dedi: "Gəz mişələri",
Bir neçə pirkeşiyə sahibi-sərdar elədi

---

[345] Qarayev N. XIX əsr Azərbaycan ədəbi məclisləri. Ədəbiyyat İnstitutu, Namizədlik dissertasiyası, Bakı, 1971, 301 s.; Qarayev N. XIX əsr Azərbaycan ədəbi məclisləri. Bakı, Nurlan, 2010, 326 s.

Gah arşın əlimə verdi, dedi: ol bəzzaz
Gah baqqal adımı qoydu, dükandar elədi[346].

Lənkəranda şair yerli ziyalılarla yaxın dostluq əlaqəsi yaratmış, əhalinin hüsn-rəğbətini qazanmışdır. Boş vaxtlarını "Fövcül-füsəha" ədəbi məclisində müsahibələrdə keçirən Xəyali tezliklə həmin məclisin görkəmli üzvlərindən biri kimi şöhrət tapır. Lakin maddi cəhətdən çətinlik çəkdiyi üçün Bakıya köçməyə məcbur olur. Burada ilk vaxtlar özünə iş tapa bilmədiyindən neft satmaqla dolanır, bir qədər sonra isə müdərrislik etməyə başlayır. Lakin nə neft yığıb satmaq, nə də az haqla müdərrislik etməklə o, özünü və ailəsini dolandıra bilmir. Odur ki, iş dalınca Mərvə gedib, orada yeni çəkilməkdə olan dəmir yolunda fəhləlik edir. Bir növ səyahət xarakteri daşıyan iş axtarmaq səfəri onu Aşqabada aparıb çıxarır. M.İ.Xəyali burada atasının keçmiş bir dostundan borc pul alaraq, sərraflıq etməyə başlayır. Nə Bakıda, nə Mərvdə, nə də Aşqabadda rahatlıq və məişətini təmin edəcək bir iş tapa bilməyən şair Lənkərana qayıdır. Burada kiçik bir bəzzaz dükanı açır və ömrünün sonuna kimi bu işlə məşğul olub, ailəsini dolandırır. Xəyali Bakıda olarkən "Fövcül-füsəha"da iştirak edə bilməməsi məclis üzvlərini çox narahat etmişdi. Şairin yaxın dostu Mirzə İsmayıl Qasir bu münasibətlə ona yazmışdı:

Mirzə İsa, qıl nəzər namında ünvan altına,
Səbt olub zahirdəki məqsudi pünhan altına.

Lənkəranı tərk edib Baku ara tutdun vətən,
Saldı əhbabi sərasər bari-hicran altına.

Çox da Bakuda yubanma, Lənkərana qıl səfər,
Müddəi söylər: "Yığıb sərraf milyan altına"[347].

---

[346] Qarayev N. XIX əsr Azərbaycan ədəbi məclisləri. Bakı: 2010, s. 88; ƏYİ, Arx. 38, Q – 17 (358), s. 3.

Xəyalinin ölüm ili dəqiq məlum deyildir. N.Qarayev göstərir ki, D-379 şifrəli cüng-məcmuəyə görə o h. 1325-ci il məhərrəm ayının 20-də (miladi 1907-ci il mart ayının 5-də) Lənkəranda vəfat etmiş və şəhərin Kiçik Bazar məhəlləsindəki təzə qəbirstanlıqda dəfn olunmuşdur[348]. Həmin əlyazmasına tikilmiş başqa bir vərəqdə isə qeyd edilir ki, Xəyali h. 1328-ci il məhərrəm ayının 20-də (m. 1910-cu il fevral ayının 1-də) vəfat etmişdir. Əlyazmalar İnstitutunda saxlanılan digər bir sənəddə isə onun 1917-ci ildə vəfat etdiyi göstərilir[349]. N.Qarayev Xəyalinin vəfatı haqqında olan bu üç tarixdən (1907, 1910, 1917) birincisinin düzgün ola bilməyəcəyini yazır. Şairin 1908-ci il oktyabrın 8-də naməlum bir şəxsə yazılmış avtoqraf məktubu bunu inkar edir[350]. Qalan iki tarixdən hansının düzgün olması hələlik aydınlaşdırılmamış qalır.

N.Qarayev apardığı tədqiqatlara əsasən göstərir ki, Mirzə İsa Xəyali Azərbaycan və fars dillərində üç-dörd kitab yazmışdır. Lakin onun ədəbi irsi tam əldə edilməmişdir. “Lənkəran şairləri” adlı məcmuədə onun “Elədi”, “Uzaq”, “Məni”, “Eyləyibsən”, “Arasında”, “Səbəbi-təlifi-kitabi-Xəyaliyyət”, “İran əhlinin tənbih və nəsihətinə”, “Əhli-İranın məzəmmətinə”, “Əhvalati-vəliəhdi-Yapon”, “İtaliyalı qarının vəsiyyəti”, “Dər müqəddimeyi-əncümən” və başqa şeirləri verilmişdir. Bunlardan əlavə, D-379 şifrəli cüng-məcmuədə

*“Nə gördü bilməm ol şuxi-nüktədan məndən”,*
*“İsa neçə müddətdi ki, heyrətdə qalıbdır”,*
*“Deyillə şəh yenə məşrutəni müqərrər edər”,*
*“Saqiya, ey fərxəndə ruxü mahcəmal”,*

---

[347]Qarayev N. XIX əsr Azərbaycan ədəbi məclisləri. Bakı: 2010, s. 89; AMEA Əlyazmalar İnstitutu, fraqment 1266, vər. 4 a.
[348] Yenə orada, s. 16.
[349] Qarayev N. XIX əsr Azərbaycan ədəbi məclisləri. Bakı: 2010, s. 91; ƏYİ, inv. 21520.
[350] ƏYİ, D – 379, vər. 16.

*“Saqiya, dönmə əhdü peymandən”* -

mətləli şeirləri, fars dilində naməlum şəxsə yazılmış məktubu vardır. Bunlardan “Deyillə şəh yenə məşrutəni müqərrər edər”, “Nə gördü bilməm ol şuxi-nüktədan məndən” şeirləri və yuxarıda adı çəkilən məktubu avtoqrafdır ki, tərtibatçı tərəfindən buraya tikilmişdir. Ümumiyyətlə, bu iki mənbədə Xəyalinin otuza qədər şeiri toplanmışdır.

N.Qarayev apardığı tədqiqatlar zamanı akademik H.Araslının “XVII-XVIII əsr Azərbaycan ədəbiyyatı tarixi” və prof. F.Qasımzadənin “XIX əsr Azərbaycan ədəbiyyatı tarixi” (1956-cı il nəşri) kitablarında adı çəkilən “Təzkireyi-Ziyai”nin müəllifi Mirzə İsa Ziyai ilə haqqında danışdığımız Mirzə İsa Xəyalinin şəxsiyyətinin eyniləşməsi faktlarına rast gəldiyini yazır. Bu problem ətrafında çoxlu fakt və məlumatlar toplayan N.Qarayev maraqlı nəticələrə gəlmişdir.

Belə ki, AMEA Əlyazmalar İnstitutunun fondunda saxlanan və təxminən 1930-cu illərdə başqa-başqa şəxslər tərəfindən yazılan iki mənbədə Mirzə İsa Xəyalinin təzkirə yazdığı göstərilir[351]. Həmin mənbələrdən birində Ərdəbilli Hacı Məhəmməd Rəhimin oğlu Mirzə İsa Xəyalinin qara karandaşla yazılmış qısa tərcümeyi-halında deyilir: *“Mərhum bütün ömrünü şeir yazmaqla keçirmişdir. Bütün türk (Azərbaycan – N.Q.) şüərasının tərcümeyi-halından və şeirlərindən maraqlanıb axırda öz əli ilə yazılmış böyük bir kitab yazıb qoyub”*[352]. Salman Mümtazın arxivində saxlanılan “Lənkəran şairləri” adlı məcmuədə tərtibçi Şərifov, Mirzə İsmayıl Qasirdən bəhs edərkən eynilə belə yazır: “*…Qasirin müasirlərindən Mirzə İsa Xəyali məşhur «Atəşkədə»yə etdiyi əlavələrdən birisi də Mirzə İsmayıl Qasirin əsərlərindən ancaq iki şeir əldə edə bildik. Bu şeirlər Mirzə İsa Xəyali tərəfindən ən qiymətli və ən qüvvətli şeirlər hesab edilərək «Atəşkədə»yə daxil edilmişdir*[353]*”*.

---

[351] Qarayev N. XIX əsr Azərbaycan ədəbi məclisləri. Bakı, 2010, s. 96.
[352] ƏYİ, D – 379, vər. 16 a.
[353] ƏYİ, Arx. 38, Q – 17 (358), məcmuənin Qasir hissəsi. s. 1-2.

Həmin məcmuəni əvvəldən-axıra diqqətlə oxuduqda belə görünür ki, onun tərtibçisi Şərifov Lənkəranda olmuş, oranın sakinləri və məcmuədə adları çəkilən şairlərin bəziləri ilə görüşmüş, onlardan canlı şahid kimi istifadə etmiş, "Təzkireyi-Ziyai"ni də şəxsən özü oxumuşdur. Doğrudan da, "Atəşkədə"nin davamı olan "Təzkireyi-Ziyai"də Qasirin iki şeiri vardır[354].

Yuxarıda qeyd olunduğu kimi, Mirzə İsa Xəyalinin əsli Ərdəbildəndir, 1871-ci ildə Lənkərana gəlib burada sakin olmuşdur. "Təzkireyi-Ziyai" də Lənkəranda yazılmışdır. Bunu müəllifin təzkirəyə yazdığı qısa müqəddimədən də aydın görmək olur. O yazır: *"... Kəcmədar zəmanə bir hadisənin səbəbi üzündən bu həqiri Gilanzəminə, yəni Lənkərana atdı və bir neçə müddət bekar oldum".* Müqəddimədən aydınlaşır ki, bekar qalmağı sevməyən Mirzə İsa "yazı-pozu" ilə məşğul olur. Özündən sonra bir yadigar qoymaq məqsədilə o, on-on iki günlüyə bir nəfərdən çox minnətlə Lütfəli bəy Azərin "Atəşkədə" əsərini alır, on beş günün tamamında həmin kitabın üzünü köçürüb sahibinə qaytarır. Müəllif göstərir ki, "Atəşkədə" yazılan vaxtdan indiyədək keçən təxminən yüz illik bir dövrün şairləri haqqında əlimdə məlumat olmadığından və Lənkəranda bu haqda bir kitab tapa bilmədiyimdən mən də öz müasirlərim haqqında məlumatımı bu kitaba əlavə edirəm. Müqəddimədə fars dilində açıq-aydın qeyd olunmuşdur:

" حقیر الفقیر کسیر التقصیر عسی المتخلص به ضیائی ابن مرحوم حاجی محمد رحیم
مشهور بصراف اردبیلی"

*(Günahları çox olan fəqir, həqir, Sərraf Ərdəbilli kimi tanınan mərhum Hacı Məhəmməd Rəhimin oğlu Ziyai təxəllüslü İsa).*

Buradan görünür ki, həmin təzkirənin müəllifi Ziyai ərdəbilli Hacı Məhəmməd Rəhim oğlu İsadır.

Yeri gəlmişkən onu da qeyd etməliyik ki, XIX əsrin ikinci yarısında Ərdəbildə *Ziyai* təxəllüslü iki şair olmuşdur. Mirzə İsa

---

[354] Qarayev N. XIX əsr Azərbaycan ədəbi məclisləri. Bakı, 2010, s. 96.

Ziyai öz təzkirəsində ərdəbilli Kərbəlayi Haqverdi Cigərçi təxəllüslü şairdən bəhs edərkən yazmışdı:
*(“Bir dəfə Mövlana Ziyai, Şəms Ərdəbili və bir neçə nəfər başqa yoldaşları ilə birlikdə bir məclisdə oturmuşdu. Bir nəfər Cigərçini müzakirə edərək, onu təriflədi və vəsf etdi. Mövlana ondan soruşdu ki, “onun adı nədir?” Dedi: “Kərbəlayi Haqverdi”. Mövlana dedi: “Haqverdi adında şair, Şahverən adında padşah və Məşədi Nadirməhəmməd adında vəzir əsla ola bilməz. Hərgah belə bir təsadüf olarsa, onun haqqında iltifat yaxşıdır”. Mən bu söhbətlərinə görə bir də onlarla görüşmək arzusunda oldum")*[355].

Yuxarıdakı bu parçadan aydın olur ki, həmin məclisdə Mövlana Ziyai və Şəms Ərdəbili ilə birlikdə haqqında danışdığımız təzkirənin müəllifi Mirzə İsa Ziyai də iştirak etmişdir. Həm də onun Mövlana Ziyai və Şəms Ərdəbilinin söhbətlərinin arzusunda olması göstərir ki, təzkirə müəllif Mirzə İsa Ziyai ilə yuxarıdakı mətndə göstərilən Şəms Ərdəbilinin dostu Mövlana Ziyai ayrı-ayrı şəxslərdir. Həmin təzkirədə ərdəbilli Mövlana Ziyai haqqında da məlumat verilmişdir. Burada yazılır ki, “Mövlana Ziyai Ərdəbil əhlidir, o vilayətin varlı ailələrinin birindəndir. İncə, gözəl zövqlü, gözütox bir cavandır. Şahmat elmində kamil, arif bir şəxsdir. Gecə-gündüz vaxtını Şəms Ərdəbili ilə keçirir. Bəlkə, bir saat bir-birilərindən ayrılmırlar. 1871-ci ildə kəcrəftar zəmanə onunla düz gətirməyib, mal və mülkdən əli boşa çıxıb, Ərdəbildən Gilan tərəfə gəlib, on iki il Lənkəranda sakin olub. Təxəyyülatından bir neçə tuğra türkcə (azərbaycanca – V.M.) qəzəli yazılır[356]”.

Təzkirədə Mövlana Ziyainin “Qoyubdu başə ol sərvi-səhi külah əyri”, “Əgərçi hicrdən canımda olmuş min bəla peyda”, “Dilbəra, şəhdi-ləbin dil hərdəm eylər arzu”, “Bir zəman görsəm fərəhdən ərşə əfğanım çıxar”, “Çox kimsədən dilər bu dili-binəva mədəd” misraları ilə başlanan qəzəlləri verilmişdir[357].

---

[355] Qarayev N. XIX əsr Azərbaycan ədəbi məclisləri. Bakı: 2010, s. 97; ƏYİ, D-269, vər. 77a.
[356] ƏYİ, D – 269, vər. 81 b.
[357] Yenə orada, vər. 200 b – 201 a.

Xəyalinin isə əlyazmasının haşiyəsində "Xəyali Ərdəbilinin kəlamından" başlığı altında "Bir yol eşidib ol məhi naməhrəm içində", "Şəhneyi-hicr kəsib başımı qəssab kimi", "Ömrün qəbaləsi şəbi-hicran əlindədir" mətləli qəzəlləri getmiş[358], həyatı haqqında isə heç bir məlumat verilməmişdir. Bir məsələ aydındır ki, "Təzkireyi-Ziyai"ni yazan İsa ibn Hacı Məhəmməd Rəhim Ziyai həmin təzkirənin 81 "b" vərəqində qeyd olunmuş Ziyai deyildir. Bu həmin şəxs olsaydı müəllif, Şəms Ərdəbili ilə Mövlana Ziyainin iştirak etdikləri məclisdən bəhs edərkən onlarla söhbət etmək arzusunda olduğunu yazmazdı. N.Qarayev Xəyalinin tərtib etdiyi təzkirənin müqəddiməsində özü haqqında məlumat verdiyi üçün təkrara ehtiyac duymadığını yazır. Onun həm Ziyai, həm də Xəyali təxəllüsləri daşımasına gəlincə deməliyik ki, eyni hal bir çox şairlərdə müşahidə olunur. Məsələn, Mirzə Rəhim Fəna "Aşiq", Əbdülxaliq Cənnəti "Əttar", "Vasifi", Abdulla bəy Abış "Abdulla" və başqaları müxtəlif vaxtlarda müxtəlif təxəllüslərlə şeir yazmışlar. Çox güman ki, Mirzə İsa da əvvəllər, daha doğrusu təzkirəni yazmağa başladığı illərdə *Ziyai* təxəllüsü daşımış, sonralar el-oba, qohum-qardaşdan ayrılıqdan sonra *Xəyali* təxəllüsünü qəbul etmişdir.

Həmin təzkirənin əvvəlində üç vərəq ağ buraxılmışdır. Bu vərəqlərin hər birində bənövşəyi karandaşla köhnə rus və ərəb əlifbaları ilə yazılmışdır: *"İsa Xəyali təxəllüs ziyad-fikirli", "Mirza İsa Xəyali təxəllüs".*

Hər halda bunları yazan naməlum adam Xəyali ilə Ziyainin eyni şəxs olduğuna əmin olmuşdur. Əgər belə olmasaydı, təzkirənin 5 "a" vərəqində "Sərraf Ərdəbilli kimi tanınan mərhum Hacı Məhəmməd Rəhimin oğlu Ziyai təxəllüslü İsa" yazıldığı halda naməlum bir şəxs oraya Ziyai əvəzinə Xəyali sözlərini yazardımı? N.Qarayev təzkirənin xəttinin Mirzə İsa Xəyalin D-379 şifrəli cüng-məcmuədəki avtoqraf xəttinə çox oxşadığını yazır.

N.Qarayev görkəmli alim Əkrəm Cəfərin də həmin təzkirənin Mirzə İsa Xəyalinin qələminin məhsulu olduğunu təsdiq etdi-

---

[358] Yenə orada, vər. 338 a – b.

yini qeyd etmişdir. Belə ki, Əkrəm Cəfər 1928-ci ildə Lənkəranda müəllim işləyərkən məhz AMEA Əlyazmalar İnstitutunda D-269 şifrə altında saxlanılan "Təzkireyi-Ziyai"ni M.İ.Xəyalinin oğlu İbrahim Xəlil İsazadədən almış və bir neçə ay özündə saxlayaraq, dönə-dönə oxumuşdur[359].

"Təzkireyi-Ziyai" fars dilində, "Atəşkədə" səpkisində yazılmışdır. "Atəşkədə"də olduğu kimi burada da əvvəl şairlərin həyatı, sonra isə onların əsərlərindən nümunələr verilmişdir. Təzkirəyə əlavə olunan şairlərin əksəriyyəti XIX əsrin ikinci yarısında Ərdəbil və Təbrizdə yaşayıb yaratmışlar. Buraya həmçinin S.Ə.Şirvani, Mirzə Ələsgər Növrəs, Əbülhəsən Şəhid, Mirzə Rəhim Fəna, Fatma xanım Kəminə, Hacı Abbas Agəh kimi Şirvan və Qarabağ şairləri də daxil edilmişdir. Bunlardan əlavə, həmin əlyazmada başqa təzkirələrdə adlarına rast gəlmədiyimiz Rindi Şirvani, Niyazi Şirvani və Əsrar Qarabağinin şeirlərindən nümunələr verilmişdir. Ümumiyyətlə, burada  XIX əsrin yetmişdən artıq şairi haqqında məlumat vardır[360].

Təzkirədə Ərdəbil şairləri ilə tanış olarkən öyrənirik ki, XIX əsrin 60-70-ci illərində orada da şair və alimlərin məclisi olmuşdur. Musiqişünas və sənətkar Sərraf Ərdəbili, dövrünün "bütün elmlərindən xəbərdar" olan Molla Qulaməli Həsrət, Kərbəlayi Fərəc Zikri Ərdəbili, Mirzə Əsəd Ərdəbili, əvvəllər Ərdəbildə olub, 1871-ci ildə Lənkərana köçən Molla Məhəmməd Mücrüm, Mövlana Ziyai Ərdəbili, Mirzə Əbdürrəhim Rağib Ərdəbili, Məşədi Zeynalabidin Ünqa, Mirzə Abdulla Sağəri və başqaları tez-tez həmin məclisə toplaşaraq şeir-sənət ətrafında söhbət açmış, mübahisələr aparmışlar. Təzkirədə Əliməmməd Rövşən[361], Mirzə Abdulla Sağəri[362], Kərbəlayi Haqverdi Cigərçi[363], Mirzə Əbdürrəhman Ra-

---

[359] Qarayev N. XIX əsr Azərbaycan ədəbi məclisləri. Bakı, Nurlan, 2010, s. 100.
[360] Qarayev N. "Təzkireyi-Ziyai" və "Təzkireyi-Nəvvab" haqqında bəzi qeydlər // Əlyazmalar xəzinəsində. IV c. 4. – Bakı, 1976, s. 78-87.
[361] ƏYİ, D – 269, vər. 77 b.
[362] Yenə orada, 78 b.
[363] Yenə orada, 77 a.

ğib[364], Ünqa[365] və başqalarından bəhs edilərkən onların həmin məclisdə iştirakı və müşairələri haqqında çoxlu qeydlər vardır.

Təzkirədə musiqi, rəssamlıq, xəttatlıqda məharəti olan, həmçinin təbabət, nücum və s. elmləri gözəl bilən söz ustaları ilə yanaşı, Məşədi Məhəmməd Müsəvvir, Mirzə Rəhim Fəna, Mövlana Ziyai Ərdəbili və Mahmud kimi şairlərin öz dövrlərinin görkəmli şahmat ustaları olmasına dair məlumat da verilmişdir.

Müasirləri haqqında verdiyi bəzi qeydlərdən görünür ki, təzkirənin "Atəşkədə" hissəsini təxminən 1871-ci ildə köçürən müəllif ona etdiyi əlavələrin bir çoxunu 1883-cü ildə yazmış, sonralar əlinə məlumat düşdükcə bu işi davam etdirmişdir.

XIX əsrin ikinci yarısında Azərbaycan şairləri haqqında qısa da olsa məlumat və əsərlərindən nümunələr verdiyi üçün bu təzkirə ilk mənbə kimi xüsusi əhəmiyyətə malikdir və tədqiq olunaraq nəşr edilməlidir.

***Əlyazması***

*AMEA Əlyazmalar İnstitutu D – 269*

---

[364] Yenə orada, 74 b – 75 a.
[365] Yenə orada, 76 a.



**Mirzə İsa Xəyali Ziyai. “Təzkireyi-Ziyai”**
**AMEA Əlyazmalar İnstitutu D-269**

# ƏBÜLQASIM MÖHTƏŞƏM ŞİRVANİ

Əbülqasım Möhtəşəm Şirvani Bəhupali Hindistanda doğulub boya-başa çatmış azərbaycanlı müəlliflərdəndir. O, Şeyx Əbülfəzl Məhəmməd Abbas Şirvaninin böyük oğludur. H.1276/1859-cu ildə anadan olmuşdur. Atasından təhsil və təlim-tərbiyə almışdır. “Zərrin-pərənd”, “Ayini-bəhin”, “Çeşmeyi-nuş”, “Tarixi-nəfis”, “Rəvan-əfza”, “Cavahirnamə”, “Qeysərnamə”, “Diləfruz”, “Zərnab”, “Qəbəsatül-qiyas” kimi əsərləri vardır.

Onun əsərlərindən biri də h. 1298/1880-81-ci ildə qələmə aldığı ***“Əxtəri-taban”*** təzkirəsidir. Burada əlifba sırası ilə 82 qadın şairə haqqında məlumat verilmişdir. Təzkirədə ilk olaraq Arzu Səmərqəndidən və son olaraq Yasəmən adlı qadın şairədən bəhs edilmişdir. “Xatimə”də Rabiə Qəzdarinin və Məsturə Kürdüstaninin tərcümeyi-halına və yaradıcılıqlarından örnəklərə yer verilmişdir. O, son iki şairənin haqqında məlumatı təzkirəni bitirdikdən sonra “Məcməül-füsəha”nı mütaliə edərkən əldə etmiş və öz əsərinə əlavə etmişdir. Onu bu təzkirəni yazmağa qardaşı Əbülhəsən həvəsləndirmiş və o, öz əsərini 1298/1880-81-ci ildə tamamlayaraq, onu Bəhupal rəisəsi Şahicahan bəyimə həsr etmişdir. Əsər 1299/1881-cu ildə 63 səhifə həcmində Bəhupal şəhərindəki “Şahicahani” mətbəəsində daşbasma üsulu ilə işıq üzü görmüşdür.

Müəllif bu əsəri yazmaq üçün çox sayda təzkirələrə müraciət etməli olmuşdur. Lakin onun bəzi xətalara da yol verdiyi görülməkdədir. Məsələn, təzkirədə Məxfi Rəşti adlı İran şairinin bəzi şeirləri yanlışlıqla Övrəngzib Aləmgir padşahın qızı Zibünnisa bəyim Məxfiyə aid edilmişdir[366].

[366] Məani Ə.G. Tarixi-təzkirəhayi-farsi. I c., s. 9-22.

# MİR MÖHSÜN NƏVVAB

Şair, təzkirəçi, rəssam, naqqaş, xəttat, astronom, pedaqoq kimi tanınmış Mir Möhsün Nəvvab 1833-cü ildə Şuşada ruhani ailəsində dünyaya gəlmişdir. Molla məktəbində ərəb, fars dillərini, eləcə də Şərq ədəbiyyatını mükəmməl öyrəndikdən sonra o, 34 yaşında ikən Şuşanın görkəmli alimlərindən Molla Abbas Cavanşirdən heyət, rəml və nücum elmlərini öyrənməyə başlamışdır.

Şuşada müəllimlik etməyə başlamış və 1890-cı ildə təşkil etdiyi yeni tipli məktəbdə əsasən özünün hazırladığı dərsliklərdən istifadə etmişdir. Nəvvab öz evində litoqrafiya mətbəəsi açmağa nail olmuş, hətta burada özünün bir neçə əsərini belə çap etmişdir.

Nəvvab dövrünün tanınmış alimlərindən olmuş, elmin müxtəlif sahələrinə aid Azərbaycan, fars və ərəb dillərində iyirmidən artıq əsər yazmışdır[367]. Bu əsərlər arasında "Ziyaül-Ənvar", "Kifayətül-ətfal", "Məzamir", "Şəmsül-hidayə", "Bəhrül-hüzən", "Kənzül-mühən", "Divani-farsi", "Batilüs-sehr", "Nurül-ənvar", "Vüzuhül-ərqam" və başqalarının adını çəkmək mümkündür.

Mir Möhsün Nəvvabın əsərləri içərisində ***"Təzkireyi-Nəvvab"***ın xüsusi yeri vardır. 1891-ci ildə fars dilində qələmə alınan "Təzkireyi-Nəvvab" iki hissədən ibarət olub, məhəlli xarakter daşıyır və müəyyən mənada sistemsiz tərtib olunmuşdur.

Nəvvab ön sözdə təzkirənin yazılma səbəbini belə açıqlayır: "Aciz bəndə Nəvvab Mir Möhsün ibn Hacı Mir Əhməd Ağamirzadə Qarabaği belə söyləyir ki, bu gözəl dövranda, mübarək 1309-cu ildə görkəmli din qardaşlarından və səmimi ruhanilərdən bəziləri belə arzu etdilər ki, tarixin səhifələrində bir yadigar kimi qalması üçün Qarabağ şairlərinin əziz adları, onların keçdikləri həyat yolu toplanıb bir təzkirə tərtib edilsin və yüksək ləyaqət və bacarığa malik olmayan mən onların gözəl adlarını zəmanə aqilləri və dövran arifləri üçün yadigar qoyum. Beləliklə, onların buyurduqlarını

---

[367] Qarayev N. XIX əsr Azərbaycan ədəbi məclisləri. Bakı, 2010, s. 211-212.

qəbul edib, onların xahişini yerinə yetirib, mərdanə işə başladım və bu məcmuəni yazıb, adını "Təzkireyi-Nəvvab" qoydum"[368].

Müəllif əsərini iki dildə qələmə almasının səbəbini də şərh edir: "Bundan qabaq yazılmış təzkirələr hamısı bir dildə olmuşdur. Yəni ya ərəb, ya fars, ya da türk dilində. Ancaq mən iki dildə yazacağam, həm farsca, həm də türkcə. Türkcə şeirləri farsca şeirlərdən ayırmağı rəva bilmədim və bir-biri ilə qarışıq yazaraq təzkirəni üç hissəyə bölürəm"[369].

Nəvvab təzkirənin ön sözündə əsəri hansı strukturda hazırladığını qeyd edir: "...təzkirəni üç hissəyə bölürəm. Birinci hissə - həyatda olmayan şairlərin əhvalı və şeirləri, ikinci hissə - həyatda olan şairlərin əhval və şeirləri, üçüncü hissə - kitabın xatiməsi, məzhəkəli şeir parçaları, satiralar və s. əvvəlki adları getməyən şairlər və Qafqaz şəhərlərinin şairləri"[370].

***Birinci hissədə*** təzkirə tərtib olunan zaman vəfat etmiş otuz beş şair, ikinci hissədə isə həyatda olan əlli altı şairdən bəhs olunmuşdur.

N.Qarayev təzkirəçinin birinci hissədəki şairlər haqqında məlumatı əldə etməkdə çətinlik çəkdiyini, çox çətinliklərə qatlaşaraq, onların qohum-əqrəbaları ilə görüşüb, tərcümeyi-hallarına aid məlumat və əsərlərindən nümunələr topladığını qeyd edir[371]. Birinci hissənin sərlövhəsi bu şəkildədir: "Mərhum Qarabağ şairlərinin həyatı və şeirlərindən ixtisarla verilmiş parçalar h.1309/1891-ci ilin rəbi-ül-əvvəl ayında yazılıb".

Bu hissədə Molla Pənah Vaqif, Vidadi, Yusif Kosa Qarabaği, Mirzə Məriz, Mirzə Əli, Qasım bəy Zakir, Abdulla bəy Asi, Mirzə İbrahim Səba kimi şairlər yad olunmuşdur.

Nəvvab təzkirənin ***ikinci bölümünün*** əvvəlində yazır: "1309-cu ilədək sağ olan Qarabağ şairlərinin həyatı barədə və şeirləridir". Daha sonra təzkirəçi bu dünyanı tərk etmiş şairlərin həyatı

---

[368] Mir Möhsün Nəvvab. Təzkireyi-Nəvvab. Bakı, 1998, s.7-8.
[369] Yenə orada, s. 10.
[370] Mir Möhsün Nəvvab. Təzkireyi-Nəvvab. Bakı, 1998, s. 12.
[371] Qarayev N. XIX əsr Azərbaycan ədəbi məclisləri. Bakı, 2010, s. 218.

və qiymətli şeirlərini – o şeirləri ki, künclərdə, onun-bunun yanında gizli qalmışdır, bütünlüklə toplayıb, zəmanə ariflərinin və dövran şairlərinin hüzuruna təqdim edib qurtardığını əlavə edir. Nəvvab əsərin bu hissəsində "Müasir Qarabağ şairləri" başlığı altında bir sıra məqamlara aydınlıq gətirir: "Əlavə olaraq aşağıdakı maddələri də aydınlaşdırmaq lazımdır. Çünki gələcək nəsillərə lazım ola bilər. Birinci hissədə adlarını və əhvallarını verdiyimiz şairlər dövründə əlahəzrət Ağa Məhəmməd şah Qacarla, ondan sonra əlahəzrət Fətəli şahla və sonra da əlahəzrət Məhəmməd şahla müasir olmuşlar ki, hər üçü qüdrətli Qacarlar sülaləsindən olub". Təzkirəçi bu zaman Rusiya və Osmanlı dövlətlərinin başında duranlar haqqında da məlumat verməyi lazım bilmişdir.

"Ad və əhvallarını bu təzkirənin ikinci hissəsində çəkdiyimiz şairlər ki, indi islam tarixi 1309, rum-rus tarixi 1891-ci ildir, İran padşahı şanlı-şövkətli əlahəzrət Nəsrəddin şah bin Məhəmməd Qacarla müasirdirlər"[372].

Təzkirənin ikinci hissəsində haqlarında məlumat verilən şairlərdən Natəvan, Mehdiqulu xan Vəfa, Mir Həsən ağa, Fatma xanım Kəminə, Balacaağa Xan Qaradaği, Bəhram bəy Fədai, Mirzə Növrəs, Mirzə Həsən, Mirzə Cəlal və başqalarının adını sadalamaq mümkündür.

Üçüncü hissə isə kitabın xatiməsini əhatə edir: "Qarabağın vəfat etmiş və həyatda olan şairlərinin öz adlarına müvafiq həcv, satira və s.-dən ibarət pərakəndə şeirlərinin təqdim edilməsi. Rəcəb ayı, 1309-cu il"[373]. Burada bəzi səbəblər üzündən təzkirəyə düşməyən 14 Qarabağ şairi haqqında çox qısa bilgi verilmişdir. Nəvvab "Qafqaz şəhərlərindəki şairlərin həyatda olub-olmamalarından asılı olmayaraq, adları, təxəllüsü və olduqları yerin adı" sərlövhəsi altında yazır: "...Qarabağ şairlərinin əhvalı və şeirlərini toplayandan sonra istədim ki, Qafqaz şairlərinin də şairlərinin əhvalı, nəsəbi və şeirlərini ələ keçirib toplayıb, bu təzkirəyə daxil edərək, zəmanə ariflərinin və dövran şairlərinin hüzuruna çatdırım. Lakin bəzi ma-

---

[372] Mir Möhsün Nəvvab. Təzkireyi-Nəvvab. Bakı, 1998, s. 147-148.
[373] Yenə orada, s. 543.

neələr üzündən öz məqsədimə çatmadım"[374]. Təzkirəçi bu maneələrin arasında bəzi şairlərin təxəllüsünü, bəzisinin tərcümeyi-halını bilməməsini, şeirlərini əldə edə bilməməsini və s. sadalayır. Ancaq onların məşhurlarından bəzilərinin adını və təxəllüsünü təqdim edir. Nəvvab Şamaxı şairlərinin 21-ni, Gəncə şəhərinin 12-sini, İrəvan şairlərinin 6-sını, Ordubad şairlərinin 3-nü, Dərbənd şairlərinin 3-nü, Bakı şairlərinin 2-sini, Quba şairlərinin 1-ni, Lahıc şairlərinin 1-ni, Lənkəran şairlərinin 1-ni xatırlamışdır. Sonda isə Qafqaz əhalisindən tanımadığı 4 şairin adını çəkmişdir.

N.Qarayev hələ 1971-ci ildə ilk dəfə olaraq "Təzkireyi-Nəvvab"ın spesifik cəhətini xüsusi vurğulayır: "Əsərin bir cəhəti xüsusilə qeyd edilməlidir ki, bu da indiyədək təzkirəçilərin heç birində rast gəlmədiyimiz avtoqraf toplamaqdır. Belə ki, müəllif təzkirəni yazarkən bir çox şairləri yanına dəvət etmiş və şeirlərini xatirə olaraq, avtoqraf kimi həmin kitaba yazdırmışdır. Bu mümkün olmadıqda isə şairlərdən aldığı avtoqraf vərəqləri təzkirəsinə tikmişdir"[375]. Nəvvab bir sıra şairlərə avtoqrafla bağlı müraciət etsə də, onların bəzisi şeirləri gecikdirmiş və ya göndərməmişdir. Təzkirədə bununla bağlı yazılmış qəzəllərə də rast gəlmək mümkündür. Məsələn, şeirini gecikdirdiyinə görə Nəvvabın Xurşidbanu bəyim Natəvana məktubu (15 zilqədə, 1309):

Əliyye-aliyyə, ağa cəlilə,
Neçün əşarınız olmaz hüveyda?
Qəmu əşarlər əncama yetdi,
Sizinkindən əsər olmazmı peyda?

Hilali-növ kimi düşmüş xifayə,
Xəti-müşkininiz dönmüş hümayə,
Və ya iksirə, ya kim, kimiyayə -
Bilinməz bir əsər manəndi-ünqa.

---

[374] Yenə orada, s. 548.
[375] Qarayev N. XIX əsr Azərbaycan ədəbi məclisləri. Bakı, 2010, s. 220.

Mənim qəsdim budur, banuyi-əzəm,
Sizin əşariniz olsun müqəddəm.
Bu namə-nami olsun həm mükərrəm,
Və gər nə, rövnəq olmaz bunda əsla.

Kəlamınız gərək sərdəftər olsun,
Cavahir nəzminizdən əşhər olsun,
Kütüb təzyinə düşsün, ənvər olsun,
Necə xurşidi-ənvərdən bu dünya.

Olubdur müntəzir itmamə əhbab,
Cavahir nəzmdən olsun şərəfyab,
Sizə peyvəstə daidir bu Nəvvab,
Duadan qeyri yoxdur təmənna[376].

Xurşidbanu bəyim Nəvvaba aşağıdakı şeirlə cavab vermişdir:

Əya Nəvvab, valayi-süxəndan,
Yetişdi naməniz, dilşad oldum.
Qəmü dərdim firavan idi, amma
Behəmdüllah, künun azad oldum.

Sərasər şeiriniz əz ruyi-hikmət,
Qəmu məzmunları mehrü məhəbbət,
Mühübbə rəhmətü üdvanə zillət,
Bu şirin ləhcəyə mötad oldum.

Qəmi-əyyamdan çox natəvanəm,
Əliləm, naxoşam, əfsürdəcanəm,
Bu tətildən özüm də bədgümanəm,
Məgər kuhi-qəmə Fərhad oldum.

[376] Mir Möhsün Nəvvab. Təzkireyi-Nəvvab. Bakı, 1998, s. 320.

Unutma sən duadan Natəvanı,
Əlilü naxoşü əfsürdəcanı,
Cənabından səva yoxdur gümanı,
Əgər yaddan çıxam, bərbad oldum.

Təzkirədə şeirlərini gecikdirən Mirzə Əbdül Şahin ilə Nəvvabın yazışmasına da rast gəlirik.

N.Qarayev Nəvvab və Kəminə arasında avtoqraf şeirlə bağlı baş vermiş anlaşılmazlıq üzərində də durmuşdur: "Nəvvab 1892-ci ildə Kəminəyə məktub yazaraq, təzkirə üçün istədiyi şeirləri gecikdirdiyindən gileylənmişdir...

Kimsə Kəminəyə yanlış məlumat vermiş, ona görə də şairə şeirini göndərmək istəməmişdir. Nəvvab isə məktubunda göstərir ki, mənim bu işdə bir faydam yoxdur, məqsədim budur ki, sənin şeirlərin xeyir iş kimi yadigar olaraq dünyada qalsın"[377].

Sənin, ey aliyyə, şeirin məgər izhar olmazmı?
Dübarə ərzi-hal etmək məgər təkrar olmazmı?

Yetişdi aləmin şeiri qəmu dəftərdə səbt oldu,
Yetə səndən genə şirin-şəkər güftar, olmazmı?

Nədən tutmuş bulud mahi-mübarək ayının ruyin,
Məgər badi-səba əsməz, bu məh əşhar olmazmı?

Mənim bu işdə nəfim yox, sizə məlumdur xahər,
Bunun zəhmətkeşi xəlq içrə bimiqdar olmazmı?

Qərəz dünyada bu əşar bir asardır, qalsın,
Qəmu şairlərin adı məgər asar olmazmı?[378].

---

[377] Qarayev N. XIX əsr Azərbaycan ədəbi məclisləri. Bakı, s. 220.
[378] Mir Möhsün Nəvvab. Təzkireyi-Nəvvab. Bakı, 1998, s. 312.

Fatma xanım Kəminə Nəvvaba aşağıdakı qəzəllə cavab vermişdir:

Nə bədgudur mənə mane, nə qəflətdir, əya Nəvvab,
Həmişə möhnətü hicran çəkən bimar olmazmı?

Qalıbdır şişədə meytək qəmu əşar sərbəstə,
Səbəb olsan qəmusi açılır, əşhar olmazmı?

Yazılsa xətti-naməqbulilə əşari-namətbu,
Kəminə şairan yanında bimiqdar olmazmı?[379].

Məşədi Əyyub Baki Nəvvaba təzkirəsi üçün qəzəl göndərərkən məktub da yazmış və çox güman ki, Nəvvab da maraqlı olduğu üçün bu məktubu əsərdə olduğu kimi vermişdir. *"Bakinin öz xəttilə: Əzizimiz, şuşalı Nəvvab Mir Möhsün Ağamirzadənin xahişi ilə mən, Məşədi Əyyub mərhum Qarabağ taciri Hacı Sadıq oğlu – Baki təxəllüs – dostlarıma yadigar məqsədilə sözlərimi öz dəstixəttimlə bu nüsxəyə yazıram. Baxmayaraq ki, bəndəniz öz ömrünü başa vurmaq üzrədir, lazım bilir ki, nə qədər ki, canında su var, alimlərimiz astanasına baş əysin... On yeddi yaşında evlənmişəm. Hal-hazırda 25 yaşım vardır.*

*Ərəb torpağından uzaq düşmüşəm, fars küləyinə də məruz qalmamışam. Qorxum yoxdur. Yeddi il Qarabağın beytül-ədəbində Hacı Məhəmməd bəy Qarabağinin oğlu Mirzə Kərimdən dərs almışam. O, yeniyetmə cavan olsa da, həqiqətdə doxsan yaşlı qoca kimi tavanası yoxdur.*

*Xülasə, şairlik məsələsində də ixtilaf mövcuddur, bəziləri zövqə, bəziləri isə təbə malik olmağı üstün tutur. Lakin bu sətirlərin müəllifi deyir ki, zövq və təbin yuxarıdakı məsələyə dəxli yoxdur. Çünki bütün bəşər övladı zövq və təbə malikdirlər, belə olduqda nə üçün hamı şair olmasın? Əgər Allah verəndirsə, zülm və əziyyətə düçardırlar. Hər kəsin gözü varsa, dərk edib ki, həqiqətən*

---

[379] Yenə orada, s. 313.

*şeirin badəsi məhəbbətdir, belə ki, görkəmli şairlər bu həqirin sözünün şahididir. Ah, bisavadlıq!"*[380].

Nəvvab təzkirəsinə Məşədi Əyyub Baki, Mirzə Hüseyn Çakər, Mirzə Yəhya Şeyda, Şaki Abdal, Məşədi Məhəmməd Bülbül, Baxış bəy Səbur, İbrahim Tahir və başqalarının avtoqraf şeirlərini daxil etmişdir.

Təzkirəyə avtoqraf vərəqlərin daxil edilməsi ideyası nəinki Azərbaycanda, bəlkə də, bütün Yaxın Şərqdə Mir Möhsün Nəvvaba aiddir[381].

Nəvvabın ədəbi-bədii irsini araşdıran f.e.n. A.Hacıyeva belə qənaətə gəlmişdir ki, şairin bu sahədəki fəaliyyəti əsas etibarilə, həmin fəaliyyətin məntiqi yekunu olan "Təzkireyi-Nəvvab" əsəri ilə ölçülür [382].

Son olaraq qeyd etməliyik ki, "Təzkireyi-Nəvvab"ın yenidən nəşrinə və təzkirənin təhlil olunaraq hərtərəfli şəkildə araşdırılmasına ehtiyac duyulmaqdadır.

***Əlyazmaları***

*AMEA Əlyazmalar İnstitutu M - 67*

---

[380] Mir Möhsün Nəvvab. Təzkireyi-Nəvvab. Bakı, 1998, s. 379-380.
[381] Гаибли Г. Автограф «Тазкира-и Навваб» как литературно-поэтический источник / Средневековые рукописи и проблемы истории культуры Азербайджана. Материалы научно-теоретической конференции. Баку, 1989, с. 33.
[382] Hacıyeva A. Mir Möhsün Nəvvabın ədəbi-bədii irsi. Bakı, 2004, s. 45.



دیباچه

بسم الله الرحمن الرحیم و به نستعین

ذکر ازل نام خدای ازل | دائم و قائم بود و بی بدل
خامه چو بر توسن کف شد سوار | گشت بمیدان هنر در بار
گوهر معنا چو زکان هنر | گشت هویدا چو خور از باختر
مرغ سخن بال معانی گشاد | تذکره نام خدا کرد یاد
آنکه به تقدیر جهان آفرید | کرد زمین پهن و زمان آورید

**Mir Möhsün Nəvvab. "Təzkireyi-Nəvvab"**
**AMEA Əlyazmalar İnstitutu M – 67**


هو الباقی
تذکره نواب
میر محسن آقا میرزاده
قراباغی در شهر شوشی قراباغ
در ماه صفر المظفر در
شب سه شنبه اختتام
۱۳۱۰
پذیرفت در سنه

**Mir Möhsün Nəvvab. “Təzkireyi-Nəvvab”**
**AMEA Əlyazmalar İnstitutu M – 67**

# XX ƏSR

- Məhəmməd ağa Müctəhidzadə
- İbrahim Tahir Musayev
- Həsənəli xan Qaradaği
- Məhəmmədəli Tərbiyət
- Şəmsəddin xan Həqqi Təbrizi
- Qulam Məmmədli
- Seyid Əbdülhəmid Xalxali
- Əziz Dövlətabadi
- Əli Nəzmi
- Yəhya Şeyda
- Məhəmməd Dəyhim

# MƏHƏMMƏD AĞA MÜCTƏHİDZADƏ

Məhəmməd ağa Müctəhidzadə 1867-ci ildə Şuşa şəhərində anadan olmuşdur. İlk təhsilini də elə burada almışdır. Təhsilini Türkiyədə davam etdirmişdir. Daha sonra Bakıda uzun müddət müəllimlik etmişdir.

M.Tərbiyət "Danişməndani-Azərbaycan"da Müctəhidzadə haqqında yazır: "Adı Mirzə Məhəmməd, Mirzə Sədr Qarabağinin oğludur. O, h.1325/1907-ci ildə Qarabağ şairlərinin tərcümeyi-halı, türk və fars dilində şeirləri haqqında "Riyazül-aşiqin" adlı kitab tərtib etmişdir. Bu kitabın birinci cildi h.1328/1910-cu ildə İstanbulda çap edilmişdir. Bu əsər onun təlifindən əvvəl yazılmış və çap edilmiş "Təzkireyi-Nəvvab" əsərinin türk dilinə tərcüməsidir"[383]. Təbii ki, Müctəhidzadə təzkirəsinin tərcümə olması fikri yanlışdır.

Müxtəlif dillərdə tərtib edilmiş hər iki əsər bir çox özəlliklərə malikdir. İstər əhatə genişliyinə ("Riyazül-aşiqin"ndə 79 söz ustası haqqında Nəvvab təzkirəsi ilə müqayisədə nisbətən səthi sayıla biləcək məlumat verilir. "Təzkireyi-Nəvvab"da oxucuların diqqətinə müxtəlif şairlərin 800-dən çox qəzəl, təxmis, qoşma, müxəmməs, müsəddəs, məsnəvi, rübai kimi müxtəlif janrlı əsərləri təqdim olunduğu halda, Müctəhidzadə təzkirəsində təxminən 2 dəfə az – 400-ə yaxın şeir nümunəsi verilmişdir), istər həcminə ("Riyazül-aşiqin" 286 səhifədən ibarətdir), istərsə də Azərbaycan və ümumilikdə, Şərq təzkirəçilik ənənələrinə gətirdiyi yeniliyinə görə M.M.Qarabağinin (Mir Möhsün Nəvvab – V.M. ) təzkirəsi daha əhəmiyyətlidir[384].

Məhəmməd ağa Müctəhidzadənin tərtiblədiyi "Riyazül-aşiqin" təzkirəsi Qarabağda yaşayan 79 şairdən bəhs edir.

Təzkirəçi əsərinin yazılma səbəbini geniş biçimdə açıqlayır: "Bəndeyi-dərgahi-yəzdani-baqi Məhəmməd bin Mirzə Sədray Qa-

---

[383]M.Tərbiyət. Danişməndani-Azərbaycan. Bakı, 1987, s. 238.
[384] Hacıyeva A. Mir Möhsün Nəvvabın ədəbi-bədii irsi. Bakı, 2004, s. 53-54.

rabaği ühbayi-ruhani və esdeğayi-cani məhzərlərinə belə ərz eliyir ki, əvayili-ömrümdə ləli-Bədəxşan kimi dirəxşan olan loaliyi-dəryayi-fikrətdən bəzisini qəvvasi-təb əlində müayinə edib müştəri olmağıma görə Şişə içrə bulunan ürəfayi-nikfənn və şüərayi-şirinsüxənlərilə ülfət etməgi özümə vacib və lazım hesab edib müsahibət və mücalisət edirdim və səhab təblərindən manəndi-barani-bahar tökülən əşari-abdarlara və dürci-dəhənlərindən dürri-şəhvar kimi nisar olan güftarlara sədəfasa vücudumu sərapa guş edib fəramuş olmamasına kuşiş qılırdım”. Təzkirəçi daha sonra əlavə edir: “...aşiqlərin şeirlərini məşuqların şeirləri kimi pərişan qoymayıb bir yerə cəm qıldım və bir təzkirə yazmaqlığıyla əkslərindən sonra müntəxəbati-nəzmlərini qələm ianətiylə dəftərə səbtü zəbt edəydim, tainki bevaseteyi-təğyiri-zəman və inqilabi-dövran ismü rəsmləri lövhi-xatirdən məhv olub səhifeyi-ruzigardan pozulmasın”.

Müctəhidzadə təzkirə hazırlamaq haqqındakı fikrini Qarabağın tanınmış əyanlarından İsgəndər bəy Rüstəmbəyova bildirmişdir. O isə cavabında “gərək bir tüxmi-yadigar mə məzrəeyi-ruzigaridə əkmək ki, əbnayi-vətən ondan nəfbərdar olsunlar və mütaliəsindən fayidə təhsil edənlər müəllifinə rəhmət oxusunlar” şəklində cavab verərək, bu fikri bəyəndiyini ifadə etmişdir[385].

Təzkirəçi əsərinin strukturu haqqında da ön sözdə bilgi verir: “...Qarabağın şüəralarının əhvalına filhəzə Riyazül-aşiqinə mövsum və iki rövzəyə bir bağçaya məqsum olundu”. Daha sonra hər bir rövzədə hansı şairlərdən bəhs edəcəyini qeyd edir: “Əvvəlinci rövzədə bəyan olunur mütəqəddiminin keyfiyyati-halatı və müntəxəbati-əbyatı. Və ikinci rövzədə zikr edilir mütəəxxerin və müasirinin əhval və ətvarı və müntəxəbati-əşarı. Və bağçada fəqət dərc olunur müəllifin əhvalı və nətayici-xəyalı”.

Təzkirənin ilkin planı iki hissədən ibarətimiş. Birinci hissədə təzkirə tərtiblənərkən dünyasını dəyişmiş şairlər haqqında, ikinci hissədə isə müəllifin müasiri, həyatda olan ədiblər və onların əsərlərindən məlumatlar verilməli idi. Müctəhidzadə təzkirənin ön sö-

---

[385] Məhəmmədağa Müctəhidzadə. Riyazül-aşiqin. Bakı, 1995, s. 7.

zündə əsərinin iki rövzə və bir bağçadan ibarət olduğunu bildirsə də, təzkirənin yalnız birinci rövzəsi nəşr olunmuşdur. Sözügedən digər bölmələrin isə əlyazması belə zamanımıza çatmamışdır. Çox güman ki, müəllif əsərin yalnız birinci hissəsini qələmə ala bilmişdir.

Ə.Bağırov XX əsrin əvvəllərindəki inqilablar dalğasının bu əsərin ikinci cildinin nəşrinə maneçilik törətdiyini qeyd edir[386]. A.Topalova təzkirənin iki cilddə hazırlanmasının nəzərdə tutulmasının əsərin adından da məlum olduğunu yazır və bunu "riyaz" sözünün rövzə ifadəsinin cəmi olduğu ilə izah edir. Əgər kitab bir cild olsaydı, kitabın adı "Riyazül-aşiqin" deyil, "Rövzətül-üşşaq" olardı[387]. Təzkirəçi ön sözdə əsərini "Riyazül-aşiqin" adlandırdığını, iki rövzə və bir bağçaya ayırdığını özü qeyd etmişdir.

Babi-ləfz, aləmi-hikmətdir "Riyazül-aşiqin",
Məzhəri-asari-qüdrətdir "Riyazül-aşiqin".

Seyr qılcaq dəf edər qəmgin könüllər qəmlərin,
Afitabi-ərşi-behcətdir "Riyazül-aşiqin".

Əndəlibani-vətən xoş nəğmələr inşad edir,
Gülüstani-baği-millətdir "Riyazül-aşiqin".

Müştəriyi-Mücəhidzadə müəllifdir ona,
Müştərilərçün səadətdir "Riyazül-aşiqin"[388].

Müctəhidzadə təzkirənin birinci rövzəsinə aşağıdakı sərlövhəni vermişdir: "Əvvəlinci rövzə sükna etdiyimiz diyari-minu

---

[386] Məhəmmədağa Müctəhidzadə. Riyazül-aşiqin. Bakı, 1995, s. 3.
[387] Topalova. Ədəbiyyat tarixinin öyrənilməsində təzkirələrin rolu və Ağa Məhəmməd Müctəhidzadənin «Riyazül-aşiqin» təzkirəsi. Bakı, 2001, s. 61-62.
[388] Yenə orada, s. 58.

asardan rihlət edib darül-qərarda qərar tutan sahibi-təblərin əhval və ətvar və müntəxəbati-əfkar və əbkarlarının bəyanındadır”[389].

Əsərdə şairlər haqqındakı məlumat vəfat tarixlərinə görə təqdim olunmuşdur. Müctəhidzadə şairlərin vəfatından bəhs edərkən müxtəlif cümlələrdən istifadə etmişdir ki, bunlar bir-birini təkrarlamır. Məsələn, “Arif: ömrünün şüşəsi Şuşa şəhərində daşa toxunmaqlıqdan maəda həqir üçün bir məlumat vermədi” (s.38); “Mirzə Məriz: baisi-qürbi-məhbubi-həqiqi dər sənəyi 1264 hicridə məriz olub cami-ölüm şərbətin nuş edir” (s.41); “Hacı Mirzə Əliqulu: Məkkəeyi-müşərrəfədə daiyi-həqqə ləbbeyk deyib icabəti-əmri-həqq edib və həqqi-təalaya əbədi mehman qalmışlar” (s.57); “Nəva: səneyi-min iki yüz həştad dörddə gürgi-əcəl çəngalına giriftar olub” (s. 60); “Fəna: sənəvati-məsihiyyənin min səkkiz yüz altmış yeddincisində aləmi-fənadan dari-bəqaya rihlət buyurub” (s. 62); “Molla Abbas Cavanşir: səneyi-islamiyyənin min iki yüz həştad altıncı ilində dari-fanidən aləmi-baqiyə irtihal edib” (s.81); Salar: ruhi-şərifi aşiyani-qüdsə pərvaz etmiş (s.107); “Səfa: hicrətin min iki yüz doxsan dördüncü ilində münadiyi-həqiqidən nidayiya əyyuhənnəfs əl-mutməinnəhu ərcəi ila rəbbikə raziyyətən mərziyətən fəədxəli fi ibadi və ədxəli cənnəti eşidib, cahanafərinin hökmü ilə mətai-canı vida qılır və həman sərzəmində ki, behişti-bərrindən bir guşədir mədfun və dürri-Nəcəfi tək məknun və gövhəri-məknun kimi dili-xakdə məxzun olur” (s.114).

Təzkirədə bəzi şairlər haqqındakı bio-biblioqrafik məlumatlar geniş, bəziləri isə qısadır. Nümunələrə diqqət yetirək.

Mirzə Həsən: “Bu sahibi-vəchi-hüsn və aşiqi-vəchi-Həsən Mir Cəfər mərhumun xələfi və Əli Məhəmməd ağanın nəbirəsidir. Və mərhum Əli Məhəmməd ağa isə İbrahim Xəlil xan Cavanşirin ən müqərriblərindən birisidir. Əvayili-sinnində tərki-vətəni-məluf edib Şəki şəhərinə müsafirət qılır və rus dəftərxanasında münşilik əmrinə məşğul olur. Və həman sərzəmində irtihali-dari-nəim edir. Əziz qövm olmaqlığına görə o Yusifi-Misri məlahət üçün həmvətəni olan şüəra hər birisi bir ləhn ilə şaxsari-məhəbbətdə mütərən-

---

[389] Müctəhidzadə M. Riyazül-aşiqin. Bakı, 1995, s. 9.

nim olublar. O cümlədən Mirzə Əbülhəsən Şəhid təxəllüs bu fərdi o mərhumun maddeyi-tarixində deyib, münasib olmağına görə dərc olundu. Şəhid qoft be sali-vəfatəş in mesra:

Hezar ah əz in qamət, hezar əfsus.

Xülasə, vəsiyyətinə görə cənazəsini vətəni-əslisi Şuşa şəhərinə həml edib, bir verst şəhərdən kənara dəfn edirlər. Həman mərğzən mərhumun adıyla adlanır ki, əlan Mirzə Həsən qəbristanlığı deyilir. Be hər hal, sahibi-təb imiş. Belə ki, vətəndə olan dilbəri-şirinsüxəndən ayrılan vaxt bu qəzəli inşa edir".

Mirzə Həsənin tərcümeyi-halı təzkirədə verilmiş böyük həcmli məlumatlardandır. Əsərdə haqlarında qısa məlumat verilmiş şairlərə də rast gəlmək mümkündür. Məsələn, Qənbər vələdi-Əli: "Bu, mərhum Kərbəlayi Səfi Valeh təxəllüsün şagirdi və həmvətənidir. Sahibi-təb imiş. Belə ki, atidəki müstəzadı ustadın gözləri ağrayan vaxt betəriği-şuxi inşad edib. Hansı ki, cavabda anfən zikr olundu".

Müctəhidzadə şairlərin şeirlərindən müxtəlif sayda örnəklər vermişdir. Məsələn, Zakirin 23 qəzəlini, 1 müxəmməs və 2 növhəsini, Şəhidin 3 qəzəl, 1 müstəzad, 1 saqinamə, 2 məsnəvi, 1 qitə, 1 qəsidəsini və qəzəliyyat başlığı ilə 17 qəzəlini nümunə olaraq vermişdir. Rusiyah təxəllüslü şairin şeirindən bir beyt örnək vermişdir.

Bəzi şairlərin isə şeirlərindən örnəklər təqdim olunmamışdır. Nümunə olaraq Nigarini göstərmək olar. Təzkirəçi Nigarinin əsərlərindən nümunə verməməyinin səbəbini də izah edir: "Məzhəri-hüsni-təvəccühləri olan Nigari namındakı bir iffət-pənahın ismilə müsəmma olan bir divanı var isə də, bu kitabın heyni-təbində ələ keçirilmədiyi cəhətilə müntəxəbatı ilə təzyini-səhifə müəssər olamadı"[390].

---

[390] Yenə orada, s. 242.

# İBRAHİM TAHİR MUSAYEV

XX əsr təzkirəçilərindən biri də İbrahim Tahirdir. O, 1869-cu ildə Şuşa şəhərində anadan olmuşdur.

Mir Möhsün Nəvvab təzkirəsində İbrahim Tahir haqqında yazır: "Tahirin adı İbrahimdir. Bu təzkirə yazılan vaxt 22-23 yaşı var idi. Xoş əhvallı, düz əxlaqlı bir cavan idi. Məşədi Əbdül Qarabağinin oğludur. Şuşa şəhərinin Çuxur məhəlləsindəndir. Sənəti tacirlikdir. Farsca savadı var. Təxəllüsü Tahirdir"[391]. "Təzkireyi-Nəvvab"da İbrahim Tahirin Azərbaycan və fars dillərində avtoqraf şeirləri də yer almışdır:

Kim mənim tək fikri-zülfündən belə Məcnun olur,
Ruzü şəb həmdərdi vəhşi, məskəni hamun olur?

Gər desəm ərərdürür qəddin sənin, səhv etmişəm,
Sərvü ərər, dilbəra, qanda belə mövzun olur?

Mürşidi-meyxanə qəm dəfinə mey təcviz edər,
Mən bu qana dönmüşü içkəc, qəmim əfzun olur.

Təxti-naz üzrə gedərsən xabi-nazə naz ilə,
Firqətində hali-aşiq bilməyirsən çun olur?

Arizin dövründə xalın öyrə rənadır sənin,
Həsrətindən gülşən içrə lalələr dilxun olur.

Söylə, yəğma eyləsin könlüm o çeşmi-məstinə,
Xəlq içində məst olan hər barədən mövzun olur.

Mərhəmət çeşmilə bir bədbəxtə gər qılsan nəzər,

---

[391] Mir Möhsün Nəvvab. Təzkireyi-Nəvvab. Bakı, 1998, s. 506.

Ol kəsin bişəkkü şübhə taleyi məmnun olur.

Nə təəccüb, Tahirin olsa qiyamət sözləri,
Qaməti-rənayə, maildir, sözü mövzun olur[392].

Fars, ərəb və rus dillərini mükəmməl şəkildə öyrənmişdir. Şeirlərini "Tahir" təxəllüsü ilə yazmışdır. "Şərqi-rus", "İrşad", "Dəbistan", "Həqayiq", "Füyuzat" kimi dövri mətbuat orqanlarında şeir və məqalələrlə çıxış etmişdir. İ.T.Musayev bədii yaradıcılıqla yanaşı, tərcüməçilk fəaliyyəti ilə də tanınmışdır. Dos. R.Kərimov Ə.Firdovsi, Ö.Xəyyam, Ə.Xəqani, N.Gəncəvi kimi böyük sənətkarların əsərlərinin Azərbaycan dilinə hərfi tərcüməsinin Ədəbiyyat və Dil İnstitutu tərəfindən İbrahim Tahirə sifariş edildiyini yazır[393].

XX əsrdə tərtib olunmuş təzkirələr sırasına İbrahim Tahir Musayevin 1918-ci ildə qələmə aldığı ***"Riyazül-arifin"*** təzkirəsi də daxildir. Əsər Rzaqulu xan Hidayətin "Məcməül-füsəha"sının, demək olar ki, Azərbaycan dilinə tərcüməsidir. Azərb. MEA Əlyazmalar İnstitutunda D-207 şifrəsi altında mühafizə olunan təzkirənin həcmi 52 vərəqdir.

İ.T.Musayev əsərin ön sözündə təzkirənin tərcümə edilməsinin səbəblərini bu şəkildə izah edir: "İşbu təzkirə "Riyazül-arifin" namı ilə müsəmma olub Əmirüş-şüəra ləqəbi və Hidayət təxəllüsüylə məşhur olan ədibi-möhtərəm və ustadi-əzəm Rzaqulu xan mərhumun asari-ədibanələrindəndir. Bu təzkirənin fars dilində yazılan cümlə təzkirələrə təfəvvüqi və söygülü vətənimiz Azərbaycan övladının ondan istifadə edəcəkləri məlhuz olduğından naşi Qarabağ nahiyəsi məarif şöbəsi müdiri Əliabbas Müznib Əfəndinin əmr və tənbehi üzərə fars dilindən türk dilinə tərcümə etdüm. İştə bəəz ədəbiyyat maraqlıları "bu tərcümə sırf türk dilində nə içün yazılmamış" deyə bəni məlamət edəcəklərini bildigimdən

---

[392] Yenə orada, s. 511-512.
[393] Kərimov R. İbrahim Tahir Musayevin həyat və yaradıcılığı // Müasir şərqşünaslığın aktual problemləri, Bakı, 2011, s. 166.

dolayı bir kaç kəlmə qareyini-gerami təsəddi etməgə məcbur oldum. Əvvəla bir tərcümənin sırf türk dilində yazılması tərcümənin qiyməti-ədəbiyyəsini ixlal edəcəgi gizlədiləcək həqiqətlərdən degildir. Zira ki, dilimizdə istemal olunan kəlmələrin dörtdə üç kəlməsi ya ərəb və ya fars kəlmələri olduğu və lisanımızın həman dillər sayəsində zənginləşdigi bir halda bənim gibi bir kaç bisavadın tənşiti-xatirəsi içün tərcüməyi sırf türk dilində yazmaq əsəri təzyifdən başqa bir işə yaramaz. Və bisavad olanlar da okur, yazar, ögrənər. İştə ifadati-acizanəmə şahid olaraq bunı ərz edirəm ki, əski və sırf türk dilinə tərcümə edilmiş üç cild Təbəri-tarixini nəzəri mütaliəyə alar isəniz...

Tarixi-məşhurun sırf türk dilinə tərcümə edilməsi tarixi məzburun qiyməti-ədəbiyyəsini büsbütün itirdigini anlarsınız zənnindəyəm və bununla bərabər bu tərcümə ilk tərcümə etdigim əsər olub, imla və inşa və bəzi ədəbi nöqsanlardan varəstə olmadığından zahib və müərrif oldığından dolayı əfviyyəti bala-pərvarani-ədəbdən rica və iltimas edərəm. Mütərcimi: İbrahim Tahir Musayev Qarabaği. Təhrirən fi şəhri cəmadiyül əvvəl 1338”[394].

İ.T.Musayev təzkirənin əvvəlində yer almış “Elan” hissəsində Əliabbas Müznibin Azərbaycana dair böyük bir tarix yazdığını qeyd edir: “Bu tərcümədən sonra Əliabbas Müznib Əfəndinin ehtimamı sayəsində Azərbaycan toprağına dair bir böyük tarix vücuda gətiriləcəgini və həman yerlərdən zühur edən üləma və ürəfa və şüəra və vəqtilə icrayi-hökm və nüfuz edən səlatini-əzəm və xəvanini-baehtişamın şərhi-halları və məmaliki-məzkurda vüqu bulan vəqayeyi-cəmiyeyi-tarixiyyənin müfəssəl surətdə yazılacağı və beqədri-imkan ələ gələn şüəra və ürəfa və padşah və xanların həman tarixdə surətlərinin tərəssimi tərəfdarani-məarif və ədəbə və söygülü vətənimizin övladına ayrıca təbşir və ixtar edərəm”[395].

Təzkirədə şairlər haqqında verilən məlumatlar çox qısadır. İ.T.Musayev tərcüməyə bəzi şairlər haqqında öz əlavələrini də etmişdir. A.Topalova “Riyazül-aşiqin”in Azərbaycan təzkirəçiliyinə

[394] Musayev İ.T. Riyazül-arifin. AMEA Əlyazmalar İnstitutu D-207.
[395] Yenə orada, vər. 1 a.

yenilik gətirmədiyini yazır və əsəri tənqid edir: "İbrahim Tahir təzkirəsi orta əsrlər Azərbaycan təzkirəçiliyinə, demək olar ki, heç nə əlavə etməmiş, Rzaqulu xan təzkirəsinin Azərbaycan türkcəsinə zəif tərcümə olunmasından irəli gedə bilməmiş, Azərbaycan ədəbiyyatşünaslıq fikrini zənginləşdirməyə nail olmamışdır"[396].

Dos. R.Kərimov isə A.Topalovanın əksinə, İ.T.Musayevin özündən sonra zəngin bir irs qoyub getdiyini, onun Azərbaycan, qismən də fars dilində olan bədii irsinin bu günə kimi ədəbi ictimaiyyətə təqdim olunmadığını xüsusi qeyd edir[397].

***Əlyazmaları***

*AMEA Əlyazmalar İnstitutu D – 207.*

---

[396] Topalova A. Ədəbiyyat tarixinin öyrənilməsində təzkirələrin rolu və Ağa Məhəmməd Müctəhidzadənin "Riyazül-aşiqin" təzkirəsi. Bakı, 2001, s. 37.

[397] Kərimov R. İbrahim Tahir Musayevin həyat və yaradıcılığı // Müasir şərqşünaslığın aktual problemləri, Bakı, 2011, s. 167.




**İbrahim Tahir Musayev. “Riyazül-arifin”**
**AMEA Əlyazmalar İnstitutu D-207**

# HƏSƏNƏLİ XAN QARADAĞİ

Ata-babası Cənubi Azərbaycanın Qaradağ mahalından olan Həsənəli xan Qaradaği 1847-ci ildə Şuşa şəhərində hərbi xidmətçi ailəsində anadan olmuşdur. Hələ ana bətnində ikən atası vəfat etdiyi üçün atası Həsənəlinin adını ona qoymuşlar. Ailəsi və qohumları Həsənəli ağanı xatırlayaraq, həmişə onu "Balaca ağa" deyə çağırarmışlar. O, Şuşanın yaşlıları arasında həmin adla məşhur olmuşdur[398].

"Məclisi-fəramuşan" üzvlərindən olan və dövrünün tanınmış ziyalısı və pedaqoqu Həsənəli xan haqqında ilk məlumatı Nəvvab təzkirəsindən alırıq. Nəvvab oun Balaca ağa Xan Qaradaği kimi təqdim edir: "Cənab Balaca ağa atası Həsənəli ağa ilə eyni adda olub, təxəllüsü Xan Qaradağidir. Əcdadı Səfəvi padşahlarının hüzurunda xəlifələr xəlifəsi mənsəbində olub. İndi Həsənəli ağanın 45 yaşı var. Şeirləri pərakəndədir, divanı yoxdur. Rus millətinin şairlərindən olan Krılovun bəzi təmsillərini nəzmlə tərcümə edib"[399].

Atası vəfat edəndən sonra dünyaya göz açan Həsənəli əmisi Məhəmməd Hüseyn ağanın himayəsində böyümüşdür. Rus dilini öyrənmək məqsədilə əmisi onu yeddi-səkkiz yaşlarında Şuşa qəza məktəbinə qoyur. Həsənəli burada oxuyarkən əmisi Tiflisə köçür. 1866-cı ildə Qaradaği bu məktəbi bitirir.

Həsənəli xan Şuşa məktəbində oxuyan zaman boş vaxtlarında müstəqil olaraq mütaliə ilə məşğul olardı. Həm də Şuşa rus-tatar məktəbinin müəllimi olan Mirzə Bəşir Yusifzadənin atasından ərəb və fars dillərini öyrənir. O öz müəlliminin yanında və evdə görkəmli Şərq klassiklərinin əsərlərini mütaliə etməklə bəra-

---

398 Qaradaği (Xan-Qaradağski) Həsənəli ağa. Fələyin bir belə dövrü olacaqmış...(şeirlər, tərcümələr, tarixi salnamə) / Tərtib ed. R.Kərimov; ön sözün müəl.: V.Qaradağlı. Bakı: «Azərbaycan Milli Ensiklopediyası» NPB, 2003, s. 17.

399 Mir Möhsün Nəvvab. Təzkireyi-Nəvvab. Bakı, 1998, s. 166-167.

bər, özü də tək-tək şeir yazmağa başlayır. Səbirlə, inadla və müntəzəm çalışması sayəsində elm-bilikdə olduğu kimi, şeirdə də artıq şəhər əhalisinin hörmətini qazanır. Təxminən 1868-ci ildən H.Qaradaği məktəbdarlıq etməyə başlayır. Qaradaği 1873-cü ilə kimi Şuşada məktəbdarlıq etmişdir[400].

Tiflisdə Zaqafqaziya sərdarının yanında məsul vəzifədə çalışan əmisi Məhəmməd Hüseyn ağa Şuşaya gələndə Həsənəli xanın rusca, farsca və ərəbcə savadını görüb onu öz yanına aparır. Burada Həsənəli xan əmisinin Avropa, rus və Şərq ədəbiyyatı ilə zəngin kitabxanasından istifadə edir. O, Tiflisdə fransız dilini də öyrənməyə başlayır.

Beş ilə yaxın Tiflisdə qalan Qaradaği 1878-ci ilin əvvəllərində Şuşaya qayıdır, yenə də məktəbdarlıqla məşğul olur. Heç bir dərslik olmadığı üçün Qaradaği axşamlar səhər deyəcəyi dərsin mətnini hazırlayardı. H.Qaradağinin yazdığına görə, ana dili dərsliklərində özü yazdığı kiçik şeirlərdən və Krılovdan tərcümə etdiyi təmsillərdən, təlimdə isə rus pedoqoqu Uşinskinin metodundan istifadə edərmiş.

1929-cu il dekabr ayının 2-də Həsənəli ağa Xan Qaradağski Şuşa şəhərində vəfat etmişdir.

Qaradağinin ədəbi irsi qəzəl, qəsidə, müxəmməs, müstəzad, uşaqlar üçün yazılmış kiçik həcmli şeirlər, Krılovdan etdiyi tərcümələr və s. ibarətdir.

Həmin şeirlərin bir qismi AMEA Əlyazmalar İnstitutundakı müxtəlif əlyazmalar, cüng və fraqmentlərdə mühafizə olunur.

Mir Möhsün Nəvvab, Həsənəli xan Qaradağini zəmanəsinin ən arif şəxslərindən biri adlandırır. "Təzkireyi-Nəvvab"a avtoqraf şeirlərini gec göndərdiyi üçün Nəvvab şairdən şikayət edir: "Bu cənab "Məclisi-fəramuşan"ın üzvlərindən biri olmasına baxmayaraq, həyatda olan bütün Qarabağ şairləri böyük həvəslə öz şeirlərini öz dəsti-xətləriylə yazıb, bu təzkirədə qeyd etmək üçün göndərdikləri halda, o, vaxtı-vaxta satmış, öz şeirlərini verməyi bu

---

400 Qaradaği (Xan-Qaradağski), Həsənəli Xan. Əsərləri. Bakı: "Şuşa" nəşriyyatı, 2004, s. 8.

gün-sabaha salmış, iki il səhlənkarlıq etmişdir”[401]. Təzkirədə Həsənəli xan Qaradağinin avtoqraf şeirləri də yer almışdır.

Həsənəli ağa Xan Qaradağinin Qarabağ tarixinə dair “Qarabağ vilayətinin qədim və cədid keyfiyyət və övzaları, Pənah xan, İbrahim xan və Mehdiqulu xan əyyami-hökumətlərinin əksər vəqaye və hekayətləri” adlı əsərini tarixçi alim Nazim Axundov tərtib etmiş olduğu “Qarabağnamələr” kitabına Mirzə Adıgözəl bəyin “Qarabağnamə”, Mirzə Camal Cavanşirin “Qarabağ tarixi”, Mir Mehdi Xəzaninin “Kitabi-tarixi-Qarabağ”, Mirzə Yusif Qarabağinin “Tarixi-şərif”, Rzaqulu bəy Mirzə Camal oğlunun “Pənah xan və İbrahim xanın Qarabağda hakimiyyətləri və o zamanın hadisələri”, Əhməd bəy Cavanşirin “Qarabağ xanlığının 1747-1805-ci illərdə siyasi vəziyyətinə dair”, Mirzə Rəhim Fənanın “Tarixi-cədidi-Qarabağ”, Həsən İxfa Əlizadənin “Şuşa şəhərinin tarixi” adlı əsərləri ilə birgə daxil etmişdir[402]. Həsənəli ağa Xan Qaradaği Şuşaya həsr etmiş “Qarabağ şəhəri” adlı əsərin də müəllifidir.

Həsənəli xan ***“Təzkireyi-Qaradaği”*** adlı təzkirə qələmə almışdır. Akademik F.Qasımzadə XIX əsr Azərbaycan ədəbiyyatını təhlil edərkən bu təzkirənin adını çəkir və Əlyazmalar İnstitutunda inv. 7602 şifrəsi ilə mühafizə olunduğunu qeyd edir[403]. Ə.Axundov da Sarı Aşıqdan bəhs edərkən yazır: “Sarı Aşıq haqqında ilk məlumatı Xan Qaradağski vermişdir”[404]. N.Qarayev Qaradağinin “əsasən Qarabağ şairlərindən ibarət kiçik bir təzkirəsi olduğunu və çox güman ki, əsəri Azərbaycan Xalq Maarif Komissarlığının tapşırığı ilə şairlər haqqında materiallar əsasında tərtib etdiyini” göstərir[405].

Lakin təzkirəni əldə edə bilmədiyimiz üçün yalnız bu məlumatlarla kifayətlənməli oluruq.

---

[401] Yenə orada, s. 166.

[402] Qarabağnamələr / Tərtib edəbi və çapa hazırlayanı N.Axundov. 2-ci kitab, Bakı, Yazıçı, 1991, s. 350.

[403] Qasımzadə F. XIX əsr Azərbaycan ədəbiyyatı tarixi. Bakı, 1974, s.50.

[404] Axundov Ə. Sarı Aşıq. Şeirlər. – Bakı: Azərnəşr, 1966, s. 3.

[405] Poetik məclislər / Toplayanı və tərtib edəni N.Qarayev. Bakı: Yazıçı, 1987, s. 311; Qarayev N. XIX əsr Azərbaycan ədəbi məclisləri. – Bakı: 2010, s. 234.

Həsənəli xanın həyat və yaradıcılığı haqqında ilk geniş tədqiqatı N.Qarayev aparmışdır. Alim 1971-ci ildə müdafiə etdiyi dissertasiyasında Qaradağinin yaradıcılığını öyrənmiş, "Məclisi-fəramuşan"dakı fəaliyyətini təhlil etmişdir[406]. Bundan əlavə N.Qarayev "XIX əsrin ikinci yarısında Azərbaycanın görkəmli maarifpərvər şairlərindən Həsənəli Xan Qaradaği" adlı kitab hazırlamışdır. Kitabda Qaradağiyə dair sənədlərin fotosurətləri də yer almışdır[407]. Təəssüf ki, kitab hələ də nəşr olunmamışdır.

R.Həsənovanın 1961-ci ildə nəşr etdirdiyi "Həsənəli ağa Xan Qaradaği haqqında yeni materiallar" adlı məqaləsində pedaqoji fəaliyyətindən və tərcümə əsərlərində bəhs olunmuşdur[408].

---

[406] Qarayev N. XIX əsr Azərbaycan ədəbi məclisləri. – Bakı: 2010, s. 235.

[407] Qarayev N. XIX əsrin ikinci yarısında Azərbaycanın görkəmli maarifpərvər şairlərindən Həsənəli Xan Qaradaği. - Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutu Elmi Arxivi, N.Qarayevin şəxsi arxivi, şifrə 179 (əlyazma, kiril əlifbası ilə, makina çapı). 143 s.

[408] Həsənova R. Həsənəli Ağa Xan Qaradaği haqqında yeni materiallar // S.M.Kirov adına ADU-nun Elmi əsərləri, 1961, № 1, s. 15-23.

# ŞƏMSƏDDİN XAN HƏQQİ TƏBRİZİ

XX əsr Azərbaycan təzkirəçilərindəndir. Müəllif təbrizlidir, polis zabiti vəzifəsində çalışmışdır. Ömrünün sonlarında görmə qabiliyyətini itirmişdir. H.ş. 1321/m. 1942-ci ildə Məşhəddə vəfat etmişdir.

Şəmsəddin xan Həqqi Təbrizi ***"Əncümənül-üdəba"*** adlı təzkirəsini h.ş. 1307-1310/1928-1931-ci illər arasında farsca qələmə almışdır. Müəllif farsca şeir yazan şairlərə həsr etdiyi bu təzkirəni Əli Rza mirzə Şöhrə Qacarın "Bosatinül-xaqaniyyə" əsərini təqlidən yazmışdır. O mənada ki, hər cildin əvvəlində ərəb əlifbası sırası ilə şairlərin siyahısı verilmiş, daha sonra onların tərcümeyi-halları, axırda isə şeirlərindən nümunələr əksini tapmışdır.

Təzkirə 3 qismətə və 9 cildə ayrılmışdır. Ə.G.Məani "Əncümənül-üdəba"nın ilk üç cildini şəxsən görüb istifadə etsə də, sonrakı cildlərə nəzər salmadığını ifadə etmişdir. Belə ki, əsərin ilk üç cildinin əlyazması Ə.G.Məaninin ziyalı dostu Əbdülhüseyn Bayatın şəxsi kitabxanasına məxsus imiş. "Qədim dövr şairləri"nə ("mütəqəddimin") həsr olunmuş birinci qismət bir cilddən ibarətdir. Burada farsdilli poeziyanın başlanğıcından h. 1000/1591-ci ilə qədər yazıb-yaratmış 1378 şairdən bəhs edilmişdir. Əlyazma 735 səhifədən ibarətdir və 32,2 x 23 sm. ölçüsündədir. İkinci qismətə aid olan II və III cildlər isə "orta dövr şairləri"ndən ("mütəvəssitin") bəhs edir. Burada toplam 4629 şair əhatə olunmuşdur. Əlyazma 1375 səhifə həcmindədir.

Təzkirənin üstün cəhətlərindən biri odur ki, müəllif əsas etibarilə öz məxəzlərini göstərməyi lazım bilmiş və hər şairin tərcümeyi-halının sonunda bu məlumatların hansı qaynaqların hansı səhifələrindən götürüldüyünü qeyd etmişdir. O, öz təzkirəsini hazırlayarkən aşağıdakı mənbələrdən yararlanmışdır: "Lübabül-əlbab", "Təzkireyi-Dövlətşah", "Təzkireyi-meyxanə", "Sərvi-azad" ("Məasirül-kəram"), "Təzkireyi-müasirin", "Miratül-xəyal",

“Atəşkədə”, “Məcməül-füsəha”, “Bəyanül-Mahmud”, “Riyazül-arifin”, “Bostanül-üşşaq” (“Bosatinül-xaqaniyyə”nin ilk cildi), “Nigaristani-Dara”, “Mədayihül-Hüseyniyyə”, “Gənci-şayəgan”, “Sübhi-gülşən”, “Nigaristani-süxən”, “Nümuneyi-ədəbiyyati-tacik”, “Ərməğan” jurnalının V buraxılış ilinə aid sayları, “Asarül-Əcəm”. Əksər şairlərin həyatı haqqında məlumatlar qısadır və bir-iki sətirdən çox deyildir.

Lakin təəssüf ki, müəllif özü ali təhsilli şəxs olmadığı üçün müəyyən yanlışlıqlara yol vermişdir. Məsələn, o, bəzi hallarda bir şair haqqında müxtəlif təzkirələrdən götürdüyü məlumatların ayrı-ayrı şairlərə məxsus olduğunu zənn etmiş və beləliklə, eyni şair haqqında bir neçə yerdə məlumat vermişdir. Həmçinin onun bir sıra şeirləri xətalı şəkildə köçürdüyü nəzərə çarpır.

Haqqında bəhs etdiyimiz ilk üç cildi müəllif öz qardaşına hədiyyə etmişdir. Cildlərin hər birinin sonunda müəllifin öz təzkirəsininin tərtibinə dair şərhi əksini tapmışdır. Onlardan biri belədir: “Bir müddətdir ki, farsdilli ədiblərin və şairlərin əsərlərinin toplanması ilə məşğul idim. Öz ciddi-cəhdimin sayəsində və vaxtın müsaidəsi ilə 10 min nəfər şairin əsərlərini (şeirlərindən örnəkləri – V.M.) toplamağa müvəffəq oldum. Hal-hazırda öz topladıqlarımın nöqsanlarını aradan qaldırmaqda və onu təkmilləşdirməkdəyəm. Həmin çoxsaylı əsərlərdən götürdüyüm nümunələr təxminən 9 cilddə tərtib edilmiş və cildlənmişdir. İlk öncə, iki il bundan əqdəm səkkizinci imam Əli ibn Musa ər-Rza həzrətlərinin ziyarəti şərəfinə nail olduğum zaman qədim şairlərə həsr etdiyim birinci cildin ilk nüsxəsini izzət, hörmət və şərəf sahibi olan, ədəbiyyatı sevən və incəlikləri bilən doğma can qardaşım Həmzə xan Həqqi cənablarına təqdim etdim. Orta dövr şairlərindən bəhs edən qisməti həmin bu ilk cildini də onun hüzuruna təqdim edəcəyəm. Ümidim odur ki, bu qəribin əsəri mütaliə edilsin, dərbədər və miskin vəziyyətə düşməsin və qısa müddətdə unudulanlardan birinə çevrilməsin. Həmçinin bu bəndənin taqətinin fövqündə olan zəhmətləri dünyanın və zamanın keşməkeşli hadisələrindən toxunulmaz

qalsın. 1311-ci şəmsi ilinin şaban ayının əvvəlində Məşhəddə ... qələmə alındı. Sultan Şəmsəddin Həqqi".

Təzkirənin sonuncu, üçüncü qisməti müasir şairlərin həyat və yaradıcılığına aiddir və 6 cilddən ibarətdir. Ə.G.Məani bu cildlərin əlyazmasını görməsə də, onların Məşhəd şəhərində müəllifin qohumlarından birinin evində saxlandığını qeyd etmişdir. Tədqiqatçının bildirdiyinə görə, təzkirəçi sonrakı illərdə də öz əsərinə əlavələr etmiş və oradakı şairlərin ümumi sayını 12 min nəfərə çatdırmışdı[409].

[409] Məani Ə.G. Tarixi-təzkirəhayi-farsi. I c., s. 57-59.

# MƏHƏMMƏDƏLİ TƏRBİYƏT

Görkəmli Azərbaycan alimi Məhəmmədəli Tərbiyət 1875-ci ildə Təbrizdə anadan olmuşdur. Tanınmış bir ailənin övladıdır. Atası Mirzə Sadıq xanın soyu əfşar tayfasından olan Nadir şahın münşisi "Tarixi-cahangüşayi-Nadiri" əsərinin müəllifi türk əsilli Mehdi xana çatır[410]. Tərbiyət ibtidai təhsilini Təbrizdə Molla Zeynalabidinin məktəbində almışdır. Nücum, riyaziyyat və tibb elmlərini, fransız və ingilis dillərini öyrənmişdir[411]. Tərbiyət Təbrizin tanınmış həkimlərindən Mirzə Nəsrullaxanın və 1896-cı ildən bir neçə il Təbrizdə yaşayan Məhəmmədxan Kufrinin yanında Avropa və Şərqin tibb elmindən dərs alaraq, bu iki alimin tövsiyəsi ilə fransız və ingilis dillərini təkbaşına öyrənmişdir.

1894-1895-ci illərdə Təbrizdə hökumət vəsaiti ilə idarə olunan Müzəffəriyyə mədrəsəsində, 1898-1912-ci illərdə isə Loğmaniyyə mədrəsəsində dərs demişdir. M.Tərbiyət XIX əsrdə Təbrizdə açılan Avropa tipli əczaxananın yaradıcılarından biridir. Tərbiyət Seyid Məhəmməd Şəbüstəri, Seyid Hüseynxan Ədalət və b. ilə birlikdə 1896-cı ildə Təbrizdə yeni üsula idarə olunan ilk kitabxananın əsasını qoymuşlar. Bu kitabxananın bölməsi Tehranda da açılmışdır. 1898-ci ildən başlayaraq Tərbiyət Azərbaycanda daha çox irəliləyən maarifçilik hərəkatında yaxından iştirak etmişdir. O, XIX əsrin sonları və XX əsrin başlanğıcında Azərbaycanın bir çox siyasi xadimləri ilə birlikdə azadlıq hərəkatına qoşulmuşdur[412].

Tərbiyət Asiya, Afrika və Avropanın bir çox ölkələrində çap olunan kitab, jurnal və qəzetləri gətirərək bu kitabxana vasitəsilə oxuculara çatdırırdı. O, 1902-ci ildə "Gəncineyi-Fünun" jurnalını

---

[410] Kurtuluş R. Muhammed Ali Terbiyet. DİA. 30. c., İstanbul, 2005, s. 503.

[411] Geniş məlumat üçün bax: "Tərəqqi" qəzeti 29 sentyabr 1909, "Kavə" qəzeti 9 may 1921, "Şəfəq" qəzeti 1945, N 1, "Azərbaycan" jurnalı 1340, N 1, "Varlıq" 1981, N 1.

[412] Tərbiyət Məhəmmədəli. Danişməndani-Azərbaycan: Azərbaycanın görkəmli elm, sənət adamları Bakı, 1987, s. 5.

Təbrizdə nəşr etmişdir. Az müddət içərisində Azərbaycan və İranda şöhrət tapmış bu jurnalı hökumət bağlamışdır.

“Hünəramuz”, “Təməddünati-qədimə”, “Zad-bum” və “Təqvimi-Tərbiyət” Tərbiyətin gənclik illərində yazdığı əsərlərindəndir. 1903-1911-ci illərdə illərdəki yaradıcılığında jurnalistika fəaliyyəti geniş yer tutmuşdur.

Birinci dünya müharibəsinin sonunadək Tərbiyət İstanbulda yaşamışdır. 1921-1925-ci illərdə Cənubi Azərbaycanın maarif idarəsinin rəisi olmuşdur. Tərbiyət 1940-cı ildə Tehranda vəfat etmişdir.

Məhəmmədəli Tərbiyət tərəfindən farsca tərtib olunmuş ***“Danişməndani-Azərbaycan”*** adlı təzkirənin birinci cildi h. 1314/ 1935-ci ildə Tehranda nəşr olunmuşdur. Məhəmməd Naxçıvaninin yazdığına görə, təzkirənin ikinci cildinin əlyazması müəllifin ailəsindədir[413]. Tərbiyətin uzun illər apardığı araşdırmaların nəticəsi olan bu təzkirədə Azərbaycanın tanınmış şair, yazıçı, filosof və təbiblərin  həyatı haqqında əlifba prinsipi əsasında məlumat verilmiş və əsərlərindən nümunələr təqdim olunmuşdur. Təzkirədə yer alan nümunələrin böyük bir qismi fars dilindədir. Əsərin fars dilindəki nəşrinin ön sözü Ağayi-Həsən İsfəndiyari tərəfindən yazılmışdır.

“Danişməndani-Azərbaycan”ı təzkirələr təzkirəsi hesab etmək olar. Çünki Məhəmmədəli Tərbiyət əsərini hazırlayarkən bir sıra dəyərli təzkirələrdən bəhrələnmiş və demək olar ki, təzkirədəki məlumatların çoxunu olduğu şəkildə vermişdir. Təzkirənin mənbələri aşağıdakılardır: “Təraiqül-həqayiq”, “Gülüstani-hünər”, “Nücumüs-səfa”, “Tarixül-hükəma”, “Həşt behişt”, “əş-Şəqayiqün-nümaniyyə”, “Riyazül-üləma”, “Təzkireyi-Nəsrabadi”, “Ruzirövşən”, “Töhfeyi-Sami”, “Təzkireyi-Dilgüşa”, “Rövzeyi-əthar”, “Səadətnamə”, “Məcməül-xəvas”, “Xülasətül-əşar”, “Ərəfatül-aşiqin”, “Bəyazi-Saib”, “Şəmi-əncümən” və s.

Təzkirənin sonunda Azərbaycanda və ya Azərbaycanla əlaqədar xaricdə çıxmış 110 qəzet-jurnal haqqında müxtəsər məlumat verilmişdir.

---

[413] Yenə orada, s. 11.

Görkəmli alim Məmmədəli Tərbiyətin əsərlərinin müəllifin doğma ana dilinə tərcüməsi Azərbaycan alimlərinin qarşısında duran mühüm vəzifələrdən idi. İllər keçdikcə Tərbiyətin ədəbi irsinin elmi əhəmiyyəti daha da aydınlaşmışdır[414]. Bu əsər Qafar Kəndli və İsmayıl Şəms tərəfindən fars dilindən Azərbaycan dilinə tərcümə edilmişdir. Təzkirənin tərcüməsi zamanı bir neçə dəyişiklik edilmişdir. Belə ki, əsərin orijinalında şəxsiyyətlərin, eləcə də qəzet və jurnalların adı, əski əlifba sırası ilə, tərcümədə isə kiril əlifbası ilə təqdim olunmuşdur. Kitabda adları çəkilmiş əsərlərin adı olduğu kimi saxlanılmış, ilk dəfə adı çəkilən kitabın qarşısında tərcüməsi də verilmişdir.

Azərbaycan təzkirəçiləri və ədəbiyyatşünasları içərisində Tərbiyət birinci şəxsdir ki, ədəbi-estetik fikir tariximizin yazılı səhifələrinin VII əsrdən başlaması ideyasını irəli sürmüşdür[415].

K.Məmmədova təzkirə üzərində apardığı araşdırmalara əsasən Azərbaycan intibah mədəniyyətinin XII əsrin əvvəllərindən başlayaraq yeni uğurlar qazanmış nümayəndələrinin hər birinin ayrı-ayrılıqda Tərbiyət tərəfindən öyrənildiyini və bununla da bu dövrün ədəbi panoramasının "Danişməndani-Azərbaycan" təzkirəsində geniş şəkildə öz əksini tapdığını yazır[416]. Tədqiqatçı "Danişməndani-Azərbaycan"da XIX əsr və XX əsrin əvvəllərinin ədəbi mühitini bütün reallıqları ilə işıqlandıra bilmədiyini, təzkirədə XIX əsr Şimali Azərbaycanın görkəmli şair və ədiblərindən A.Bakıxanov, Q.Zakir, S.Ə.Şirvani, M.Nəvvab, Müctəhidzadə, Sabir haqqındakı bilgilərin çoxunun adi məlumat xarakterli olduğunu bildirərək tənqid edir.

F.ü.f.d. P.Kərimov XVII əsrin Azərbaycan poeziyasının inkişafında mühüm mərhələ olduğunu, mənbələrdə isə bu dövrün nü-

---

[414] Tərbiyət Məhəmmədəli. Danişməndani-Azərbaycan: Azərbaycanın görkəmli elm, sənət adamları. Bakı, 1987, s. 16.

[415] Məmmmədova K. Azərbaycanda təzkirəçilik ənənəsi və Məhəmmədəli Tərbiyətin «Danişməndani-Azərbaycan» təzkirəsi: Filol. elm. nam…dis. avtoref. Bakı, 2005, s. 20.

[416] Yenə orada, s. 22.

mayəndələri haqqında kifayət qədər məlumata rast gəlinmədiyini yazır. M.Tərbiyət də bu çətinliklərlə rastlaşmış, imkan daxilində bu zaman yaşamış şairlər, onların həyat və yaradıcılığı, bəziləri arasındakı qarşılıqlı münasibətlər barədə dəyərli məlumatlar, əsərlərindən nümunələr verilmişdir. Təzkirədə XVII əsrin Saib, Qövsi, Uğurlu xan Ziyadoğlu Müsahib, Tərzi Əfşar, Təsir kimi daha çox tanınmış sənətkarları ilə bərabər Məhəmməd Əmin Ağası, Alim, Arif, Bəxti, Molla Nəsrulla Xalxali Vaqif, Molla Rəcəbəli Vahid, Danişmənd, Zahid, İbrahim Ordubadi, İsa bəy, Məxmur, Sabit, Sayır Ordubadi, Təzriqi, Təskin, Ülfət, Molla Heydərəli Faiz, Hüseyn bəy Xüruşi və b. kimi onlarca adı ədəbiyyat tarixinə düşməmiş şairlər barədə məlumata rast gəlirik. M.Tərbiyətin "Danişməndani-Azərbaycan" əsərində XVII əsrdə yaşamış, Hindistana mühacirət etmiş şairlərdən Zaman, İbrahim Ordubadi, İsmayılxan Təbrizi, Məhəmməd Hüseynbəy Məlum və başqaları haqqında məlumat verilir[417].

Təzkirədə 919 nəfər şairin həyat və yaradıcılığı haqqında məlumat və əsərlərindən nümunələr öz əksini tapmışdır. K.Məmmədova "Danişməndani-Azərbaycan" əsərini müəllifin uzunmüddətli, geniş tədqiqatının nəticəsi olaraq ağır zəhmət bahasına yazıldığı və demək olar ki, özündən əvvəlki bir çox Azərbaycan və İran təzkirələrinə, müxtəlif tarixi əsərlərə istinad etdiyi üçün bioqrafik və biblioqrafik məlumatın dolğunluğu baxımından təzkirələrin ən mükəmməli adlandırır[418].

---

[417] Kərimov P. Məmmədəli Tərbiyətin «Danişməndani-Azərbaycan» əsəri XVII əsr şairlərimiz haqqında // Filologiya məsələləri. – 2007. - № 5. s. 19.

[418] Məmmmədova K. Azərbaycanda təzkirəçilik ənənəsi və Məhəmmədəli Tərbiyətin «Danişməndani-Azərbaycan» təzkirəsi: Filol. elm. nam…dis. avtoref. Bakı, 2005, s. 18.

## QULAM MƏMMƏDLİ

Publisist, teatrşünas, salnaməçi, 1950-ci ildən Azərbaycan Yazıçılar İttifaqının üzvü, Azərbaycanın Əməkdar Mədəniyyət işçisi (1977), Azərbaycan Jurnalistlər Birliyinin "Qızıl qələm" mükafatı laureatı (1972), əmək veteranı (1976), Azərbaycanın Əməkdar jurnalisti (1984), İttifaq əhəmiyyətli təqaüdçü (1987), M.F.Axundov adına ədəbi mükafat laureatı (1989) olan Qulam Məmmədli orijinal həyat yolu keçmişdir.

Qulam Məmmədli 1897-ci ildə Təbriz şəhərində anadan olmuşdur. İbtidai təhsilini mollaxanada almışdır. 1923-cü ildə ailəsi ilə birlikdə Bakıya köçüb “III İnternasional” mətbəəsində mürəttib, az sonra “Çapçı gözü” adlı çoxtirajlı qəzetin redaktoru təyin edilərək, 1929-cu ilə qədər burada çalışmışdır[419]. Daha sonralar “Kommunist”, “Azərbaycan kolxozçusu”, “Yeni yol”, “Kirpi” jurnallarında redaktor vəzifəsində çalışan Qulam Məmmədli bütün bilik və bacarığını nəşriyyat-poliqrafiya və dövri mətbuatın tədqiqinə və inkişafına sərf etmişdir. Belə ki, o, ikinci dünya müharibəsi zamanı topladığı əlyazmalar əsasında Pərvin Etisami, Mirzəli Möcüz, Heyran xanım və Fədai kimi klassiklər haqqında bioqrafik əsərlər yazmış və Azərbaycanda nəşr etdirmişdir. Yalnız bu nəşrlərdən sonra həmin söz ustaları Azərbaycan ədəbiyyatşünaslarının tədqiqat obyektinə çevrilmişdir. Azərbaycanda elmi-bioqrafik janr hesab edilən salnamənin ilk nümunələrini də məhz Qulam Məmmədli yaratmışdır.

Qırxdan artıq iri həcmli əsərin və mindən artıq elmi-kütləvi məqalənin müəllifi olan araştırıcının ədəbiyyatşünaslar üçün daha qiymətli tədqiqatı təzkirəsidir. Qulam Məmmədlinin Azərbaycan dilində yazdığı “Təzkirə”si “Danişməndani-Azərbaycan”dan sonra tərtib olunmuş digər universal xarakterli təzkirədir. O, “Azərbaycanın alim, yazıçı, şair və başqa görkəmli xadimləri haqqında

---

[419] Qulam Məmmədli. Tərcümeyi-hal (rus dilində). AMEA Əlyazmalar İnstitutu, Arx. 52, Q-5 (7).

biblioqrafik materiallar" adlı təzkirəsini 1954-cü ildə tamamlamışdır. Təzkirə Azərb. MEA Əlyazmalar İnstitutunda B-2701 şifrəsi altında mühafizə olunur. 1418 vərəq həcmində olan əsər təxminən mindən artıq tanınmış şəxsiyyətin tərcümeyi-halı və əsərlərindən nümunələri əhatə edir[420]. Əsərin I-V cildlərində dövr məhdudiyyəti qoyulmadan Azərbaycanın məşhur şəxsləri yad olunmuşdur. VI cilddə isə şifahi xalq ədəbiyyatından örnəklər və Təbriz-Azərbaycan şairlərinin "Stalin yoldaşa məktubları" toplanmışdır.

Təzkirə tərtib olunarkən əlifba prinsipi əsas götürülmüşdürsə də, bəzən buna riayət olunmamışdır. Müəllif təzkirəyə daxil etdiyi məlumatları hansı mənbədən götürdüyünü səhifənin sonunda qeyd etmişdir. Həmçinin əsərə təzkirədə bəhs olunan şəxslərin adlarının əlifba sırası ilə verildiyi fehrist də əlavə olunmuşdur. Fehristin sonunda təzkirə hazırlanarkən istifadə olunmuş mənbələr – təzkirələr, ədəbiyyat tarixləri və bir sıra dövri mətbuat orqanlarının adları öz əksini tapmışdır.

Araşdırmalar nəticəsində məlum olmuşdur ki, Qulam Məmmədlinin bu əsəri XX əsrdə Şimali Azərbaycanda tərtib olunmuş son ümumi xarakterli təzkirədəir. Əsər indiyə kimi çap olunmasa da, ədəbiyyatşünasların müraciət etdiyi mənbələr sırasındadır.

Azərbaycan MEA Əlyazmalar İnstitunda mühafizə olunan zəngin və dəyərli şəxsi fondlar içərisində Qulam Məmmədlinin arxivinə rast gəlirik. Burada müəllifin tərcümeyi-halı, dəyərli tədqiqatları, fotoşəkilləri və s. saxlanılır.

[420] Qulam Məmmədli. Təzkirə. Əlyazmalar İnstitutu, Б-2701.



Топлаяны: Мәммәдли Гулам

Б-2701
15089

Азәрбайчанын алим, язычы, шаир вә башга көркәмли хадимләри һаггында библиографик материаллар

Б-2701

15089

БАКИ 1954

**Qulam Məmmədli "Təzkirə"**
**AMEA Əlyazmalar İnstitutu B-2701**



**Qulam Məmmədli "Təzkirə"**
**AMEA Əlyazmalar İnstitutu B-2701**

# SEYYİD ƏBDÜLHƏMİD XALXALİ

Seyyid Əbdülhəmid Xalxali "Təzkireyi-şüərayi-müasiri-İran" adlı əsərin müəllifidir. Əsərin birinci cildi 35 şairdən bəhs edir, 452 səhifədən ibarətdir və h.ş.1333 / 1954-cü ildə Tehranda "Təhuri" nəşriyyatında çap olunmuşdur. İkinci cildi isə 73 şairdən bəhs edir və 412 səhifədən ibarətdir. H.ş. 1337 / 1958-ci ildə Tehranda həmin nəşriyyatda işıq üzü görmüşdür[421].

---

[421] Məani Ə.G. Tarixi-təzkirəhayi-farsi. II c., s. 297-298.

# ƏZİZ DÖVLƏTABADİ

Güney Azərbaycandan olan soydaşımız Əziz Dövlətabadi h.1345/1966-cı ildən təzkirə tərtibləməyə başlamış və əsəri "Süxənvərani-Azərbaycan" adı altında 1998-ci ildə iki cilddə farsca nəşr olunmuşdur. Təzkirəçi bu əsərdə 944 nəfər Azərbaycan şairinin həyat və yaradıcılığı haqqında məlumat vermişdir.

Ə.Dövlətabadi təzkirəsinin ön sözündə Azərbaycanın çox sayda şairlər yetişdirdiyini qeyd edərək, bu ölkənin zəngin ədəbiyyata sahib olduğunu vurğulamışdır. Məhz bu səbəbdən yarım əsr öncə M.Tərbiyət Azərbaycan ziyalıları və söz ustaları haqqındakı məlumatları "Danişməndani-Azərbaycan" təzkirəsində toplamışdır. Təzkirəçi "Danişməndani-Azərbaycan"dan sonra Azərbaycan şairləri haqqında təzkirə qələmə almasını iki səbəblə izah edir. Birincisi, bu uzun müddətdə yeni şairlər ədəbiyyat meydanına qədəm qoymuşlar və onların haqqında məlumatın verilməsi vacib olmuşdur[422]. İkincisi, "Fərhəngi-Süxənvəran" və "Tarixi-təzkirəhayi-farsi" adlı mühüm kitabların nəşri sayəsində ədəbiyyat tarixinin əvvəllər məlum olmayan bir sıra əhəmiyyətli mənbələri ictimaiyyətə tanıdılmışdır və bu baxımdan da Azərbaycan şairlərinin həyat və yaradıcılıqlarının həmin mənbələr əsasında daha mükəmməl şəkildə təsvir olunma zərurəti yaranmışdır. Təzkirəçi h.ş.1345/1966-cı ildən etibarən Cənubu Azərbaycanın ayrı-ayrı şəhər və bölgələrinin şairlərindən bəhs edən məqalələrini Təbriz Ədəbiyyat İnstitutunun jurnalında çap etdirmişdir. Məhz həmin zamandan etibarən müəllif ziyalıların və xüsusən də ustad Mənuçöhr Mürtəzavinin təşviqi ilə məqalələrini bir yerə toplayaraq və təkmilləşdirərək, on il müddətində əsər üzərində işləmiş və "Süxənvərani-Azərbaycan" təzkirəsini hazırlamışdır[423].

Daha sonra müəllif ön sözdə istifadə etdiyi mənbələrin adlarını sadalayır, öz təzkirəsini digər təzkirələrdən fərqləndirən üstün

---

[422] Dövlətabadi Ə. Süxənvərani-Azərbaycan. Təbriz, s. XXVI.
[423] Yenə orada, s. XXVIII.

cəhətləri qabardır, “Danişməndani-Azərbaycan” və “Fərhəngi-Süxənvəran”da olmayan bir çox şairin buraya əlavə olunduğunu qeyd edir. Bundan sonra müəllif əvvəlki təzkirələrin, xüsusilə M.Tərbiyətin yol verdiyi səhvləri göstərmiş və onları təshih etmişdir. Ə.Dövlətabadi ön sözün sonunda öz təzkirəsinin xüsusiyyətlərindən bəhs etmişdir. O, təzkirəsinin məhəlli xarakter daşıdığını və İranın tərkibində olan Şərqi Azərbaycan, Qərbi Azərbaycan, Ərdəbil vilayətlərinin şairlərini əhatə etdiyini bildirmişdir[424].

Təzkirə tərtib olunarkən coğrafi prinsip əsas götürülmüşdür. Coğrafi prinsip daxilində də əlifba ardıcıllığına riayət edilmişdir. Əlifba sıralamasında ilk növbədə şairlərin təxəllüsləri nəzərə alınmış, təxəllüsü olmayan şairlər isə ləqəb və adlarına görə təqdim olunmuşlar.

“Belə ki, həmin prinsiplər bir tərəfdən mövcud təzkirəçilik ənənələrinə sadiqlik nümayiş etdirməsi, digər tərəfdən isə şair və yazıçıların yaradıcılığına dair məlumatların toplanılmasına orijinal yanaşma tərzini nümayiş etdirməsi baxımından xüsusi maraq kəsb edir”[425].

Hər şairdən bəhs olunarkən imkan daxilində ən ilkin mənbələrə müraciət edilmiş və şairdən bəhs edildikdən sonra istifadə olunmuş mənbələrin adları və səhifələri göstərilmişdir. Müəllif əvvəlki təzkirəçilərin yol verdiyi səhvləri islah etməyə çalışmışdır.

Təzkirəçi öncə vəfat etmiş şairlər, sonra isə müasir şairlər haqqında məlumat verir. Bu cəhətdən Müctəhidzadə və Mir Möhsün Nəvvabın təzkirələri ilə struktur baxımından oxşarlıqlar nəzərə çarpmaqdadır.

Belə ki, təzkirədə hər bölgədən bəhs edilərkən keçmiş zamandan müasir dövrə kimi mövcud olmuş “hal-hazırda həyatının şamı sönmüş” şairlər xatırlanmışdır. İkinci cild isə həmin bölgələrin həyatda olan şairlərinə həsr olunmuşdur. J.İsmayılova bu təz-

[424] Yenə orada, s. XXVII.

[425] İsmayılova J. Əziz Dövlətabadinin “Süxənvərani-Azərbaycan” təzkirəsinin tərtib prinsipləri // Tədqiqlər, 2004, N 4, s. 251.

kirənin tərtib prinsipinin özəlliklərindən biri kimi sənətkarların nəsil şəcərəsini nəzərə alma faktının üzərində durur[426].

Təzkirədə Cənubi Azərbaycan şairlərinin farsdilli poeziyasından nümunələr təqdim olunmuşdur. Hər bölgənin şairlərindən bəhs edən fəslin sonunda müəllif həmin yerin türkcə yazan şairlərinin adlarını və onlar haqqında məlumat verən mənbələri sadalamışdır.

Ə.Dövlətabadi qeyd edir ki, Y.Şeyda Azərbaycan türkcəsində şeir yazan müasir şairlərin tərcümeyi-halları və şeirlərini əhatə edən "Ədəbiyyat ocağı" təzkirəsini qələmə aldığı üçün o, öz doğma dilində şeir yazan Cənubi Azərbaycan şairlərinin haqqında geniş məlumat verməmiş, onların adlarını çəkməklə kifayətlənmişdir.

Ə.Dövlətabadi məhəlli təzkirə yazan müəlliflərin qarşısında duran mühüm problemlərdən birinin bəzi şairlərin hansı bölgəyə mənsub olduğunu müəyyənləşdirməyin çətinliyidir. Təzkirəçi öz əsərində bəhs etdiyi bölgənin şairlərindən danışmazdan öncə həmin yerin tarixi, coğrafiyası və abidələri haqqında məlumat vermişdir[427].

Təzkirənin I cildi Ərdəbil, Arazbaran, Urmiya, Ərvənəq, Ənzab və Təbrizdən olan şairlər haqqında məlumatı əhatə etməkdədir. II cilddə isə Xalxal, Xoy, Sərab, Səlmas, Maku, Mərənd, Məhabad, Miyanə və Gərmrud şairlərinin haqqında məlumat verilmişdir. Təzkirədəki şairlərdən beşi qadındır.

| Şəhər | Keşmiş şairlər | Müasir şairlər | Türkcə yazan şairlər |
|---|---|---|---|
| Ərdəbil | 72 | 8 | 20 |
| Arazbaran | 15 | 5 | 2 |
| Urmiya | 46 | 14 | 6 |
| Ərvənəq və Ənzab | 18 | - | 4 |
| Təbriz | 396 | 92 | 27 |
| Xalxal | 35 | 9 | 2 |
| Xoy | 44 | 13 | 2 |
| Sərab | 7 | - | 1 |
| Səlmas | 17 | 3 | 2 |

---

426 Yenə orada, s. 252.
427 Dövlətabadi Ə. Süxənvərani-Azərbaycan. Təbriz, s. XXX.

| | | | |
|---|---|---|---|
| Maku | 1 | - | - |
| Mərənd | 11 | 7 | 4 |
| Məhabad | 4 | 5 | - |
| Miyandüab | 2 | 1 | - |
| Miyanə və Gərmrud | 8 | - | 3 |
| Nəqdə | 2 | - | - |
| Cəmi | 705 | 159 | 80 |

"Danişməndani-Azərbaycan"dan fərqli olaraq, bu təzkirədə Şimali Azərbaycan şairlərindən bəhs olunmamışdır.

Sözügüdən təzkirə Əlyazmalar İnstitutunun əməkdaşı J.Şükürova (İsmayılova) tərəfindən tədqiqata cəlb olunmuşdur. Əsərin Azərbaycan dilinə tərcüməsi üzərində isə iş davam edir.

Əziz Dövlətabadinin başqa bir təzkirəsi 1991-ci ildə nəşr etdirdiyi "Sərayendeqani-şeri-parsi dər Qəfqaz" ("Qafqazın farsdilli şairləri") adlı əsərdir[428].

Bu təzkirə də adından göründüyü kimi coğrafi prinsip əsasında tərtiblənmişdir. Əsərdə 227 şairin həyat və yaradıcılığı haqqında məlumat verilmiş və əsərlərindən nümunələr təqdim olunmuşdur. Təzkirə dörd fəsildən ibarətdir.

Birinci fəsildə Aranın farsdilli şairlərindən bəhs edilimiş və doqquz hissəyə ayrılmışdır:

1. Ordubadın farsdilli şairləri 16 nəfər
2. Bakının farsdilli şairləri 6 nəfər
3. Bərdənin farsdilli şairləri 1 nəfər
4. Beyləqanın farsdilli şairləri 6 nəfər
5. Xalatın farsdilli şairləri 2 nəfər
6. Şirvanın farsdilli şairləri 47 nəfər
7. Qarabağın farsdilli şairləri 59 nəfər
8. Gəncənin farsdilli şairləri 36 nəfər
9. Naxçıvanın farsdilli şairləri 4 nəfər

İkinci fəsil "Parsisərayani-Ermənistan" adlanır və 12 şairi əhatə edir.

[428] Dövlətabadi Ə. Qafqazın farsdilli şairləri. Tehran, 1370.

Üçüncü fəsildə on üç farsdilli Dağıstan şairindən, dördüncü fəsildə isə iyirmi beş farsca yazan Gürcüstan şairindən bəhs olunmuşdur.

Bu təzkirədə bəzi mübahisəli məqamlar vardır ki, J.Şükürova onların üzərində durmuşdur[429].

---

[429] Şükürova J. Qafqazda yaşayan farsdilli şairlər // Filologiya məsələləri, 2011, N 11, s. 361.

# ƏLİ NƏZMİ

Daha bir cənublu soydaşımız Əli Nəzminin h.q.1396/1976-cı ildə farsca nəşr etdirdiyi "Devist süxənvər" təzkirəsi zəngin mənbələr əsasında yazılmışdır. Müəllif kitabın ön sözündə yazır: "İndiyə qədər yazılan təzkirələrin əksəriyyətində bəzi səhvlərə yol verildiyindən, şairlər haqqında məlumat təhrif olunduğundan, onların doğum və vəfat tarixləri qarışıq salındığından, birinin əsəri digərinə aid edilmişdir". Əli Nəzmi bu qüsuru aradan qaldırmağı qarşısına məqsəd qoymuşdur.

Əli Nəzminin "Devist süxənvər" təzkirəsi özündən əvvəl bu formada yazılmış başqa əsərlərdən hər bir şair üçün verilmiş "maddeyi-tarix"lə fərqlənir. Kitabda adı çəkilən iki yüz şairin hər biri üçün üç-dörd beytdən ibarət şeir yazılmışdır. Şeirin axırıncı misrası maddeyi-tarix olub, şairin vəfat tarixini göstərir[430].

Bu təzkirədə iki yüz şairdən bəhs olunduğu üçün əsərin adı da "Devis süxənvər"dir. Bundan əlavə kitabın adı əbcəd əlifbası ilə yazılma tarixini (1396) əks etdirir.

Müəllif əsərdə zaman məhdudiyyəti qoymayaraq klassiklərdən başlayaraq tanınmış və adları heç xatırlanmayan şairlər haqqında məlumat vermişdir. Burada Qətran Təbrizi, Məhsəti Gəncəvi, Xaqani Şirvani, Fələki Şirvani, Mücirəddin Beyləqani, Nizami Gəncəvi, Əvhədi Marağayi, Gülşəni və başqa sənətkarlarla yanaşı Zəki Marağayi, Məğribi Təbrizi, Şərif Təbrizi, Heydəri Təbrizi, Haləti Təbrizi, İlahi Ərdəbili kimi az tanınan və ya haqlarında məlumat verilməyən şairlərdən də bəhs olunmuşdur[431].

---

[430] Əlizadə L. Klassik Azərbaycan şairləri yeni təzkirə səhifələrində // Azərbaycan SSR EA, Ədəbiyyat, dil və incəsənət seriyası, 1986, N 3, s. 155.
[431] Yenə orada, s. 156.

# YƏHYA ŞEYDA

Yəhya Şeyda 20 ordibehişt 1303-cü (10 may 1924-cü) ildə Təbrizdə anadan olmuşdur. Onun atası Səttarxan hərəkatının iştirakçılarından, Təbrizin məşrutə mücahidlərindən olan "Yüzbaşı" ləqəbli Həsən Çərəndabidir. Şeyda, Firdovsi mədrəsəsinin ədəbiyyat bölümünü bitirmiş, fars və ərəb dillərini mükəmməl şəkildə mənimsəmiş, ilahiyyat, fəlsəfə, psixologiya və irfan elmlərinə yiyələnmişdir. 1319/1940-cı ildən etibarən ədəbiyyat sahəsinə qədəm qoymuş, Əli Fitrət, Cəfər Xəndan və Mövlana Yetim kimi şairlərdən ədəbiyyat dərsləri almış, mətbuatla çıxış etmişdir. 1327-30/1948-51-ci illərdə Tehranda islami irfan elmi üzrə təhsil almış, həmin müddətdə müxtəlif ədəbi məclislərin toplantılarına qatılmışdır. Tehranda təhsilini başa vurduqdan sonra Təbrizə dönmüş, burada jurnalist kimi mətbuatda fəaliyyət göstərmiş, eyni zamanda ədəbi məclislərdə fəal iştirak etmiş, Səhənd, Həbib Sahər, Həsən Qazı, Əhməd Tərcanizadə, Vaiz Çərəndabi, Ədib Tusi, Mənuçöhr Mürtəzavi, Ustad Şəhriyar və b. kimi şairlərlə dostlaşmışdır. Pəhləvi rejimi dövründə siyasi səbəblər üzündən daim təqib olunmuş, dəfələrlə həbs edilmişdir.

Şeyda türkcə və farsca şeirlər yazmışdır. Türkdilli poeziyasının 22 min beytdən ibarət olduğu bildirilir. Onlarca kitabın müəllifi və tərtibçisidir. Ayrı-ayrı şeir kitablarından başqa, romanları və ədəbiyyata dair araşdırmaları çap olunmuşdur. O, bir neçə azərbaycanlı şairin (Qəmzədə Marağayinin, Möcüz Şəbüstərinin, Molla Vəli Vidadinin, Məhəmməd Füzulinin, Əkbər Cavadinin, Saib Təbrizinin) divanını nəşr etdirmişdir. Yəhya Şeyda 2011-ci il oktyabrın 21-də Təbrizdə vəfat etmişdir[432].

Şairin ölümündən sonra Azərbaycan Yazıçılar Birliyinin Cənubi Azərbaycan şöbəsinin təşkilatçılığı ilə Y.Şeydanın anım günü

[432] http://shaer-azarbaijan.blogfa.com/post-56.aspx; http://kult.az/yehya-seyda-haqqinda-bir-nece-soz/; http://www.newsmeeting.com/az/n/1695228-gorkemli-azerbaycan-sairi-yehya-seydanin-anim-gunu-kecirilib.aspx

ilə bağlı tədbir keçirilmişdir. Tədbirdə AYB-nin Cənubi Azərbaycan şöbəsinin sədri Sayman Aruz şairin həyat və yaradıcılığı haqqında məlumat vermişdir. Məruzədə xüsusi vurğulanır ki, “Azərbaycanın görkəmli qocaman şair, ədib və yazıçısı Yəhya Şeyda 70 il ədəbi işlərlə Azərbaycan dilini diri saxlamış və şah rejiminin boğuntu və sıxınıtısı onu susdura bilməmişdir”[433].

M.Dəyhim öz təzkirəsində şairin yaradıcılığını yüksək qiymətləndirir: “Şeyda mövzun (vəznli) təbə malikdir, dərin bilikli və agah bir şairdir. Lətif və gözəl mənaları vardır. Farsca və türkcə şeirlər deyir. Şeyda vətənpərvər, ünsiyyətcil və təmiz adamdır. Dostları ona xeyli ehtiram və əlaqə bəsləyirlər. Onun şeirə və şairliyə böyük məhəbbəti vardır və öz növcavanlığının əvvəllərindən şeir deyir. Şeirləri əsas etibarilə Azərbaycan mətbuatında çap olunmuşdur. Təbrizin əksər qəzetləri ilə fəal əməkdaşlıq edibdir”[434].

Y.Şeydanın Cənibi Azərbaycanın müasir şairləri haqqında doğma dilimizdə tərtib etdiyi üç cildlik “Ədəbiyyat ocağı” və ya “İranın qeydi-həyatda olan türkü yazan şairlərinin təzkirəsi” adlı sanballı əsər onun adının Azərbaycan təzkirəçilik tarixinə düşməsinə səbəb olmuşdur. İlk cildi h.ş. 1364-cü (m. 1985) ildə işıq üzü görən bu kitab Cənubi Azərbaycanın mədəni həyatında əlamətdar bir hadisəyə çevrilmiş və ədəbi mühitdə bir canlanmaya səbəb olmuşdur[435]. Təzkirənin ilk cildinin ön sözündə Pəhləvi rejimi dövründə Azərbaycan türk dilinin sıxışdırıldığını qeyd edən müəllif bu siyasəti tənqid atəşinə tutur, dilimizin məziyyətlərini vurğulayır və bu səbəbdən türkcə yazan şairlər haqqında təzkirə yazmaq qərarına gəldiyini bildirir: “İndiyədək fars dilində yazan şairlər üçün müxtəlif təzkirələr yazılıb və şeirlərindən çeşidli örnəklər gətirmişlər. Ancaq türk dilində yazan şairlərə çatanda: “filan şair türk dilində öz əsərlərin yaradıb” sözüylə kifayətlənmişlər və bu zamanadək bir

---

433 http://kult.az/yehya-seyda-haqqinda-bir-nece-soz/; http://www.newsmeeting.com/az/n/1695228-gorkemli-azerbaycan-sairi-yehya-seydanin-anim-gunu-kecirilib.aspx
434 M.Dəyhim. Təzkirətüş-şüərayi-Azərbaycan. III c. Təbriz, 1368, s.438.
435 Y.Şeyda. Ədəbiyyat ocağı. I c. Təbriz, 1364.

təzkirə belə türkü dilində yazan şairlərə ixtisas verməmişlər və çoxlarının adı, hətta əsərləri itib-batmışdır".

Öz təzkirəsində "Ədəbiyyat ocağı"nın ilk cildindən geniş surətdə bəhrələnmiş M.Dəyhim təzkirəçilərə xas olmayan bir təvazökarlıqla bu əsəri mədh etmişdir: "Şeydanın Azərbaycan türcəsində kitabları "Odlar vətəni", "Mirzə Əli Möcüzün yayılmamış əsərləri", "Odlu sözlər", "Sijimqulu", "On cüzvələr", "Ustad Şəhriyarın türkü divanı", Biriyanın ürək sözü" və bir neçə digər məcmuədir. Şeydanın sonuncu çox əhəmiyyətli əsəri "Ədəbiyyat ocağı" kitabıdır. Burada o, Azərbaycanın türkcə yazan 200-dən artıq şairinin bioqrafiyasını və şeirlərini elə diqqət və qayğıkeşliklə tənzim və çap edibdir ki, indiyədək belə bir təzkirə tərtib olunmamışdır. O, bu yöndə fövqəladə dərəcədə zəhmətlər çəkmişdir"[436].

S.Aruz da "Ədəbiyyat ocağı" təzkirəsini yüksək dəyərləndirmişdir: "Yəhya Şeydanın ədəbi fəaliyyəti çox güclü və uzunmuddətli olmuşdur. Şeyda onlarca şairin şeir dəftərlərinə ön söz yazmış, şeirlərini bir dil sərrafı tək araşdırmış, incələmiş və yol göstərmişdir. Heç kim Şeyda qədər müasir şeirimizlə tanış deyil. Onun üç cildlik "Ədəbiyyat ocağı" kitabı, çağdaş ədəbiyyatımızda önəmli və dəyərli bir əsərdir. Böyük ədib bu əsəri hazırlamağa illər boyu zəhmət çəkib və yüzlərcə çağdaş şairlərimizlə əlaqəyə girərək, şeirlərini ələ gətirib və üç cildlik kitabda toplayıbdır... Elimizə töhfə verən  üç cildlik "Ədəbiyyat ocağı" əsəri, bir tərəfdən gənc şairlərimizə imkan yaradıb, bir tərəfdən elimizin başını başqa xalqlar qarşısında zirvələrə qaldırıb"[437].

Təzkirənin hər bir cildində Azərbaycan türkcəsində şeirlər yazan təxminən 200-dən artıq güneyli şair haqqında məlumat verilmişdir. Hər cild coğrafi prinsip əsasında tərtib edilmiş və coğrafi prinsip daxilində də şairlərin düzümü zamanı əlifba sıralanmasına riayət edilmişdir.

Əsərin II cildi h.ş. 1366-cı (m.1987) ildə nəşr edilmişdir. Cildin əvvəlində Y.Şeydanın "Başlanış yerinə" adlı 4 səhifəlik ön sö-

---

[436] M.Dəyhim. Təzkirətüş-şüərayi-Azərbaycan. III c., s.438.
[437] http://kult.az/yehya-seyda-haqqinda-bir-nece-soz/

zü yer alır. Burada təzkirənin ilk cildinin İran və dünya mətbuatında müsbət əks-səda doğurduğundan bəhs edilir. Müəllif belə bir təzkirə tərtib etməsini vətəni və xalqı qarşısındakı borcu hesab edərək yazır: "Bu işi biz bir vəzifə bilirik. Vəzifəni daşımaq və onu sona çatdırmaq hər təəhhüdlü insanın boynundadır"[438].

Daha sonra müəllif ilk cildə qarşı yönəldilmiş bəzi "yerli və gərəkli" tənqidləri sadalayır və bunlara öz münasibətini bildirir. Müəllif təzkirənin ilk cildini hazırlayarkən müxtəlif şairlərlə təmasa keçib onlardan məlumat toplamış, lakin bəzi şairlər təzkirəçi ilə əməkdaşlıqdan yayınmışlar. Buna görə də təzkirənin II cildinin ön sözündə Y.Şeyda həmin şairləri mülayim bir şəkildə tənqid atəşinə tutmuşdur: "Biz kətbi (yazılı – V.M.) bir çağırışla bütün əziz şairlərimizə kitabın çap olmağın bildirmişdik və hətta neçə kərələr ruznamələrdə (qəzetlərdə - V.M.) elan etmişdik. Lakin bir para böyük və iqtidarlı zatlar özlərini uca və məcmuəmizi alçaq təsəvvür etdiklərinə görə əlimiz ətəklərinə çatmadı". Lakin daha sonra problem yoluna qoyulmuş və həmin şairlər haqqında məlumatlar təzkirənin II cildinə daxil edilmişdir[439].

Y.Şeydanın bir sıra şairlər haqqında öz təzkirəsinə daxil etdiyi məlumatlar və onların şeirlərindən nümunələr həmin şairlərin özləri tərəfindən yazılıb, seçilib təzkirəçiyə təqdim edilmişlər: "Bu cilddə xatırlamaq lazımdır ki, burada gələn tərcümeyi-hallar və şeirlər, əziz və ehsaslı şairlərimizin öz ixtiyarı ilə yazdığı və seçdiyi sözlər və əsərlərdirlər və biz fəxr edirik ki, bu məcmuə onların adını bu hərəkətlə ölməz və zavalsız əsrlər boyu saxlayıb və gələn nəsillərə bir əziz töhfə və əmanət kimi təhvil edəcəkdir"[440].

Təzkirəçi heç kimin ondan inciməməsi üçün şairləri yuxarı baş – aşağı baş, qoca – cavan, iqtidarlı – zəif, ustad – şagird, məşhur – qeyri-məşhur fərqi qoymadan, əlifba ardıcıllığı ilə sıralamağı qərara almışdır. Müəllif Pəhləvi rejiminin devrilməsindən sonra

---

[438] Y.Şeyda. Ədəbiyyat ocağı. II c. Təbriz, 1366, s. "bir".
[439] Y.Şeyda. Ədəbiyyat ocağı. II c., s. "iki".
[440] Y.Şeyda. Ədəbiyyat ocağı. II c., s. "üç".

Azərbaycan türklərinin öz dillərini və ədəbiyyatlarını təbliğ etmək üçün gözəl fürsətlər əldə etdiyini vurğulayır.

II cildin ön sözü bu istəklər və diləklərlə bitirir: "Biz imkanlarımız qədər bu məcmuənin mühtəvalı və zəngin olmağında təlaş etdik və etiraf edirik ki, yenə nöqsanlardan boş deyil və bu nöqsanları böyük alimlərimiz və əziz vaqif oxucularımızdan üzümüzə çəkməyi rica edirik. Onların gördükləri məsləhətləri və intiqadları (tənqidləri – V.M.) açıq alın və gülər üzlə istiqbal edirik və Ulu Tanrıdan ehsaslı şairlərimizə və Azərbaycan ədəbiyyatına məhəbbət bəsləyən şəxsiyyətlərə və riyasız xadimlərə nailiyyətlər diləyirik. Bu ümid ilə ki, bu kiçik xidmət bir hissə ağır vəzifələrimizdən yüngüllədə bilsin. Ya Hu!"[441]

Y.Şeyda əsərin III cildinin də hazırlana biləcəyini hələ II cilddə anons etmişdir: "Olsun ki, gələcəkdə üçüncü cilddə qalan və yaddan çıxan şairlərimizi də xatırlayaq"[442]. Təzkirənin III cildi 1990-cı illərin əvvəllərində tərtib olunub çapa hazırlansa da, on il sonra, h.ş. 1381-ci (m. 2002) ildə nəşr edilmişdir. Bu barədə təzkirəçi cildin əvvəlinə yazdığı "Giriş yerinə" adlı 3 səhifəlik ön sözdə məlumat vermişdir: "Ədəbiyyat ocağı"nın 3-cü cildinin materialları on il bundan qabaq hazırlandı və on il bundan qabaq da çap olunmalıydı. Lakin bu müddətdə bir para çatışmazlıqlar (kağızın bahalığı, tapılmamazlığı və naşirin vəfatı) əl-ələ verib, maneələr yaratdı". Təzkirəçi: "Xaliq görəlim neylər; neylərsə gözəl eylər" – deyə-deyə təzkirənin son cildinin taleyini Ulu Tanrının istəyinə həvalə etdiyi bir vaxtda, nəhayət, Təbrizdə gündəlik dərc edilən "Məhdi-azadi" ("Azadlıq beşiyi") qəzetinin[*] məsul müdiri Seyid Məsud Peyman bu kitabın nəşrini öz üzərinə götürdü.

Təzkirəçi bu əsəri hazırlamaqla neçə-neçə şairin adını unudulmaqdan qoruduğunu ifadə edir və sözünü qüvvətləndirməkdən ötrü, özünün qeyd etdiyi kimi, "böyük Mirzə Ələkbər Sabirdən" sitat gətirir:

---

[441] Y.Şeyda. Ədəbiyyat ocağı. II c., s. "dörd".

[442] Y.Şeyda. Ədəbiyyat ocağı. II c., s. "bir".

[*] Y.Şeyda özü uzun illər bu qəzetin redaksiyasında çalışmışdır.

Nə qəm, uğratsa da bir gün məni əfnayə zaman,
Mən gedərsəmsə, məramım yenə dünyada durar.

Daha sonra müəllif təzkirəsinin ilk iki cildini rəğbətlə qarşıladığı üçün xalqına təşəkkürlərini çatdırır: "Şükranə üçün deməliyəm ki, bu kitabın birinci-ikinci cildi dilimizə, elimizə məhəbbət bəsləyib öz kökünə söykənən şəxsiyyətlərin istiqbalı ilə qarşılandı və bu mənanı sübuta çatdırdı ki, azərbaycanlıya pak süd verən anaların döşləri hələ qurumayıb, haqşünas və əmək qədri bilən övladları indi də öz xadimlərini dəyərləndirir və xainlərə ürək dolusu sönməz nifrət bəsləyir.

Kök polad, sinə polad, rişə polad, payə polad,
Burda hər kim doğulur, dağ kimi möhkəm doğulur".

Ön sözün sonunda müəllif bəzi ədəbiyyatsevər oxucuların istəklərini nəzərə alaraq, özünün daha öncə nəşr edilmiş və nəşrə hazır olan əsərlərinin siyahısını təqdim etmişdir. Təzkirənin son cildinin ön sözü bu ifadələrlə tamamlanır:

"Bu kitab əziz vətəndaşlara və səmimi oxuculara təqdim olur. Bu ümid ilə ki, onların qəbuli-xatirlərini əldə etmiş olsun.

Bir yaşıl yarpaqdır dərviş töhfəsi,
Binəva neyləsin, budur var-yoxu"[443].

Təzkirənin müqəddimələrində müəllif "Quran" ayələrindən və atalar sözlərindən ("Aşın duruluğu dənin yoxluğundandır"; "Tək əldən səs çıxmaz"; "Varın verən utanmaz") misallar gətirmişdir.

"Ədəbiyyat ocağı" təzkirəsində Ərdəbil şairlərindən Əzhər, Ənvər, Elçi, Bəxtiyari, Çavuş, Çiçək, Xürrəm, Savalan, Səhər, Sadiq, Fəğan, Muğanoğlu, Naseh və b., Arazbar şairlərindən İqbal,

---

[443] Y.Şeyda. Ədəbiyyat ocağı. III c., Təbriz, 1381, s.5-7.

Eloğlu, Bariz, Heydər, Zülfüqar, Rəsul, Sahil və b., Urmiya şairlərindən Adsız, Tənha, Cəfəri, Şami və b., Təbriz şairlərindən Adlı, Azərlü, Arzu, Azadə, Altay, Aydın, Əfşar, Ulduz, İldırım, İlqar, Salis, Cəmşidi, Həzin, Hüseyni, Xətibi, Xoşməram və b., həmçinin Güney Azərbaycanın digər bölgələrinin şairləri haqqında məlumat verilmişdir. Bu təzkirə, heç şübhəsiz ki, XX əsrin sonlarında Güney Azərbaycanın anadilli poeziya mühitinin öyrənilməsi üçün ilkin və əvəzsiz qaynaqlardan biridir.

Bütün həyatı və fəaliyyəti dövründə ürəyi Azərbaycan eşqi ilə çırpınan şairin yaradıcılığına vətən və millət sevgisi hakim kəsilmişdir. Şairin gənc yaşlarında yazdığı "Azərbaycanım" şeiri buna gözəl bir örnəkdir:

Ey sevgili yurdum, yaşayır səndə min amal,
Sənsiz aça bilməz bu xəyalım quşu heç bal.

Ey şanlı vətən, şairi bu gənc çağında,
Sən saxlamısan isti məhəbbət qucağında.

Mən fəxr edirəm sənlə ki, doğma vətənimsən,
Bağım, çiçəyim, laləli gülgün çəmənimsən...

Sənsiz yaşamaq xeyli müsibətdi cahanda,
Sən saxlamısan canımı eşqinlə amanda.

Eşqin mənə aləmdə böyük şanu-cəlaldır,
Sənsiz işim hər yanda bütün ahu-məlaldır.

Şeyda sənin eşqinlə belə tazə cavandır,
Fəxr ilə deyir: "Torpağım Azərbaycandır!"[444]

---

[444] Şairlər Məclisinin nəşriyyatı, Təbriz, № 3-4, Aban-Azər 1324; http://cobanyildizi.blogfa.com/9008.aspx

Şeyda ömrünün sonuna kimi bu amala sadiq qalmış, öz yaradıcılığında dönə-dönə vətənpərvərlik mövzusuna müraciət etmişdir:

Həmişə Azər övladı yaşar aləmdə azadə,
Nə qədri dövr edər dövran bu Azərbaycan vardır.

Bizim bu qəhrəmanlar yurdu ölməz, payimal olmaz,
Ki hər küncündə minlər qəhrəman Səttarxan vardır.

Əgər Babək, Cavanşir öldü, köçdü dünyadan,
Yenə bu ölkədə onlar kimi çox qəhrəman vardır.

Sən ey azadələr nəslindən almış nəşə cananım,
Oyan xabi-cəhalətdən ki, müşkül imtahan vardır...[445]

Görkəmli Azərbaycan şairi və təzkirəçisi Y.Şeydanın həyat və yaradıcılığının Azərbaycan Respublikasında xüsusi tədqiqata cəlb olunmasına ehtiyac vardır.

[445] M.Dəyhim. Təzkirətüş-şüərayi-Azərbaycan. III c., s.444.

# MƏHƏMMƏD DƏYHİM

Ustad Məhəmməd Dəyhim Təbrizi h.q. 1325-ci ildə (m. 1907) Təbrizdə doğulmuşdur. Ədəbiyyat və riyaziyyat təhsilinə malik olmuş, h.ş. 1311-ci (m. 1932) ildən etibarən jurnaliast kimi mətbuatda fəaliyyətə başlamışdır. H.ş. 1335-ci ildə (m. 1956) Tehrana köçmüş, orada siyasət və mədəniyyət sahələrində çalışmışdır. Bir müddət İran parlamentinin Təbrizdən seçilmiş deputatı olmuşdur. “Mövlana”, “Saib”, “Azərbaycan” və s. kimi ədəbi əncümənlərin yaradılmasında və fəaliyyətində yaxından iştirak etmişdir. Bu görkəmli Azərbaycan ədibi və təzkirəçisi h.ş. 1378-ci ilin bəhmən ayının sonlarında (2000-ci ilin fevral ayında) Tehranda vəfat etmişdir.

Güney Azərbaycandan olan soydaşımız Məhəmməd Dəyhim öz təzkirəsini dövr məhdudiyyəti qoymadan, coğrafi prinsip əsasında tərtib etmişdir. Coğrafi prinsip daxilində şair bioqrafiyaları keçmiş və müasir dövr şairlərini ehtiva edən iki fəslə ayrılmış, hər fəsil daxilində əlifba ardıcıllığına riayət edilmişdir. Təzkirə 1989-1992-ci illərdə “Təzkireyi-şüərayi-Azərbaycan” adı altında Təbrizdə beş cilddə nəşr olunmuşdur. Əsərin birinci cildi Ərdəbil, Arazbar, Urmiya, Ərvənəq şairlərinə, ikinci və üçüncü cildləri Təbriz şairlərinə, dördüncü cildi Xalxal, Xoy, Sərab, Səlmas, Mərənd, Marağa, Qoşaçay (Miyandüab), Miyanə və Savucbulaq (Məhabad) şairlərinə, beşinci cildi isə əsas etibarilə Şimali Azərbaycan şairlərinə həsr olunmuşdur.

Təzkirəçi əsərin ön sözündə yazır: “Mən heç bir zaman və xüsusən də məclisdə bir neçə çağırış Təbrizdən seçilmiş nümayəndə kimi fəaliyyətim müddətində öz vəzifəmin icrası baxımından ən kiçik qüsura belə yol verməmişəm. Sonra da bu səydə və təlaşda olmuşam və indi də çalışmaqdayam ki, öz imkanımın və bacarığımın yetdiyi qədər ümumi rifahın təmin olunmasına və xüsusilə də doğum yerim olan əziz Təbriz şəhərinin mədəniyyət və sənətinin inkişafına kömək etmək, öz istəkli həmşəhrilərim üçün xidmət

göstərmək yolunda təsirli addımlar atım ki, bu yolla məni yetişdirmiş bu torpağa olan borcumu ödəməyə nail olum və həm də vəfadar azərbaycanlı dostlarımın mənə münasibətdə nümayiş etdirdikləri mehribanlıq və lütfkarlığın bir qisminin əvəzini çıxmağın öhdəsindən gəlim”[446].

Daha sonra müəllif Güney Azərbaycan üçün gördüyü işlərdən, xüsusilə də Təbriz şəhərində şairlər məqbərəsinin bərpası və müasir standartlara cavab verən xəstəxananın yaradılması istiqamətində göstərdiyi səylərdən bəhs edir. O, öz təzkirəsini qələmə almasını da vətəni və xalqı qarşısındakı xidmətlərdən biri hesab edir. Ön sözdən məlum olur ki, müəllif h. III əsrdən öz dövrünə qədər yaşamış Cənubi Azərbaycan şairləri haqqında təzkirə tərtib etməyi qərara almış və beş il yarım çalışaraq bu mövzuda dörd cildlik əsər ortaya qoymuşdur[447]. Lakin sonradan M.Dəyhim əsasən Şimali Azərbaycan şairlərindən bəhs edən V cildi də qələmə almışdır.

Onu da bildirmək lazımdır ki, təzkirə M.Dəyhimin nəşr olunmuş 26-cı kitabıdır. Müəllifin əvvəlki əsərləri əsas etibarilə ibtidai və orta məktəblər üçün dərsliklərdən ibarətdir.

Bu təzkirədə həm Azərbaycan türkcəsində, həm də farsca şeirlərdən örnəklər yer almışdır. Əsərin ilk dörd cildinin nəsr hissəsi farsca yazıldığı halda, sonuncu cildin nəsrində daha çox doğma dilimizə üstünlük verilmişdir.

“Süxənvərani-Azərbaycan” təzkirəsinin Dəyhim təzkirəsindən fərqi Dövlətabadinin müraciət etmədiyi ərazi və regionların ədiblərini öz əsərinə daxil etməsindədir.

Müəllif öz təzkirəsini tərtib edərkən həm klassik mənbələrdən, həm də müasir araşdırmalardan və nəşrlərdən geniş surətdə yararlanmışdır. Onun istifadə etdiyi qaynaqlar sırasında “Ataşkədə”, “Ədəbiyyat ocağı”, “Töhfeyi-Sami”, “Təzkireyi-əxtər”, “Təzkireyi-Nazim Təbrizi”, “Təzkireyi-Nəsrabadi”, “Danişməndani-Azərbaycan”, “Riyazül-arifin”, “Səfineyi-Mahmud”,

446 Dəyhim M. Təzkireyi-şüərayi-Azərbaycan. Təbriz, 1367, I c., s. 1.
447 Yenə orada, s. 4.

"Lətaifül-xəyal", "Məcalisün-nəfais", "Məcməül-xəvas" və s. kimi təzkirələrin, "Əhsənüt-təvarix", "Tarixi-aləmarayi-Abbasi", "Cahangüşayi-Cüveyni", "Həbibüs-siyər", "Silsilətün-nəsəbi-Səfəviyyə", "Səfvətüs-səfa", "Zəfərnameyi-Nizaməddin Şami", "Mücməlüt-təvarix", "Müntəxəbüt-təvarix" və s. kimi tarixi məxəzlərin adlarını çəkə bilərik. Təzkirədə Azərbaycan Respublikasında çap edilmiş tədqiqat əsərləri, şeir kitabları və ədəbiyyat müntəxəbatlarına da müraciət edilmişdir.

Məsələn, Nişat Şirvanidən bəhs edən təzkirəçi yazır: "XVIII əsr Azərbaycan ədəbiyyatı tarixində Füzuli ənənələrini davam etdirən, anadilli şeir dünyasında özünəməxsus dəsti-xətti olan istedadlı sənətkarlarımızdan biri də Nişat Şirvanidir. Həyatı və yaradıcılığı haqqında məlumatımız azdır. Əsərlərindən məlum olur ki, şair Şamaxı şəhərində anadan olmuş, sonralar nə səbəbdənsə oranı tərk edərək Salyan şəhərinə köçmüşdür. Akademik H.Araslının fikrincə, Nişat Şirvani XVIII əsrin I yarısında yaşayıb-yaradan Azərbaycan şairləri içərisində ən şöhrətlisidir. İndi iki qəzəl Azərbaycan klassik ədəbiyyatı kitabında 268-ci səhifədə çap olubdur, birlikdə oxuyuruq"[448]:

Sağın ey qönçə dəhən, gül kimi xəndan gəzmə,
Dağıdıb zülfi pərişanu-pərişan gəzmə.

Gəzmə, qurbanın olum, qədrini bilməzlər elə,
Qorxuram hüsnünə nagəh yetə nöqsan gəzmə.

Əzizim, istərisən şöhreyi-şəhr olmayasan,
Seyri-bazar edib əğyar ilə meydan gəzmə.

El yaman - yaxşıdır, gəzmə bu kafirlər ilə,
Sənə yüz kərrə dedim gəzmə müsəlman, gəzmə.

---

[448] Dəyhim M. Təzkireyi-şüərayi-Azərbaycan. Təbriz, 1371, V c., s. 448-450.

Ey Nişat, sən səri-kuyində müqim ol yarın,
Gəşti-bağ eyləmə gəl, bağ ilə bostan gəzmə.

Təzkirədə Nişat Şirvaninin başqa bir qəzəlinə də yer verilmişdir.

Təzkiəçi XX əsr Azərbaycan şairlərindən Ə.Cəmil, B.Vahabzadə, S.Rüstəm, Ş.Dəlidağ, Ə.Cavad, Ə.Qəşəmoğlu, Qabil, İ.Tapdıq, P.Qəlbinur, A.Mirzə, M.Araz, N.Həsənzadə, N.Xəzri, M.İsmayıl, M.Aslan, B.Azəroğlu, N.Gün və b. haqqında məlumat vermiş, əsərlərindən nümunələr təqdim etmişdir. O, XX əsrin 90-cı illərinin əvvəllərində Bakıda olmuş, buradan müasir şairlərin çap olunmuş kitablarını əldə etmiş və təzkirəsini hazırlayarkən bu əsərlərdən geniş şəkildə faydalanmışdır.

M.Dəyhimin qələmindən Hacı Ələmdar Mahirin bioqrafiyasına nəzər salaq: "Quliyev Ələmdar Əbdürrəhim oğlu Bakı şəhərində balıqçı ailəsində 1950-ci ildə anadan olub. 15 yaşından şeir, qəzəl yazmağa başlayıb. 18 yaşından Mahir təxəllüsü ilə münacat və s. şeirləri vardır. İlk təhsilini yaşadığı Nardaran kəndində alıb. Şairin yazdığı şeirlər çox ehsaslı və ehtivalı olan halda qəzəllərində irfan və müsəlmanlıq ətiri vardır. Və öz ölkəsinin bir görkəmli və qüdrətli şairi ünvanında tanınıbdır və xəlqlərara bir hörmətdən bəhrələnir".

M.Dəyhim təzkirədə Hacı Ələmdarın "Qoyma, ya Rəbb, küfri salsın kölgə iman üstünə" və "Bu nə ətri-gülistandır, bu nə ətri-sənubərdir" misraları ilə başlayan şeirlərini nümunə kimi təqdim etmişdir[449].

Beləliklə, Ə.Dövlətabadidən və Y.Şeydadan fərqli olaraq, M.Dəyhim öz təzkirəsinə həm güneyli, həm də quzeyli Azərbaycan şairlərini daxil etmiş və təzkirəsini iki dildə qələmə almışdır.

---

[449] Yenə orada, s. 487-491.

# ŞAHİN FAZİL

Şahin Fazil (Fərzəliyev) 1940-cı ildə anadan olmuşdur. 1959-1963-cü illərdə Bakı Dövlət Universitetinin Şərqşünaslıq fakültəsinin fars bölməsində təhsil almışdır. Müxtəlif illərdə Əfqanıstanda tərcüməçi işləmişdir. Tarix elmləri doktoru, professordur. Hal-hazırda AMEA A.Bakıxanov adına Tarix İnstitutunda çalışır.

Keçən əsrin 50-ci illərindən başlayaraq ədəbi fəaliyyətlə məşğuldur. İndiyədək 22 kitabı nəşr olunmuşdur. Üç qüzdən artıq məqalənin və üç divanın müəllifidir. Azərbaycan Yazıçılar Birliyinin üzvüdür. 1998-ci ildən "Məcməüş-şüəra" ədəbi məclisinə sədrlik edir[450].

XXI əsrdə ilk təzkirəni Şahin Fazil qələmə almışdır[451]. Təzkirədə XIX əsrin 80-ci illərində yaradılmış, 43 il fəaliyyət göstərmiş, 1980-ci ildə yenidən bərpa olunmuş "Məcməüş-şüəra" və onun üzvlərindən bəhs olunur. Təzkirə dibaçə, "Ədəbi məclisin tarixi seyri", əsas hissə və xatimədən ibarətdir. Təzkirədə ilk olaraq "Məcməüş-şüəra"nın yaranışından bərpasınadək bu məclisin yığıncaqlarında iştirak etmiş söz sahiblərinin bəziləri haqqında məlumat verilmiş və əsərlərindən nümunələr təqdim olunmuşdur. Daha sonra məclisin bərpasından sonrakı məclis üzvlərinin həyatı və yaradıcılığı haqqında məlumat verilmişdir. Şairlər haqqında bilgi verilərkən heç bir prinsip əsas götürülməmişdir.

Şahin Fazil təzkirənin "Dibaçə"sində yazır:

"Təzkirə" bəhrinə baş vurmağa tab lazımdır,
Nə böyük işdi bu, ya Rəbb, bu nə qüvvət, tabdır?

Birini Seyyid Əzim yazdı ki, min rəhmət ola,
Birinin sahibi Mir Möhsün ağa Nəvvabdır.

---

450 Şahin Fazil. Təzkireyi-Şahin. Bakı, 2006, s. 757.
451 Şahin Fazil. Təzkireyi-Şahin. Bakı, 2006, 818 s.

Biri də Mirzə Hüseyn idi "Qayıb" nəslindən,
Bir burulğandı bu təzkirə işi, girdabdır.

Başqa təzkirə yazarı görməyirəm dövrəmdə,
Bir səda gəldi mənə: Onlara Şahin babdır.

Müəllif təzkirəsinin yazılma səbəbini bu şəkildə izah edir: "Mən aciz bəndə Kərbəlayi Şahin Fazil gecə-gündüz fikrü xəyala dalıb, könlümə bir şairanə məcmuə odunu salıb və həmçinin 120 yaşlı "Məcməüş-şüəra" ədəbi məclisinin cavan və yaşlı üzvlərinin xahişlərini nəzərə alıb "Təzkireyi-Şahin"i yazmağa niyyət və bu çətin işə cürət etdim. Məlumdur ki, son dövrlərdə təzkirənevislik sahəsində hələm-hələm qələm işlədən və ağ varaq qaralayan ədiblərimizin sayı olduqca azdır və ədəbiyyat maşınımız bu cəhətdən nasazdır"[452].

Şahin Fazil əsərinin ön sözündə Nəvvab təzkirəsindən 113 il sonra bu janrda əsər yazılmadığını qeyd edir: "...Şahin Fazil yaşının və işinin çoxluğu, həmçinin əzəlki taqətinin yoxluğu üzündən böyük əziyyətə qail olub "Təzkirə" yazdı, yox əgər yazmasaydı, Nəvvab təzkirəsindən 113 il sonra yazılan bu əsər var olmazdı və bu "Təzkirə" olmasaydı vəfat edən və hal-hazırda sağ olan "Məcməüş-şüəra" şairləri barədə, bəlkə də, heç nə yazılmazdı"[453].

Şahin Fazilin təzkirəsinə həsr etdiyi qəzəli də maraq doğurur:

Şadəm, düşəcək dillərə "Təzkireyi-Şahin",
Sovqat olacaq ellərə "Təzkireyi-Şahin".

Yazdımsa da üç "Divan"ı, "Təzkirə" yox idi,
Yer qoymadı nisgillərə "Təzkireyi-Şahin".

Bir közdü o çoxdan ki, kül altında qalırdı,
Sovdurdu külü yellərə "Təzkireyi-Şahin".

---

[452] Yenə orada, s. 4.
[453] Yenə orada, s. 6.

“Təzkirə” yox idi neçə illər vətənimdə,
Dürdanədi aqillərə “Təzkireyi-Şahin”.

Bir güllədi cahillərə şairlər adından,
Bir şillədi qafillərə “Təzkireyi-Şahin”.

Yazdım onu min şövq ilə, bir töhfədi məndən,
Sevdalı şirindillərə “Təzkireyi-Şahin”.

Şahin elə “Təzkirə” yazıbdır ki, bu gündən
Qalsın gələcək illərə “Təzkireyi-Şahin”[454].

Şahin Fazilin qələmə aldığı bu əsər təzkirəçilik tarixində indiyə qədər görünməmiş özəlliyə malikdir. O, bizim ilk təzkirəmizdir ki, bir ölkənin, bir ədəbi nəslin, bir üslubun yox, bir poetik məclisin üzvlərinin həyat və yaradıcılığını əks etdirir[455].

Təzkirənin əvvəlində “Ədəbi məclisin tarixi seyri” başlığı altında “Məcməüş-şüəra” ədəbi məclisinin tarixi haqqında məlumat verilmiş, digər ədəbi məclislərlə əlaqəsi təhlil edilmiş, 90-a yaxın üzvünün tərcümeyi-halı və əsərlərindən örnəkləri təqdim olunmuşdur.

---

[454] Yenə orada, s. 13.

[455] Nəbiyev B. Şahinin qanadları: (“Təzkireyi-Şahin” haqqında rəy) // «Elm» qəzeti. - 2002. - 19 oktyabr.

# NƏTİCƏ

Azərbaycan təzkirəçiliyinin XVI-XXI əsrlər mərhələsinə dair apardığımız tədqiqatların nəticələrini aşağıdakı bəndlərlə təqdim etmək mümkündür:

- Monoqrafiyada Azərbaycan təzkirələrinin nəşri vəziyyəti və tədqiq tarixi sistemli şəkildə öyrənilmişdir. Araşdırmaların nəticəsi olaraq deyə bilərik ki, Azərbaycan təzkirəçiliyinin nəzəri baxımdan, eləcə də sistemli şəkildə tədqiqinə ciddi ehtyac vardır. Belə ki, XVI əsrdən başlayaraq XXI əsrə qədər azərbaycanlı müəlliflər tərəfindən 45 təzkirə qələmə alınmışdırsa da, indiyə kimi onlardan sadəcə 6-sı Azərbaycan dilində nəşr olunmuşdur. Qeyd olunan bütün Azərbaycan təzkirələrinin tərcüməsi, elmi-tənqidi və ya faksimile mətnlərinin hazırlanması təzkirəşünaslarımız qarşısında duran mühüm vəzifələrdəndir. Bunlardan əlavə, hər bir Azərbaycan təzkirəsinin monoqrafik səviyyədə araşdırılması Azərbaycan ədəbiyyatının müxtəlif mərhələlərini, ümumiyyətlə mədəniyyət tariximizi tədqiq etmək üçün əhəmiyyətlidir.
- İlk dəfə olaraq Azərbaycan təzkirələrinin təsnifatı aparılmışdır. Azərbaycanlı müəlliflərin təzkirələrini qələmə alındıqları dil, struktur, əhatə etdiyi dövr, yazıldığı zaman və coğrafiya üzrə təsnifləşdirmişik. Azərbaycan təzkirələrinin nəzm və nəsr hissəsinin dili öyrənilmiş və bu əsərlər təhkiyə hissəsi türkcə yazılan və yalnız türkcə şeirlərdən nümunələri əhatə edən təzkirələr, təhkiyə hissəsi türkcə olan, həm türkcə, həm də farsca şeirlərdən örnəklərin verildiyi təzkirələr, həm təhkiyə hissəsinin, həm də poeziya nümunələrinin iki dildə (türkcə və farsca) yazıldığı təzkirələr, təhkiyə hissəsi fars dilində qələmə alınan, həm fars, həm də türkcə nümunələrin təqdim olunduğu təzkirələr, həm təhkiyə, həm də şeir nümunələri farsca olan təzkirələr şəklində beş qrupa bölünərək dəyərləndirilmişdir.

